# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2017**
**№ 2 (678)**
*(mart-aprel)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*

*Redaksiyanın ünvanı:*
*Az1065, Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236*

*Telefon/Faks*
*(012) 538-82-65*
*(012) 538-82-67*

*Rekvizitlər:*
*Kapital Bankın Gənclik Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**BU NÖMRƏDƏ**

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş: 04**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**



# PEDAQOGİKAŞÜNASLIQ - YENİ MƏRHƏLƏDƏ

**Əjdər Ağayev,**
***pedaqogika üzrə elmlər doktoru, professor, əməkdar müəllim***

Azərbaycan pedaqogikaşünaslığının keçdiyi yolu, pedaqogika elminin və təhsilin inkişaf mənzərəsini daha qlobal görə bilmək, dünyadakı təcrübə ilə müqayisədə özünəməxsusluğunu aşkarlamaq və dəyərləndirmək üçün aparıcı pedaqoji tendensiyaları, baxışları, çıxışları, ideyaları, məktəbləri, təhsil, təlim və təcrübə sahəsində söylənmiş fikirləri, mütəfəkkirlərin nəzəri və praktik fəaliyyətini sistemli şəkildə öyrənmək, təhlil etmək, ondan yaradıcılıqla faydalanmaq müasir pedaqogikaşünaslığın başlıca vəzifələrindəndir.

XX əsrin 20-ci illərində pedaqogika elmi sahəsində geniş axtarışlara başlandı. 1930-cu illərdə elmi dərəcə almış pedaqoqlar meydana çıxdı. Bu gün Azərbaycanda pedaqoji elmlər sistemi mövcuddur. Bu sistemə daxil olan sahələr üzrə alim-mütəxəssislər yetişmişdir.

Tarixdən belə bir fakt məlumdur ki, dövrünün ən müqtədir alimləri müxtəlif elm sahələri üzrə yazdıqları əsərləri yalnız elmi inkişaf etdirmək üçün deyil, həm də insanları maarifləndirmək, onlara təbiətdə və cəmiyyətdə baş verən hadisələri, mövcud qanunauyğunluqları öyrətmək, tərbiyələndirmək, şəxsiyyəti formalaşdırmaq üçün yazmışlar. Məşhur elm sahibləri Nəsirəddin Tusi, Eynəlqüzzat Miyanəçi, Şihabəddin Sührəvərdi, Marağalı Əvhədi, Xətib Təbrizi, nəhayət, Abbasqulu ağa Bakıxanov, Mirzə Fətəli Axundov və digərləri əsərlərində insanları biliklərə yiyələndirmək məqsədi daşıdıqlarını qeyd etmişlər. Bu məqsəd də kamillik konsepsiyasına xidmət etmiş, insanın əqli, əxlaqi-mənəvi keyfiyyətlərə yiyələnməsi məqsədi daşımışdır. Onlar təhsilə insanı kamilləşdirən vasitə kimi baxmışlar. Buna görə də ləyaqətə, şərəfə, vicdanlılığa, vətənpərvərliyə, ümumbəşəriliyə, səxavətliliyə, humanizmə və digər yüksək insani dəyərlərə hər kəsdə nail olmaq üçün çalışmışlar. Bir insanda tərbiyəlilik, vicdan əxlaqı yoxdursa və ya qüsurludursa, onun elmiliyi (bəzilərinin təbirincə desək, təhsilliliyi) yalnız ziyanlı işlərə yönələ bilər və bu, həqiqətən də, belədir. Təhsil eyforiyasında nailiyyətlər qazanan bir sıra Qərb ölkələrində tərbiyəlilik amili diqqətdə tutulmadığından, ailə dövlətçiliyi məhv olmaq üzrədir. İnsanlar təhsilin yaratdığı texnologiyaları dünyanın vəhdətdə çiçəklənməsinə deyil, ayrı-ayrı ölkələrdə terrora, qırğınlara sərf edirlər və beləliklə də, pedaqoji elmlər sistemi dəyərlərindən insanın kamilləşməsi üçün deyil, başqa məqsədlər üçün istifadə edirlər. Pedaqogika elminin əsas və ilkin yaranan sahəsi olan didaktikanın, yəni təhsilin (bəzilərinin fikrincə, təhsilşünaslığın) fəlsəfəsi praqmatik düşüncə ilə deyil, insanların və onların yaratdığı gələcəyin rahatlığına, sivilliyinə, mükəmməlliyinə xidmət ideyaları ilə dəyərləndirilməlidir. Praqmatik mahiyyətli təhsildə qiymətləndirmə, məktəbin avadanlığı, müəllimin tədris bacarığı kimi məsələlər lokal

mahiyyətlidir, gündəlik işdir, bu, təhsil fəlsəfəsi deyil, bunlar pedaqoq-alimlər üçün sadə və adi görünən məsələlərdir. Təhsilin fəlsəfəsi orta əsrlərdən üzü bəri və bu gün də intellektlə yanaşı, insanın davranış, fəaliyyət kompası olan əxlaqi-mənəvi mükəmməlliyi ilə dəyərləndirilir. Bu isə ayrı-ayrı təhsillən-diricilik təsirləri ilə deyil, insanın inkişafı və formalaşdırılması probleminə sistemli və kompleks yanaşma ilə mümkündür. Məhz Azərbaycan pedaqogikaşünaslığında bu məsələlər öz həllini tapmaqdadır və qlobal-laşan dünyada da Azərbaycan insanlarının tarixən bəlli olan əxlaq və mənəviyyat ölçüləri ilə getməli, texnologiyaları öyrəndiyimiz Qərbə humanizm, ədalət, dürüstlük kimi keyfiyyətlərini aşılamalıyıq.

Bu cəhətdən pedaqoji elmlər dokto-ru, əməkdar elm xadimi, professor Fərrux Rüstəmovun “Azərbaycan pedaqogikaşü-naslığı” kitabı təqdirəlayiqdir. Bu gün Azərbaycanda pedaqogika nəzəriyyəsi və tarixinə aid mühüm əhəmiyyət kəsb edən dərsliklərin, tədris, yardımçı vəsaitlərin, digər təlim-tədris istiqamətli kitabların hazırlanmasında Fərrux Rüstəmovun xid-mətləri danılmazdır. O, bütün bu zəhmətini sadəcə vəzifə missiyası, alim zəhməti, iş icraçılığı ilə deyil, istedadı, elmə vətəndaş sevgisi bağlılığının təzahürü kimi içindən boylanan istək, ruhunu saran sövq-təbii ilə meydana qoyur.

17 il bundan əvvəl gənc, işgüzar tədqiqatçı alim Fərrux Rüstəmovun “Azər-baycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri (1920-1991-ci illər)” kitabına “Ön söz”də yazırdım: “Məqsədimiz əsərin geniş təhlilini vermək deyil, sadəcə gənc, istedadlı bir tədqiqatçı tərəfindən pedaqogi-ka elmində yeni bir cığırın açıldığını qeyd etmək, bu yolda ona və elmimizə uğurlar diləməkdir. Elmimizdə gənc, zəhmətkeş, istedadlı bir tədqiqatçı alimin bərqərar oldu-ğunu bəyan etməkdir. Qoy qadir Allah onu hifz eləsin, uğurlarına yardımçı olsun!”. Bu gün isə “Azərbaycan pedaqogikaşünaslığı” kitabının, daha dəqiq desək, dərsliyinin əlyazması ilə tanış olduqca müəllifin gərgin yaradıcılıq axtarışlarını bir daha duydum, azərbaycanşünaslığa xidmət edən monu-mental bir pedaqogikaşünaslıq abidəsi ilə üz-üzə dayandığımı hiss etdim. Bu kitab 7 fəsildən, 44 yarım fəsildən, 888 səhifədən ibarətdir. Elmi-nəzəri ümumiləşdirmə səviy-yəsinə görə bu mövzuda yazılan kitablar-dan fərqlənən bu ciddi dərslik poliqrafik cəhətdən də nümunəvidir. Təhsil-tərbiyənin nəzəriyyəsi, pedaqogika tarixinin aktual problemlərinə həsr olunmuş bu əsərdə minə yaxın elmi mənbədən istifadə olunmuşdur. Maraqlıdır ki, bu kitabda müəllif pedaqoji jurnalistika və pedaqoji tənqid tarixini də yaratmağa təşəbbüs göstərmişdir. O bunla-ra pedaqogika tarixinin ayrılmaz hissəsi kimi baxır. F.Rüstəmovun indiyə kimi 35 monoqrafiya, kitab və kitabçası, 31 tədris proqramı, 200-dən çox elmi məqaləsi, 40 tezisi, 150-dən artıq elmi-pedaqoji və publi-sistik qəzet yazısı işıq üzü görmüşdür, 10 kitabın tərtibçisi, 100-ə yaxın kitabın elmi redaktoru və rəyçisi olmuşdur. “Pro-fessor Hüseyn Əhmədovun əsərlərinin izahlı bibli-oqrafiyası” (1990), “Tələbələrin ictimai fəaliyyəti və ona pedaqoji rəhbərlik” (1991), “Azərbaycanda pedaqoji elmin inkişaf tarixindən” (1992), “Günüuzadılmış qrup-larda tərbiyə məsələləri” (1993), “M.V.Vi-dadinin, M.P.Vaqifin, Q.B.Zakirin təlim-tərbiyə haqqında fikirləri” (1994, 2013), “Azərbaycan pedaqoji biblioqrafiyası: məktəb və pedaqogika tarixinə aid ədəbiy-yat” (1995), “Akademik Hüseyn Əhmədov” (1997), “Azərbaycanda pedaqogikanın

nəzəriyyəsi və tarixi üzrə tədris planları, proqramları, dərslik və dərs vəsaitlərinin hazırlanması və təkmilləşdirilməsi tarixi” (1997), “Görkəmli pedaqogika tarixçisi Əyyub Tağıyev” (1996), “Основные направления развития теория воспитания и обучения в Азербайджане” (1998), “Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri” (1998), “Pedaqogi-ka kafedrasının tarixi: sələflər və xələflər” (1999), “Müasir dövrdə Azərbay-canda təhsilin inkişafının əsas istiqamətləri” (Moskva, 2000), “Pedaqogikadan kurs və yoxlama işlərinə aid mövzu, plan və ədəbiyyat” (2001), “Pedaqogika. Yeni kurs” (2002, 2007, 2010), “Ümumtürk pedaqoji fikrində əxlaqi-mənəvi dəyərlər” (şərikli, 2002), “Akademik Hüseyn Əhmədov və yetirmələri” (2004), “Pedaqogika tarixi” (2006, 2011), “Ali məktəb pedaqogikası” (2007), “Pedaqogikadan kurs və buraxılış işlərinə dair metodik göstəriş” (2007), “Pedaqoji oçerklər: sələflərim və müasirlərim” (2010), “Pedaqoji qeydlər, resenziyalar, müsahibələr” (2010), “Azərbaycanda ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi ixtisası üzrə elmi pedaqoji kadr hazırlığı” (2010), “Pedaqoji (təlim və tərbiyə) tarixi Şərqdə” (Tehran, 2010), “Azərbaycanda təhsil və tərbiyə nəzəriyyəsinin inkişafı” (1961-1981-ci illər)” (2011), “Pedaqogika fənninin kurikulumu” (2014) əsərləri Azərbaycan pedaqoji elminə dəyərli töhfədir.

F.Rüstəmov hələ çox gənc ikən Azərbaycanda pedaqoji elmin inkişafının əhatə olunduğu kiçik bir dövrü – 1961-1981-ci illəri araşdırmış və sanballı bir tədqiqat əsəri hazırlamışdır. Alim mövzu dairəsini genişləndirərək bir müddət sonra 1920-1991-ci illərdə Azərbaycanda pedaqogika elminin inkişaf yollarını tədqiqata cəlb edərək, yeni əsərini meydana gətirdi. O, “Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri (1920-1991-ci illər)” monoqrafiyası ilə pedaqogika elmində yeni bir elmi istiqamətin əsasını qoydu. Bu, pedaqogikaşünaslıq idi. Alim Azərbaycanda pedaqogikaşünaslığın inkişaf yolunu və məzmun mənzərəsini daha qlobal görə bilmək, dünyadakı təcrübə ilə müqayisədə özünəməxsusluğunu aşkarlamaq üçün xalqların pedaqogika tarixini (pedaqogikaşünaslığın inkişaf mənzərəsini) araşdıraraq, “Şərqdə pedaqogika tarixi”, “Qərb pedaqogika tarixi”, “Yeni dövrün pedaqogika tarixi” (2004), “Ən yeni dövrün pedaqogika tarixi” (2005) kitablarını (dərs vəsaitlərini) nəşr etdirdi. O, yazdıqlarını daha da təkmilləşdirərək, monumental “Pedaqogika tarixi” dərsliyini oxucuların ixtiyarına verdi. Bununla da dünyada mövcud pedaqoji tendensiyaları, baxışları, cərəyanları, ideyaları, məktəbləri, təhsil, təlim, tərbiyə sahəsində fikirlər söyləmiş mütəfəkkirlərin nəzəri və praktik fəaliyyətlərini sistemləşdirərək, pedaqogika elminin və təhsilin inkişaf mənzərəsini Azərbaycan oxucularına çatdırdı.

Böyük maraqla qarşılanan və elmi ictimaiyyətin diqqətini çəkən “Pedaqogika tarixi” dərsliyinin belə mükəmməl yaranmasının əsasında müəllifin Azərbaycanda pedaqoji elmin təşəkkülü, inkişafı, formalaşmasına aid apardığı tədqiqatlar, bu araşdırmaların yaratdığı milli və ümumbəşəri ruh dayanır.

Professor Ramiz Əliyev və İramin İsayev “Pedaqogika tarixi və ya tarixin pedaqogikası” kitabına yazdıqları “Ön söz”də qeyd edirlər ki, “... Fərrux Rüstəmov... elə bir dərslik ərsəyə gətirmişdir ki, hazırda dərslik tərtibçiləri onun təsir dairəsindən kənara çıxa bilmir, istər-istəməz onu təkrarlamaq məcburiyyətində qalırlar. İlk əsərlərindən olan “Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri” (1998) adlı monoqrafiyası fundamentallığı-

na, problematikasına, yeni bir elmi istiqamətin (Azərbaycan pedaqogikaşünaslığının) əsasını qoyduğuna görə "pedaqoji elmdə hadisə" (prof. Nurəddin Kazımov) sayılsa da, hesab edirik ki, "Pedaqogika tarixi" dərsliyi (2006) professor Fərrux Rüstəmovun şah əsəri olmaqla, onun elmi yaradıcılığının zirvəsini təşkil edir".

Fərrux Rüstəmov mükəmməl pedaqogika tarixçisidir. O, Əhməd Seyidov, Mehdi Mehdizadə, Mərdan Muradxanov məktəbinin ənənələrini davam etdirərək, onları müasirlik düşüncəsi ilə inkişaf etdirmiş, elmi əhatə dairəsini genişləndirmiş, sanballı bir elmi mövqeyə yüksəlmişdir. Məhz buna görə də Fərrux Rüstəmovun qələmindən çıxan hər bir irihəcmli, geniş məzmunlu, dərin elmi siqlətli əsər monumentallığı, yeniliyi, orijinallığı ilə seçilir. Alimin pedaqogika tarixi problemlərinə qlobal yanaşması, Qərbdə, Şərqdə, Yeni dövrdə, Ən yeni dövrdə pedaqoji fikrin araşdırılması onun Azərbaycan pedaqogikaşünaslığı istiqamətində fəaliyyətinə aydınlıq gətirmiş, onu mükəmməlləşdirmişdir. Digər tərəfdən, alimin Azərbaycanda pedaqoji elmin təşəkkülü, inkişafı problemlərini araşdırarkən Rusiya, Türkiyə, Avropa, Amerika alimlərinin fikirləri ilə paralellər aparması, bir-birinə təsir dairələrini üzə çıxarması pedaqogika elminin milli müstəvidə formalaşmasına baxmayaraq dünyəviliyini meydana qoymuşdur.

"Azərbaycan pedaqogikaşünaslığı" əsərinin dəyəri bir də onun indiyədək aparılmış tədqiqatlar, nəşr edilmiş kitablar üzərində qurulmasındadır, yəni bu əsər təkmilləşmə süzgəcindən keçirilmişdir. Azərbaycanda pedaqogika elminin inkişaf tarixini öyrənmək, Azərbaycan pedaqogikaşünaslığını yaratmaq baxımından elmi-pedaqoji ictimaiyyətə təqdim edilən bu əsər diqqəti xüsusi olaraq cəlb edir. Fərrux Rüstəmov sadəcə elmin təşəkkülü ilə əlaqədar tarixi inkişaf faktlarının təsviri, şərhi, təhlili ilə kifayətlənmir. O, problemə elmşünaslıq nöqteyi-nəzərindən yanaşaraq onun metodoloji köklərini, qaynaqlarını, daxili qanunauyğunluq əlaqələrini, sosial-iqtisadi, ictimai zəmini və digər cəhətləri meydana çıxarmış, bu əsasda pedaqoji elmin daşıdığı məzmun keyfiyyətlərini, həmin elmin yaradıcılarının nəzəri baxışları və əməli xidmətlərini məharətlə ümumiləşdirmiş, sistemə salmışdır. Dərsliyin hər fəsli, hər bölümü, hər səhifəsi elmiliyi, təzəliyi, dəyərliliyi, faktlara yanaşma tərzi ilə seçilir. Ona görə ki, Fərrux Rüstəmov, Azərbaycanda pedaqogika elminin tarixini, inkişafını meydana qoymaqla, elm tarixçisi olaraq bu elmin "ruhunu" və "canını" ərsəyə gətirir, ona həyat verir və onu pedaqogikaşünaslıq adlandırır. "Tarixşünaslıq", "ədəbiyyatşünaslıq" və s. bu qəbilli terminlərin sırasında "pedaqogikaşünaslığ"ın meydana gətirilməsi məhz Fərrux Rüstəmova məxsus yaradıcı xidmətdir. Azərbaycanda bəzi yazılarda "təhsilşünaslıq" termininin işlənməsinə rast gəlinir. Təhsil sistemi, təhsil iştirakçıları, təhsilin məzmunu, təlim metodları və digər təlim prosesində vasitə, vəsaitlər haqqında nəzəri ideyalar və praktik nəticələr təhsilşünaslığa aid edilir. Əslində, bu, heç təzə məsələ və ya yanaşma da deyildir. Əsrlərdən bəri təhsillə, xüsusilə, onun məzmunu ilə əlaqədar müxtəlif fikirlər söylənilmişdir. Çünki təhsilin məqsədi və məzmunu, texnologiyalar elmin, texnikanın inkişafı ilə əlaqədar bütün zamanlarda modernləşdirmə tələb etmişdir və bu, reallaşdırılmışdır. Bu gün də belədir. Lakin bu

gün əsrlər boyu filosofların, pedaqoqların, mütəfəkkirlərin ideyaları və əməli nəticələri ilə formalaşmış pedaqogika elmini və ya elmlər sistemini təftişə ehtiyac yoxdur. Pedaqogikanın tədqiqat obyekti təhsil sistemi və təlim prosesi ilə yanaşı, insanın tərbiyəsi, sosial və mənəvi inkişafı, ailə, məktəb, cəmiyyət münasibətləri, sinifdənxaric və məktəbdənkənar işlər, xəstə, fiziki cəhətdən qüsurlu uşaqlarla iş və digər çoxsaylı pedaqoji proseslərdir. Təhsil və təlim nəzəriyyəsi pedaqogikanın yalnız bir bölməsini təşkil edir, onu da dünyada elmi pedaqogikanın banisi hesab edilən Yan Amos Komenski didaktika adlandırmış və bütün baxışlarını "Böyük didaktika" əsərində vermişdir. Yeri gəlmişkən, qeyd edək ki, Yan Amos Komenskinin "Böyük didaktika" əsəri prof. Fərrux Rüstəmov tərəfindən 2012-ci ildə "Elm və təhsil" nəşriyyatında nəfis şəkildə nəşr olunmuşdur.

Pedaqogika sadəcə tədris fənni olmaqdan əlavə, böyük bir elm sahəsidir. Təbii ki, bu elm bilavasitə insanın təlimi, tərbiyəsi, inkişafı, həyat tərzi, baxışları, dünyagörüşü, idealları və sair insani keyfiyyətlərlə əlaqədar olduğu üçün fəlsəfə, sosiologiya, psixologiya, fiziologiya, etnoqrafiya, ədəbiyyat, incəsənət və s. bir çox elm və sənət sahələri, adət-ənənələrlə sıx bağlıdır. Ona görə də pedaqogika yalnız pedaqogikaşünaslıqla ümumiləşdirilə bilər. Təhsil (təhsilşünaslıq) onun bir sahəsi və ya elmi istiqaməti ola bilər, necə ki, didaktika adı ilə elmdə əsrlərlə mövcuddur.

Fərrux Rüstəmov pedaqoji tədqiqatları həm elmi istiqamətlər üzrə, həm də tarixi varisliklə təqdim edərək, ümumiləşdirmələr aparmaqla düzgün mövqe tutmuş, bununla da pedaqogikaşünaslığın məzmununu ortaya qoymuşdur. Digər tərəfdən tədqiqatçı alimlər haqqında qısa tərcümeyi-hal xarakterli məlumatların verilməsi, əlavə olaraq dissertasiya mövzularının və elmi rəhbərlərin təqdimatı pedaqoji elmlərin indiyə qədər əhatə etdiyi problemləri və elmi fəaliyyətləri "görməyə" imkan verir. Həm də Azərbaycanda pedaqogika elminin və təhsilin inkişafında az-çox xidməti olan 300 nəfərə qədər tədqiqatçı alimin şəkillərinin və haqqında qısa oçerkin verilməsi müəllifin özündən əvvəlki və müasir pedaqoqlara olan hörmətinin bariz nümunəsidir. Dərslikdə oxucunu razı salan keyfiyyətlərdən biri də XX əsrin 30-cu illərində repressiyaya uğradılmış müəlliflərin əsərlərinin xeyli qisminin ilk dəfə təhlil süzgəcindən keçirilməsidir. Xüsusilə pedaqogikaya aid əsərləri ilə diqqəti cəlb edən Boris Borisoviç Komarovski, Xəlil Fikrət, Abdulla bəy Əfəndizadə, Saleh Xəlilov, Mikayıl Rəhimli və digərlərinin Azərbaycan pedaqogikaşünaslığında mövqeyi və xidmətlərinin aşkarlanması unudulmuşlara ehtiram əlaməti olmaqdan əlavə, elmdə boşluğa yer verməmək, tamlıq baxımından qiymətləndirilməlidir. Xüsusilə pedaqogika elminin metodoloji əsaslarının, fəlsəfi mahiyyətinin, anlayış-terminoloji sisteminin işlənməsində əvəzsiz xidmətləri olan Boris Borisoviç Komarovski, Xəlil Fikrət, Abdulla bəy Əfəndizadənin yaradıcılığının ilk dəfə ətraflı və obyektiv təhlili oxucunu razı salır.

Dərsliyi oxuduqca müəllifin nə qədər gərgin zəhmət çəkdiyini, bir əsr ərzində yaranmış pedaqoji məzmunlu, irili-xırdalı

yüzlərlə məqaləni, dərslik, dərs vəsaiti, monoqrafiya və digər elmi nümunəni, onlarla alimin ideya və baxışlarını öyrənmək əzmini duyur, Azərbaycanda pedaqogika elminin özü-özlüyündə deyil, dünya pedaqoji elmi kontekstində tam dolğun mənzərəsini yarada bilmək məharətinə əhsən deyirsən.

Müəllif elmi nailiyyətlərdən fərəhlə bəhs etdiyi kimi, uğursuzluqlardan da qətiyyətlə söz açır. Tədqiqatçının özündən əvvəlki fikirlərə obyektiv və prinsipial mövqedən yanaşmağa çalışması, ilk növbədə, onun tədqiqatçılıq səriştəsinin səviyyəsi ilə izah olunmalıdır. Keçmiş ittifaq üzrə nəzəriyyələrə münasibəti də bununla bağlıdır. Özünün qeyd etdiyi kimi, 20-80-ci illərdə pedaqogika elmi ümumi içində sovet pedaqogikası adlanırdı.

Deyə bilərlər ki, hazırda təhsilin dünyada daha da aktuallaşmasını və orta əsrlərdən fərqli olaraq tərbiyə amilinin deyil, təhsil amilinin önə keçməsi ilə əlaqədar ali məktəblərdə təhsilşünaslıq fənnini tədris etmək daha məqsədəuyğundur. Belə olduğu halda da təhsilşünaslıq pedaqogika elminin nəzəri və təcrübi nəticələrinə söykənməlidir və onun elmi əsasları yalnız təcrübə ilə deyil, pedaqoji qanunauyğunluqlara, prinsiplərə və metodologiyaya əsaslanaraq meydana çıxarılmalıdır. Bunlar isə pedaqoji tədqiqatlarda, dərsliklərdə, əsərlərdə artıq öz həllini tapmışdır. Məhz bu baxımdan da oxuculara, elmi-pedaqoji ictimaiyyətə təqdim edilən "Azərbaycan pedaqogikaşünaslığı" kitabı dərslik kimi yolaçanlıq missiyasını da yerinə yetirir.

Fərrux Rüstəmov pedaqoji tədqiqatları həm elmi istiqamətlər üzrə, həm də tarixi varisliklə təqdim edərək, ümumiləşdirmələr aparmaqla düzgün mövqe tutmuş, bununla da pedaqogikaşünaslığın məzmununu ortaya qoymuşdur.

Azərbaycanda pedaqoji elmin nəzəri-metodoloji problemlərinin tədqiqinə həsr edilən araşdırmalara və müəllif qənaətlərinə, mənbələrə, baş verən ictimai-pedaqoji proseslərə yaxından bələdlik müəllifə pedaqoji elmin inkişaf xüsusiyyətlərini və tendensiyalarını müəyyənləşdirməyə, elmi-nəzəri təhlildən keçirməyə, ciddi bir elmi-tədqiqat əsəri yaratmağa imkan vermişdir. Əsərin zənginliyi və təhlil üslubu məntiqi inandırıcılığı ilə oxucunu heyran edir.

Bunlardan əlavə, tədqiqat zamanı müəllifin tədqiq etdiyi əsərində daha çox müsbət cəhətlər, rasional rüşeymlər, maraqlı ideya və fikirlər, məna və fikir tutumu olan deyimlər və konsepsiyalar axtarışı da humanist yanaşmalardan irəli gəlir.

Dərsliyi oxuduqca müəllifin nə qədər gərgin zəhmət çəkdiyini, bir əsr ərzində yaranmış pedaqoji məzmunlu, irili-xırdalı yüzlərlə məqaləni, dərslik, dərs vəsaiti, monoqrafiya və digər elmi nümunəni, onlarla alimin ideya və baxışlarını öyrənmək əzmini duyur, Azərbaycanda pedaqogika elmini özü-özlüyündə deyil, dünya pedaqoji elmi kontekstində tam dolğun yarada bildiyinə inanırsan.

Ali pedaqoji təhsilin magistratura səviyyəsinin "Pedaqogika tarixi və nəzəriyyəsi", "İbtidai siniflərdə təhsilin metodikası və metodologiyası" ixtisasının tələbələri üçün nəzərdə tutulan "Azərbaycan pedaqogikaşünaslığı" dərsliyi pedaqoji elmlər doktoru, professor, əməkdar elm xadimi Fərrux Rüstəmov tərəfindən bu sahədə reallaşdırılan uğurlu təşəbbüsdür.



# ÜMUMİ TƏHSİL PEDAQOJİ MÜLAHİZƏLƏR MÜSTƏVİSİNDƏ

**Ənvər Abbasov,**
***Azərbaycan Respublikasının Təhsil İnstitutunun direktor müavini,***
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent,***
***əməkdar müəllim***

Məqalədə ümumi təhsilin bəzi məsələlərinə dair aparılmış tədqiqatın nəticələri təqdim olunur. Orada təhsil, təlim metodları, texnologiya və strategiya anlayışlarının mahiyyəti açıqlanır. Təhsilin keyfiyyətinin yüksəldilməsində rol oynayan metodik fəaliyyətin təşkili məsələləri əhatə olunur. Bunlarla yanaşı, tədris fəaliyyətinin xarakterini müəyyənləşdirən tipik xüsusiyyətlər təhlil edilir.

***Açar sözlər:*** *kreativ missiya, təfəkkür məktəbi, metodik iş, təhsil anlayışı, texnologiya, strategiya.*

***Ключевые слова:*** *творческая миссия, школа мышления, методическая деятельность, концепция образования, технология, стратегия.*

***Key words:*** *creative mission, school of thinking, methodical activity, education concept, technology, strategy.*

Məktəbin kreativ missiyası. Təhsillilik nədir? Bu gün bu ritorik sualın cavabı dəyişir. Artıq uzun illər çoxlu məlumatı və bilgiləri olan şəxsin təhsilli insan olması barədə klassik yanaşmalar daha yeni düşüncə tərzi ilə əvəzlənir. Təhsilli insan dünyagörüşü formalaşmış olsa belə, "bilən insan" olmaqdan daha çox həyata hazırlanmış, müasir mədəniyyətin mürəkkəb məsələlərinə bələd, həyatda yerini dərk etməyə qabil insan olur. Çünki təhsil azad şəxsiyyətin formalaşması, digər insanları başa düşməsi, təfəkkürün, ünsiyyətin formalaşması, nəhayət, insanın əməli iş və fəaliyyəti üçün şərait yaratmalıdır (1).

Təhsil əsl mənasında insan kapitalının formalaşdırılması vasitəsi kimi özünün məzmunu, bir sıra vasitələr sistemi və ümumilikdə mexanizmləri ilə mövcuddur. Xüsusilə akseoloji yanaşma müstəvisində təhsil daşıdığı dəyərlər kontekstində cəmiyyət üçün faydalı olan insanın inkişaf etməsində aparıcı funksiya daşıması ilə fərqlənir. Təhsil həm də mədəniyyətlərdən ibarət dəyərlərin mənimsənilməsi vəzifəsini icra edən bir sistem kimi də fəaliyyət göstərir.

Bütün təhsil pillələri ilə müqayisədə ümumi təhsil şəxsiyyətin formalaşdırılmasında daha fərqli rola malikdir. Pedaqoji araşdırmalarda bu məsələ orta ümumi təhsilin fəlsəfəsi ilə əsaslandırılır. Göstərilir ki, "orta təhsil fəlsəfəsini məktəb dünyası da adlandırmaq olar və məktəb dünyasına aid olan bütün məsələləri, problemləri orta məktəb fəlsəfəsi əhatə edir" (2). Ölkəmizin "Təhsil haqqında" qanununda da ümumi təhsilin başlıca missiyası qeyd edilir. Göstərilir ki, "Ümumi təhsil, təhsilalanlara elmlərin ümumi əsaslarının öyrədilməsini,

zəruri bilik, bacarıq və vərdişlərin aşılanmasını, onların həyata və əmək fəaliyyətinə hazırlanmasını təmin edir" (3).

Məktəb şagird şəxsiyyətinin formalaşdırılmasının həlledici amilinə çevrilir. Bəşəriyyətin tarixi boyu da məktəbə təlim-tərbiyə müəssisəsi kimi dəyər verilib. Onun inkişaf etdirilməsində öyrənmə modellərinin daha təkmil olmasına diqqət yetirilib. Lakin müxtəlif zamanlarda məktəb təhsilinin formalaşdırılmasında başqa-başqa yanaşmalar üstünlük təşkil edib. Məsələn, XX əsrin sonlarına qədər Azərbaycan təhsilində fənyönümlü bir tendensiya aparıcı rol oynayıb. Ümumtəhsil fənlərinin sayının çoxluğu, onların elmi-nəzəri biliklərlə yüklü olması bu tendensiyanın xarakterik cəhəti kimi daha qabarıq şəkildə diqqət mərkəzində saxlanılıb.

Lakin bu gün məktəbin yeni bir mənzərəsi yaranmaqdadır. Onun fəaliyyət ölçülərində şəxsiyyətin mühüm atributu kimi dəyərlərin formalaşdırılması dayanır. Son illərdə ümumtəhsil məktəbləri ilə bağlı araşdırmalarda da belə bir qənaətə gəlinir. Göstərilir ki, "Qlobal dünyanın informasiya bolluğu şəraitində məktəbin, təhsilin vəzifələri dəyişir. Ağılın, intellektin inkişaf etdirilməsi ön plana çəkilir. Dünyanın təhsil məkanında sadəcə bilik, bacarıqlar deyil, dəyərlər, səriştələr şəxsiyyətin inkişafında mühüm atributlar kimi qiymətləndirilir və bugünkü təhsilin keyfiyyət göstəriciləri kimi qəbul edilir" (4).

Ölkəmizin dövlət siyasətini müəyyən edən sənədlərdə də ümumi təhsilin xarakterinin dəyişilməsi xüsusi olaraq vurğulanır. Həm "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında (5). həm də "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi"ndə (6) ümumi təhsil sistemində "yaddaş" məktəbindən "təfəkkür" məktəbinə keçilməsi strateji vəzifə kimi göstərilir. Təfəkkür, idrak məktəbinin yaradılması isə müasir dünyanın inkişaf tendensiyasından irəli gələn bir məsələ kimi özünün həllini gözləyir. Xüsusilə bu məsələnin məsuliyyətinin ümumi təhsilin üzərinə qoyulması, bilavasitə onun şəxsiyyətin formalaşdırılmasındakı rolunu bir daha əsaslandırır.

Təfəkkür məktəbinin mühüm psixo-pedaqoji xüsusiyyəti humanist və humanitar prinsiplərə əsaslanmaq və inkişafyönümlü fəaliyyət istiqaməti seçməklə şərtlənir. Məktəb yaradıcı olmaqla özünü ifadə edir. Bu isə onun kreativ bir missiya daşıdığını göstərir.

Bütün hallarda müasir məktəb özünün yaradıcılıq missiyası ilə irəliləyə bilər. Çünki hər bir məktəb üçün mövcud olan fəaliyyət sferası məhz onun özünə məxsusdur. O, bu xüsusiyyətlərində başqalarını təkrar etmir. Əksinə, özünəməxsus şagird kollektivi, təhsil mühiti, valideyn, ümumilikdə, sosial əlaqələr şəraitində fəaliyyət göstərir. Ona görə də hər bir məktəb işinin layihələşdirmə, planlaşdırma və reallaşdırma mərhələlərində özünəməxsus iş stili seçməli, kreativ bacarıqlar nümayiş etdirməli olur.

Təhsil anlayışının semantikasının dəyişməsi. Ümumtəhsil məktəbində bu tipdən olan dəyişikliklərin bir mühüm səbəbi də təhsil anlayışına yeni müstəvidə yanaşılması ilə bağlıdır. Bu tendensiya son illərin pedaqoji hadisəsi kimi dəyərləndirilir. Təhsilin yeni məna çalarlarından bəhs olunur. Xüsusilə pedaqoqlar təhsil haqqında danışarkən onun müxtəlif mənalarda işlənməsini qeyd edirlər. Müasir dövrün standart və kurikulumlarında təhsilə yeni anlayış

kimi yanaşılmaqla nəticə, proses, dəyər, sistem kimi dəyərləndirilir. Bu fikir Azərbaycan pedaqoji fikrində də özünün şərhini tapmışdır. Mərhum professor A.O.Mehrabovun müasir Azərbaycan təhsilinə dair araşdırmalarında təhsilin bir anlayış kimi yalnız nəticə deyil, həm də dəyər, sistem və proses mənalarında işləndiyi əsaslandırılır. Təhsilin müasir zaman üçün daha gərəkli cəmiyyət hadisəsi olması və ona ənənəvi yanaşma tərzindən fərqli olaraq nisbətən geniş anlamda yanaşılması təklif edilir (8).

Professor F.A.Rüstəmov və T.Y.Dadaşovanın pedaqoji araşdırmalarında da təhsilin geniş semantik məna daşıdığı və bunun müasir Azərbaycan təhsili üçün xarakterik bir keyfiyyət olduğu qeyd edilir (9).

Bütün bu fikirlərin məntiqi davamı kimi bir məsələni də vurğulamaq lazımdır ki, təhsil cəmiyyət hadisəsidir və özünün tarixi missiyası ilə müəyyən zaman üçün atribut rolunu oynayır. Təhsilin məzmun və struktur məsələlərindən cəmiyyətin müəyyən tarixi dövrü üçün xarakterik xüsusiyyətlər çıxarmaq mümkün olur. Bundan əlavə, tarixi inkişafın müəyyən dövrlərinə aid xüsusiyyətlər təhsil sistemində, onun zəruri komponentlərində toplanmaqla özünü qoruyub saxlayır. Təsadüfi deyildir ki, elə bu səbəbdən xalqın tarixi inkişaf yolundakı istiqamətlərdə mədəniyyət, iqtisadiyyatla yanaşı, təhsil də xüsusi yer tutur. Təhsilə tarixi düşüncə tərzinin bir forması kimi baxılır, dəyər verilir. Onun inkişaf etdirilməsinə zəruri vasitə kimi yanaşılır. Ölkəmizin müstəqilliyi dövründə onun inkişaf tendensiyalarında bu daha qabarıq görünür.

Məlum olduğu kimi, ölkəmizin inkişafının müasir mərhələsində onun ardıcıl və sistemli olaraq davam etdirilməsində təhsil hüquqi əsas kimi aparıcı rol oynayır. Orada müəyyən olunmuş dövlət siyasəti hüquqi baza kimi davam etdirilir. Müasir dünyanın mənzərəsinə uyğun olaraq inkişaf etdirilir və bu inkişafın əsasında zamanın çağırışları dayanır.

XXI əsrin ikinci onilliyində qəbul olunmuş mühüm strateji əhəmiyyət daşıyan sənədlər də məhz həmin strateji çağırışların nəticəsi kimi meydana çıxır. Belə ki, 2012-ci ildə “Azərbaycan 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyası kimi ölkənin bütün strateji sahələrində islahatların davam etdirilməsini bir vəzifə kimi qarşıya qoyan dövlət sənədi hazırlanıb təsdiq olunmuşdur. Orada yüksək rəqabət qabiliyyətli iqtisadiyyatın yaradılması, nəqliyyat, tranzit və loqistika infrastrukturunun təkmilləşdirilməsi, bölgələrin tarazlı inkişafı, informasiya-kommunikasiya texnologiyalarının inkişafı və informasiya cəmiyyətinə keçidin təmin olunması, vətəndaş cəmiyyətinin inkişafı, qanunvericiliyin təkmilləşdirilməsi və institutsional potensialın gücləndirilməsi, mədəni irsin qorunması və səmərəli idarə edilməsi, ətraf mühitin qorunması və ekologiya məsələləri və s. əsas prioritetlər kimi müəyyənləşdirilmişdir. Bunlardan biri də insan kapitalının inkişafı və səmərəli sosial müdafiə sisteminin qurulması hesab olunur ki, onun da təmin edilməsinin strateji xətlərindən biri müasir təhsil sisteminin formalaşdırılmasıdır. Bu sənəddə təhsilin bütün pillə və səviyyələrində onun prioritet məsələləri ilə bağlı dəyişikliklərin aparılması nəzərdə tutulur.

2013-cü ilin oktyabr ayında qəbul olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” məhz İnkişaf Konsepsiyasında irəli sürülmüş çağırışları mühüm strateji xətlər üzrə

daha da konkretləşdirir. Təhsil üzrə fəaliyyətlərin foks nöqtələrini müəyyən edir. Artıq 2016-cı ilin dekabr ayında özünün təsdiqini tapmış "Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi"ndə insan kapitalının inkişaf etdirilməsi strateji hədəflərdən biri kimi götürülür ki, orada əsas prioritetlərdən biri təhsilin bütün pillələrində keyfiyyətin yüksəldilməsi dayanır (6).

Bütün bunlar, o cümlədən təhsil anlayışına müasir çağırışların fonunda yeni müstəvidə yanaşılması onu insanın formalaşdırılmasında əvəzolunmaz vasitəyə çevirir. Təhsilin sistem, nəticə, proses və ən nəhayət, bir dəyər kimi xüsusiyyətlərini meydana çıxarır ki, bütün bu yanaşmalarda onun tənzimlənməsi, istiqamətləndirilməsi və ən başlıcası yeniləşdirilməsi tələb olunur.

Pedaqogikada əsas anlayışlardan biri kimi təhsilin mahiyyət və məzmununa münasibət bildirilir. Onun fundamental müstəvidə xarakterik əlamətləri şərh olunur. Bu, ümumi şəkildə nəzəri-pedaqoji fikrin inkişafında məntiqə uyğun bir proses kimi nəzərə alınır. Biz özümüzün pedaqoji biliklərimizi həmin yanaşmaların əsasında yeniləşdirir və inkişaf etdiririk.

Lakin əsas məsələ həm də bu bilikləri fəallaşdırmaq, onları yaradıcı fəaliyyətin əsasına gətirməkdən ibarətdir. Onların produktiv xarakterini nəzərə almaqdır. Bir müəllim, pedaqoq, ümumiyyətlə, təhsil işçisi kimi buna daha çox önəm verməklə hər hansı fəaliyyətimizi tənzimləyərək iqtisadi uğurlarımızın əsasına gətirə bilərik. Nəticələrimizlə təhsil quruluculuğundakı addımları zənginləşdirərik.

Metodika, texnologiya, strategiya anlayışları. Bu anlayışların hər üçü bu gün pedaqoji üslubumuzda işlənməkdədir. Təhsil işçilərimiz, o cümlədən müəllimlərimiz məktəbə aid müxtəlif sənədlərdə onlara rast gəlməli olurlar. Və haqlı olaraq həmin anlayışların ifadə etdiyi məna, məzmun onların işlənmə arealı, eləcə də daha çox kimlərin səriştəsinə aid olması barədə müzakirələr aparırlar. Təəssüflə qeyd edilməlidir ki, pedaqoji fikrimizdə qlobal dünyanın təhsil islahatları meridianında yaranan anlayışlar, söz və ifadələr geniş müzakirə, diskussiya müstəvisinə gətirilmir. Onların özəllikləri barədə polemikaya zəif yer verilir. Lakin belə terminlərin meydana gəlməsi müəyyən innovasiyalı yanaşmadan xəbər verir. Onu sükutla qarşılamaq, yaxud əsassız olaraq qəbul etməmək olmaz. Hökmən onu fəal müzakirələrin obyektinə çevirmək, əsaslı şəkildə mənimsəmək lazımdır. Ən başlıcası müəllimlərin analitik düşüncəsindən keçirmək, onların mülahizələrini öyrənmək faydalıdır. Çünki müəllimlər belə prosesdə iştirak etməklə innovasiyaları yaxından öyrənmək imkanı qazanır, ondan istifadə işini özləri üçün asanlaşdırmış olurlar. Eyni zamanda, informasiya mədəniyyətinin formalaşması baxımdan bacarıqlar qazanırlar.

Metodika nədir? Bu sözün hansı məna daşıdığı çoxlarına bəlli olsa da, hazırladığımız məqalədə onu mənbələr əsasında bir daha xatırlamaq faydalı hesab edildi. İlkin olaraq ensiklopedik lüğətlərə istinad olundu: "metodika (yun. methodik) 1. Bir şeyin əməli surətdə icrası üçün metodlar, üsullar məcmusu. Elmi tədqiqlərin metodikası. 2. Müəyyən elmin tədris üsulları haqqında nəzəriyyə. Dil metodikası" (10).

İctimai xarakterli virtual aləmdə də metodika sözünün mənası daha geniş anlamda izah olunur: "Metodika hər hansı məqsədə nail olmaq üçün hazır qaydalar, alqoritmlər, prosedurlar toplusu kimi nəzər-

də tutulur...Metodika metoddan üsul və məqsədlərin konkretliyi ilə fərqlənir” (11). Təhsildə isə onun istifadə çaları Azərbaycan dilinin izahlı lüğətində olduğu kimi verilir. Eyni zamanda hər hansı fənnin tədrisi metodikası anlamında işləndiyi göstərilir (11). Belə qənaətə gəlmək mümkündür ki, metodika iki mənanı ehtiva etməklə dilimizdə işlənir. Onlardan biri çoxişlək söz, ikincisi isə fənlərin tədrisi ilə bağlı elm sahələrini ifadə edən termindir.

İkinci isə texnologiya anlayışıdır. Bu söz ötən əsrdə işlənməyə başlamışdır. Ona dair bir sıra araşdırmalar aparılmışdır. Son dövrlərdə ümumi pedaqogikanın sisteminə əsaslı şəkildə gəlməsə də, “təhsil texnologiyaları”, “pedaqoji texnologiyalar”, “təlim texnologiyaları”, “tərbiyə texnologiyaları” və s. kimi ifadələr işlənməkdədir. Professor Ə.Əlizadə psixopedaqoji araşdırmalarında belə qənaətə gəlmişdir ki, “Texnologiya istehsalat proseslərinin, məsələn, metalların texnologiyasının, kimyəvi texnologiyanın, tikinti işləri texnologiyasının üsul və vasitələri haqqında biliklərin məcmusudur... Pedaqoji texnologiya mahiyyət etibarilə təlim-tərbiyə prosesinin layihələşdirilməsinin sistemli metodu kimi səciyyələndirilir” (12).

Görəsən, pedaqoji texnologiya anlayışının işlənməyə başlanması nəyisə inkar etmir ki? Yaxud bu anlayış metodika anlamına yaxın bir dublet kimi çıxış edir? Yaxud da özünəməxsus məna kəsb edərək pedaqoji dilimizi zənginləşdirir? Son psixopedaqoji araşdırmalarda belə bir qənaət hasil edilir ki, “Pedaqoji texnologiya anlamının əmələ gəlməsi ilə, görəsən, fənlərin tədrisi metodikası özünün evristik əhəmiyyətini itirir? Qətiyyən yox! Pedaqoji texnologiyanın yaranması ilə fənlərin tədrisi metodikasının yönümü öz-özünə dəyişir; təkcə fənlərin tədrisi metodikasının anlayışları və üsulları texnoloji anlayış və üsullarla zənginləşmir, həm də fənlərin tədrisi metodikası pedaqoji texnologiyanın tərkib hissəsinə çevrilir və bu kontekstdə inkişaf etməyə başlayır. Metodistin də statusu dəyişir: o, texnoloq kimi fəaliyyət göstərir” (13). Fikrimizcə, pedaqoji texnologiya semantik cəhətdən daha geniş məna daşımaqla bir sıra texnologiyaları ehtiva edir. Metodika özü də bu ehtiva olunan texnologiyalardan biri kimi çıxış edir və müəllimin daha çox etimad və müraciət etdiyi texnologiya kimi əhəmiyyət daşıyır.

Strategiya isə son illərdə islahatyönümlü tədbirlərdən sonra işlənməyə başlanmışdır. Son kurikulumlarda ikinci hissə “Təlim strategiyası” adlanmaqla müəllim fəaliyyətini əhatə edən zəruri bilik, bacarıq və qabiliyyətlərin formalaşdırılmasının müvafiq sistemi kimi təqdim olunmuşdur. Bundan əlavə, I-IV siniflər üçün kurikulumların tezarus hissəsində onun izahı göstərilmişdir: “Təlim strategiyası təhsil prosesində istifadə olunan forma, metod, üsul və vasitələrin məcmusudur” (14). Dünyanın pedaqoji mənbələrində “oxu strategiyası”, “yazı strategiyası”, “danışma strategiyası” və s. anlayışlar işlənməkdədir. Onlar daha çox metodikanı ehtiva edərək fənlərin tədrisi ilə bağlı məsələlərin şərhində istifadə olunmaqdadır.

Göründüyü kimi, hər üç anlayış bir-birindən o qədər də ciddi şəkildə fərqlənməyən mənanı daşıyır. Onlar keyfiyyətlə bağlı məsələlərdə də yaxın indiqatorlara malikdir. Müasir pedaqogika, fənlərin tədrisi metodikası bu anlayışlar ətrafında araşdırmalar aparmaqla məktəbin, müəllimin tərəddüdlə yanaşdığı məsələlərə aydınlıq gətirməli və etibarlı alətlər kimi müəllim-

lərin istifadəsinə buraxılmalıdır.

Metodik işin əhəmiyyəti və tarixiliyi. Məktəb fəaliyyətinin tənzimlənməsində normal maddi-texniki baza, zəngin tədris-metodik ehtiyat, səriştəli müəllim kadrları və maliyyə imkanlarının olması əsas şərtlər kimi çıxış edir. Bütün bunlarla yanaşı, keyfiyyətli işin qurulması üçün səmərəli təşkil olunmuş və məhsuldar fəaliyyət göstərən metodik iş sistemi də vacib hesab edilir. Əksər pedaqoq və psixoloqlar metodik işi yaradıcılıq laboratoriyası kimi dəyərləndirir, onu məktəbin yaradıcı fəaliyyətinin əsasında duran bir mexanizm kimi səciyyələndirirlər. Eyni zamanda müasir məktəbin yaradıcı fəaliyyətini dəstəkləyən amil kimi qiymətləndirirlər.

Pedaqoji araşdırmalara əsasən belə qənaətə gəlmək olur ki, müəllimin pedaqoji fəaliyyətində özünü göstərən yanaşma təhsil prosesinin yarandığı vaxtdan mövcud olmuşdur. Müəllim hər hansı tədris fəaliyyətində özünün metodik yanaşmasını müəyyən etmişdir. Zəif və güclülüyündən asılı olmayaraq özünəxas fəaliyyət strukturu müəyyənləşdirilmişdir.

Müəllim bu gün də özünün tədris fəaliyyətini müvafiq mexanizmlərdən istifadə etməklə davam etdirməkdədir. Hər vaxt onun işinin keyfiyyəti məhsuldar olması ilə ölçülmüşdür. Lakin səmərəlilik və məhsuldarlığın kriteriyaları zaman-zaman dəyişmiş, dövrün tələbinə uyğun olaraq müəyyənləşdirilmişdir.

Ənənəvi olaraq metodik iş məktəb təhsilinin əsasında duran bir proses kimi daima mövcud olub. Əlbəttə, daha çox keçmişə qayıtmaqla metodik anlamda xüsusi bir anlayışın olmadığının şahidi oluruq. Lakin bu hələ metodik işin olması, yaxud metodik mənzərənin yaradılması deyildir. Hər hansı təhsil sisteminin mövcudluğu tədris-təlim fəaliyyətlərinin əsasında qurulan ciddi bir sistemdir. Bu sistemin özünəməxsus daxili bağlar sistemi vardır. Müəllim bu bağlar, əlaqələr sisteminin mərkəzində dayanmaqla onu müşayiət edir. Çox düzgün olaraq bu gün həmin fəaliyyətə istiqamətverici, əlaqələndirici xarakterdə olan iş kimi baxılır, əslində elə müəllimin təhsil prosesindəki tarixi missiyası da belə olub. Yəni daim istiqamətverici xarakterdə yanaşmaları ilə fəaliyyətini tənzimləyib, dəstəkverici funksiyada çıxış edib.

Heç şübhəsiz, bu gün də məktəbin keyfiyyət göstəricilərini yüksəltmək üçün ona dəstək olmaq vacib hesab edilir. Bu daha çox məktəbin cəmiyyətin inkişafı naminə məşğul olduğu və həyata keçirdiyi vətəndaşlıq missiyası ilə bağlıdır.

Ölkəmizdə təhsil sisteminin inkişafı, ilk növbədə, onun daha müstəqil qurum kimi fəaliyyət göstərə bilməsindən daha çox asılıdır. Bu gün təhsil quruculuğu üzrə aparılan işlərin başlıca məqsədində o dayanır: məktəb müstəqilliyi daha çox genişlənsin, özünü idarə edə bilmək funksiyası qazansın, müəllim və şagird fəaliyyətinin əsasını təşkil edən inkişaf dinamikasını izləyə bilsin, onun artmasını tənzimləsin və sair. Bu işlərin qurulmasında məktəb müəllimlərinin ilkin olaraq əlaqələndirilməsi və vahid məqsədə doğru istiqamətləndirilməsi həddindən artıq önəmli hesab edilir. Bütün müəllimlərin tədris fəaliyyətindəki ümumi cəhətlər nəzərə alınmaqla onların yaradıcı pedaqoji fəaliyyətinə rəvac verilir.

Məlum olduğu kimi, indiki halda ümumtəhsil məktəbləri müəllim və şagirdlərin fəaliyyətində maraqlı olsalar da, hələ də inzibati amirlik üsulunun əlamətləri qalmaqdadır. Formal olaraq bir struktur kimi

məktəb metodbirləşmələri özlərinin fəaliyyətində müəllim təcrübəsini qabaqlaya bilmir. Müəllimlərin inkişafında ardıcıl və sistemliliyin zəifləməsi halları müşahidə edilir. Bu isə öz növbəsində məktəbdə təhsil işinin keyfiyyətinin artmasına mənfi təsir göstərir. İstər-istəməz yeni dövrün ümumi təhsil sisteminin qurulması müəllim və təhsildə maraqlı olanların qarşılıqlı əlaqə və əməkdaşlığının təşkil olunmasını zəruri edir.

Məktəbin metodik işinin xarakterindən danışarkən, ilk növbədə, onun empirik araşdırmalar, tədqiqatlar üzərində qurulmasını qeyd etmək vacibdir. Çünki bütün hallarda şagirdlərin təlim prosesinə cəlb olunmaları maraq effekti ilə bağlı olur. Maraqlılığın təmin olunmasının başlıca şərti isə təlimin demokratik prinsiplərə uyğun olaraq qurulması ilə müəyyənləşir.

Müasir zamanda təhsil sistemində, xüsusən də ümumi təhsildə şagirdin meyil və maraqlarının nəzərə alınması aparıcı rol oynayır. Şagirdlər ehtiyac və tələbatlarının ödənildiyi şəraitdə daha həvəslə çalışırlar.

Maraqlı təlim işinin qurulmasında müəllimin aparıcı rolunun nəzərə alınması əsas didaktik tələblərdən hesab edilir. Əslində məktəbin metodik işinin mərkəzində müəllim dayanır. Bu işi mahiyyət etibarilə o, həyata keçirir və bütün hallarda işinin keyfiyyətliliyini aparıcı yerdə qoymaqla dəstəkverici fəaliyyətləri məhz öz üzərinə yönəldir.

Məlum olduğu kimi, müəllim peşəkarlığının yüksəldilməsində qabaqcıl təcrübələrin öyrənilməsi inanılmış formalardan biridir. Məktəb bu fəaliyyət formasından istifadə edilməsində özünün imkanları ilə müəllimə dəstək verməli, onu stimullaşdırmalıdır. Eyni zamanda məktəb bir yaradıcılıq laboratoriyası kimi keyfiyyətli təcrübələri seçib toplamaqda, onların vasitəsi ilə müəllim peşəkarlığının yüksəldilməsində fəaliyyət istiqaməti müəyyənləşdirməli və uğurlar qazanmaqda ona istinad etməlidir.

Ölkədə təhsilin yeni məzmununa keçid həm də yeni resursların yaradılması zərurətini meydana çıxarmışdır. Müasir şəraitdə yaradıcı fəaliyyət göstərən məktəb və müəllimlərin ehtiyac və tələbatlarına uyğun resursların yaradılmasında onun variativliyinin gözlənilməsi təlimin təşkilində optimallığın təmin olunması baxımından əhəmiyyətli hesab edilir. Məktəb şəraitinə uyğun şagirdlərin yaş və psixoloji imkanları nəzərə alınmaqla belə resursların hazırlanmasının məsuliyyəti məktəbin və onun müəllimlərinin üzərinə düşür. Ümumiyyətlə, nəticəyönümlü təhsil şəraitində müəyyən olunmuş standartlara və yerli şəraitə uyğun olaraq fəaliyyətlərini təşkil etmək bugünkü məktəbin vəzifələrindən biri hesab edilir.

Müasirlik müstəvisində ümumi təhsilin fəaliyyət istiqamətləri genişdir. Bu məqalədə onlardan bəziləri barədə söhbət açıldı və zəruri pedaqoji anlayışlar barədə fikirlər söylənildi. Heç şübhəsiz, bu məsələlər ilkin yanaşmalar kimi dəyərləndirilə bilər və gələcəkdə onların sistemli olaraq öyrənilməsi ümumi təhsilin nəzəri və praktik məsələlərinin araşdırılması baxımından faydalı hesab edilir.

*Rəyçi: prof. F.Rüstəmov*

## İstifadə edilmiş ədəbiyyat

1. Затов А. Образование в конце XX века (материалы круглого стола).

/А.Ф. Зотов, В.У. Кинцов, В.М. Розин, А.Р. Марков [ и др.]. Вопросы философии, 1992, № 9.

2. Əhmədov M., Əliyev M., Kərimova F. və b. Müəllim hazırlığının və orta təhsilin perspektivləri (Qərb təhsil sistemi təcrübəsi əsasında). Müəllimlər üçün vəsait. Bakı: Adiloğlu, 2005.

3. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu. Bakı: “Hüquq ədəbiyyatı”, 2009.

4. Mehrabov A., Abbasov Ə. Kurikulum islahatı zamanın tələbidir. “Kurikulum islahatı: tədqiqatlar, nəticələr” kitabı. Bakı: Mütərcim, 2011.

5. www.president.az/files/future_az.pdf “Azərbaycan 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyası.

6. president.az/articles/21993 Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji ...

7. www.president.az/articles/9779 “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”.

8. Mehrabov A. Azərbaycan təhsilinin müasir problemləri. Bakı: Mütərcim, 2007.

9. Rüstəmov F., Dadaşova T. Ali məktəb pedaqogikası. Bakı: Nurlan, 2007.

10. Azərbaycan dilinin izahlı lüğəti. Dörd clddə. III cild. Bakı: Şərq-Qərb, 2006.

11. az.wikipedia.org /wiki/Metodika.

12. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür: ideyalar, prinsiplər, problemlər. Psixopedaqoji araşdırmalar. Bakı: Adiloğlu, 2001.

13. Əlizadə Ə., Əlizadə H. Yeni pedaqoji təfəkkür: psixopedaqogikaya giriş. Bakı, 2008.

14. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.

**А.Аббасов**

**Общее образование в контексте педагогического рассмотрения**

**Резюме**

В статье представлены результаты исследований по некоторым проблемам общего народного образования. Как правило, в статье рассматриваются такие понятия, как образование, методы, технология и стратегия. Исследовательская работа также посвящена организации методической деятельности, которая играет огромную роль в повышении качества образования. Кроме того, в статье анализируются типичные особенности, определяющие характеристики учебной деятельности.

**A.Abbasov**

**General education in the context of pedagogical consideration**

**Summary**

The article introduces the results of researches on some problems of general public education. Generally, the article deals with concepts such as education, methods, technology and strategy. The research paper also deals with the organization of methodical activity which has a huge role in increasing quality of education. Moreover, the article analyses typical features determining



# MƏNTİQİ TƏFƏKKÜRÜN PEDAQOJİ VƏ PSİXOLOJİ SƏCİYYƏSİ

**Sahil Cəfərov,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***Lənkəran Dövlət Universitetinin müəllimi***

***Açar sözlər:*** *insan psixologiyası, riyazi məntiq, fikri fəaliyyət, mülahizə, optimal səviyyə, təfəkkür fəaliyyəti, idrak prosesi.*

***Ключевые слова:*** *человеческая психология, математическая логика, умственная деятельность, мышление, оптимальный уровень, деятельность мышления, процесс разума.*

***Key words:*** *human psychology, mathematical logics, mental activities, consideration, optimal level, mental activities, intellectual process.*

Bu gün alimləri, müəllimləri, valideynləri, tədqiqatçıları və ümumiyyətlə, cəmiyyəti düşündürən ən mühüm məsələlərdən biri də böyüyən nəslin gələcək sosial həyata hazırlanması və onların hərtərəfli inkişaf etmiş bir şəxsiyyət kimi formalaşdırılması problemidir. Təbii olaraq cəmiyyət həmişə maraqlı olmuşdur ki, üzvlərini özünə uyğun formalaşdırsın. Formalaşma prosesinin inkişaf tendensiyası təkcə cəmiyyətin üzvləri arasında eynilik prinsipləri ilə məhdudlaşmır, bu, həm də bəşəriyyətin ümumi inkişaf tendensiyası ilə determinləşir. Bu tendensiyanın fonunda bilavasitə insan amilinin potensial imkanları durur. Çünki bəşəriyyətin bu günə qədər əldə etdiyi nailiyyətlərin mərkəzi nüvəsini insan təfəkkürü və onun qeyri-maddi istehsal tempindəki dominantlıq təşkil edir. Həqiqət ondan ibarətdir ki, fikri fəaliyyət bəşəriyyətin tarixi inkişafı gedişində həm qazanılmış biliklərin mənimsənilməsi, həm də tamamilə yeni biliklərin “təkrar istehsalı” sferasında aparıcıdır. İnsan idrakı ictimai-tarixi inkişafın gedişində, sosial-iqtisadi və ictimai-siyasi perspektivlərin dəyişilməsi prosesində daim yeni biliklər əldə edir, inkişaf edir və müxtəlif cür sistemləşir. Başqa sözlə ifadə etsək, idrakın əsas nailiyyət və nəticələrinin maddi təzahürünün təsbit olunmuş məcmusu kimi elmi sistemlər yaranır və daim inkişaf edir. Təsdiqini tapmış fakt ondan ibarətdir ki, bütün elmlər sistemi birmənalı olaraq idrak nəzəriyyəsinin, yəni qneseologiyanın əsasında yaranır və inkişaf edir, yeni predmetlər qazanır.

İnsan təfəkkürü idrak nəzəriyyəsinin, fəlsəfənin son dərəcədə ümumi prinsipləri əsasında, bir-birini qarşılıqlı surətdə tamamlayan elmin-riyazi məntiq pedaqogika və psixologiya elmləri tərəfindən daha mükəmməl şəkildə şərh olunur və inkişaf etdirilir. Bu elmlərin sintezi imkan verir ki, insan psixologiyasında uyğun biliklər bir-birinə məntiqi surətdə bağlansın və həm də əlaqələndirməklə yeni nəticələrin əldə olunmasına geniş imkanlar açılsın. Elmi faktların xarakteristikası onunla təsdiq olunur ki, riyazi məntiq daha dərin fikri əməliyyatların aparılmasını reallaşdırdığı halda təfəkkür öz növbəsində həmin əməliyyatların, mühakimə və proseslərin maddi formasını-fikrin

*2

sözlərlə ifadəsini, başqa sözlə desək, mühakimənin və xüsusilə mühakimənin məntiqi quruluşunun aşkar edilməsini reallaşdırır. Digər tərəfdən, nitqin təkmilləşdirilməsi, zənginləşdirilməsi və onun mühakimə proseslərində tam mahiyyətdə əks oluna biləcək şəklə gətirilməsi zəruriyyəti riyazi məntiqin daha dəqiq və davamlı əməliyyatlarla perspektivlərə doğru irəliləməsini mühüm bir vəzifə kimi elmin qarşısında canlandırır. Fikri əməliyyatların verbal təqdimatı qədim yunan filosofu Aristotelin meydana gətirdiyi formal məntiqin əsasında yaransa da, bu tendensiya XIX əsrin ortalarından etibarən böyük ingilis riyaziyyatçısı C.Bulun kəşf etdiyi riyazi məntiqin əsaslarında təkmilləşməyə mükəmməl keçid almış və formalaşmağa başlamışdır. Yəni Aristotel (e.ə.384-322-ci illər) obyektiv reallığı yalnız iki rəngin- "ağ" və "qara" rənglərinin potensial çalarları zəminində məhdudlaşdırırdısa, C.Bul (1815-1864) elmşünaslığa riyazi metodların və riyazi dilin formal məntiqdə tətbiqini, məntiq elminin perspektivlərini daha da genişləndirmiş və beləliklə də, "Riyazi məntiq" elmini meydana gətirmişdir.

Sonrakı illərdə (XX əsrin ikinci yarısı) böyük Azərbaycan alimi, professor Lütvi-Zadə reallıqla fantastikanın harmoniyasından yaranmış "qeyri-səlis məntiq" nəzəriyyəsini meydana gətirmişdir. Lütvi-Zadə Aristotelin insanların beynində maddiləşmiş məntiqini öz qeyri-səlis məntiqi ilə dağıtmağa nail olmuşdur. O sübut etmişdir ki, insan dünyanı yalnız "ağ" və "qara" rənglərin çalarlarında duyub qavramır. İnsanın dünyanı görüb dərk etmə imkanları zəngin və hüdudsuzdur. Elə buna görə də professor Lütvi-Zadə hüdudsuzluğun riyaziyyatını (qeyri-səlis cəbr-"Zadəcəbr") yaratmış və onun rəngarəngliyinin mükəmməl izahını vermişdir. Bundan başqa, alim dinamik sistemlərdə çoxmeyarlı optimallaşma nəzəriyyəsini meydana gətirməklə elm tarixində növbəti bir səhifə açmışdır. Bu baxımdan professor Lütvi-Zadənin nəzəriyyələri istər riyazi məntiq elminə, istər digər elm sahələrinə və istərsə də real həyatda-istehsalat prosesinə və elmi-texniki tərəqqinin sürətlənməsinə çox dəyərli töhfələr verməkdədir.

Riyazi məntiqdən istifadə olunduğu təqdirdə insan duyğu, qavrayış və təsəvvürlərdən alınan məlumatlardan bəhrələnir və eyni zamanda, hissi idrakın hüdudlarından kənara çıxır, yəni xarici aləmin cisim və hadisələrinin elə xassə və münasibətlərini dərk edir ki, onlar qavrayışın iqtidarında real qiymətini tapa bilmir. Deməli, riyazi məntiq duyğu, qavrayış və təsəvvürlərin fəaliyyətini davam və inkişaf etdirərək fikri əməliyyatlar vasitəsilə hissi idrakın hüdudlarından çox-çox uzaq sərhədləri qət edə bilir. Bu baxımdan belə bir nəticəyə gəlmək mümkündür ki, fikri əməliyyatların ilkin fazasının yaranmasında mülahizələrin rolu əvəzsizdir. Fikri əməliyyatların intensivləşmə əmsalı idrak fəaliyyətinin sadə mülahizələr vasitəsilə mürəkkəb mülahizələrə transformasiyasında ifadə olunur.

Fikri əməliyyatların riyazi modeli mülahizələrin inkarı qanununda daha aydın müşahidə olunur. Biri digərinin inkarı olan iki mülahizə arasında müəyyən və sonsuz qarşılıqlı asılılıq əlaqələrinin yaranması bunu deməyə əsas verir. Bu tendensiyada cisim və hadisələrin, onların xassə və əlamətlərinin arasındakı əlaqələrin inikasını özündə təcəssüm etdirən hökmlərdən söhbət gedir. Hökmlər özlüyündə məfhumlar arasında mövcud olan müxtəlif əlaqə və

münasibətlərin müəyyənləşməsi missiyasında və dairəsində nisbi həqiqətdir. Buna görə də “hökm”ü nəyinsə barəsində söylənmiş mülahizə səviyyəsində qiymətləndirmək daha doğru olardı. Hökmlər eyni zamanda obyektiv aləmin cisim və hadisələri arasında yaranan və yarana biləcək müəyyən münasibətləri ya iqrar, ya da inkar etmək funksiyalarını özündə birləşdirir. Bizim yuxarıda qeyd etdiyimiz misalda həm iqrari və həm də inkari hökmlərdən istifadə olunur. Riyazi məntiqin aparıcı rolu məhz onda üzə çıxır ki, mülahizələrin inkarı tendensiyasında hökmlərin ikiqat inkarından həqiqi və təsdiqlənmiş nəticə əldə olunur; ilkin doğruluğa qayıdış mütləqləşdirilir. Bu gedişat təfəkkürdən əvvəlki əməliyyatlara nisbətdə daha mürəkkəb əməliyyatların həyata keçirilməsini tələb edir.

Riyazi məntiqin əsas göstəricilərini təfəkkürün məkan abstraksiyaları ilə sintezində axtarmaq elmi cəhətdən daha düzgün olardı. Təfəkkürün sintezləşməsi yenə də nə isə hissi predmetlərdir, hərçənd ki, onlar abstraksiyadırlar və mövcud varlıqları yox dərəcəsindədir. Məhz riyazi məntiqin əsas qüdrəti fikir hissiliyini təfəkkür imkanlarında sintezləşdirməkdə və eyni zamanda fikir hissiliyini düşüncələrimizin nəhayətsiz sərhədlərində sonuncu abstrakt qalıqları ilə vidalaşdırmaqda ifadə olunur. Bu proses vahid məcrada yeni bir mükəmməlliyin əldə olunması ilə yekunlaşır. Həmin məsələlər mülahizələrin konyuksiyasında (verilmiş A və B mülahizəsinin yalnız və yalnız hər ikisi doğru olduqda doğru, qalan hallarda isə yalan olan mürəkkəb mülahizə) tam aydınlığı ilə görünür. Lakin mülahizələrin implikasiyası təfəkkürün yeni, daha mürəkkəb laylarını hərəkətə gətirməklə xarakterizə olunur. Mülahizələrin implikasiyası iki sadə mülahizə arasında sıx bağlılıq və hətta asılılıq prinsipləri ilə səciyyələnən yeni mülahizənin meydana gəlməsində ifadə olunur. “İmplikasiya situasiyası”nda təfəkkür bilavasitə riyazi məntiqin qneseoloji hücumuna məruz qalır və yeni düşüncə mərhələsinə keçir. Belə vəziyyətlərdə əqli nəticənin induktiv və deduktiv funksiyaları hərəkətə gəlir. Bu baxımdan “Əgər qar yağıbsa, yollar buz bağlayar” mürəkkəb mülahizəsində fikri əməliyyatların tam ünvanı üzrə cərəyan etməsi üçün sillogizmin, induksiya və deduksiyanın bütün imkankanlarının təyinatını və konturlarını diqqət mərkəzində saxlamaq vacibdir ki, eyni zamanda yeni bir mürəkkəb mülahizə hasil ola bilsin. Burada psixoloji keyfiyyət olaraq təfəkkür məhsulu və ya fikrin forması ümumiyyətlə ümumidir və abstraktdır. Deməli, fikri fəaliyyət kimi təfəkkür fəal ümumidir-məhz özünü yaradan fəaliyyətdir. Dövri əməliyyatlarda motivasiyanın güclənməsi mülahizələrin ekvovalensiyasında nisbətən fərqli mahiyyətin əldə olunması ilə determinləşir. Təbiidir ki, bu proseslərdə duyğu, qavrayış və hafizənin rolu istisna edilmir. Riyazi məntiqin mükəmməllik dərəcəsi yaddasaxlama, yadasalma və hifz-etmə proseslərinin gedişindən çox asılıdır. Bu proseslərdə diqqətin paylanması, həcmi və keçirilməsi, təxəyyülün yaradıcı və bərpaedici aktları bir neçə mülahizənin sinxrom idarə olunmasında müstəsna əhəmiyyət daşıyır [6]. Lakin müşahidələr onu deməyə imkan verir ki, riyazi məntiq idrak proseslərinin bütün elementlərini oyadaraq vahid məqsədə istiqamətləndirir və bununla da məqsədlərlə tələbatların növbələşməsini təmin edir. Onu da qeyd etmək vacibdir ki, insan şüurunun və təsəvvürünün faktlarını müşahidə etmək üçün inkişaf etdirilmiş diqqət və abstrakt-

laşdırma qabiliyyəti tələb olunur. Məhz bu ilkin şərhdə biz hissi olan, təsəvvürlə fikir, düşüncə arasında fərqlərdən söz açmalıyıq; bu fərqlər idrakın təbiəti və növlərini anlamaq üçün həlledici önəm daşıyır və bu fərqlər haqqında təfəkkürdə aparılan bütün əməliyyatlar predmetin aydınlaşmasına xidmət edir. Hissi ilə fikir arasında fərqi biz onda görə bilərik ki, birincinin xarakter özəlliyi təkcədir və təkcə (sadə mülahizə) digər təkcələrlə (mülahizələrlə) bağlı olduğundan riyazi məntiq bu "təkcə"lərin bir-birindən kənarda olduğu hallarda onlar arasında sintezləşməni mükəmməl aparır ki, bunun da əsas sirri abstrakt formaların bir yerdə və ardıcıl düzülüşündədir. Riyazi məntiqdə xüsusi düsturlar vasitəsilə artıq bir növ donmuş, bitmiş, tamamilə və sona qədər ifadə olunmuş fikirlər, yəni nəticələr təfəkkürün imkanları şəraitində bir-biri ilə yenidən qarşılaşdırılır. Hər hansı fikri əməliyyatı tələb edən predikatın tərkibində növbəti əməliyyatların aparılması üçün şərtsiz həlqələr mövcuddur. Sadəcə olaraq burada eyni və əks qütbdə yerləşən elementlərin bir-birinə mexaniki formada qovuşması qeyri-mümkündür. İnsan faktorunun təfəkkür fəaliyyəti fikri əməliyyatların gedişinə mane olan bəndləri ilk zərbədən dağıdaraq bilavasitə ali məqsədin reallaşmasına istiqamətlənir [1].

Riyazi məntiqin bilavasitə iştirakı ilə predikatların doğruluq oblastı onun təyini oblastının əsasında hasil olur. Bu tendensiya məntiq elminin nəhayətsizliyini təsdiqləməklə riyazi məntiqdə varlıq və yeganəlik kvantorlarından istifadə olunmasını mümkün edir. Məsələyə ümumi prizmadan yanaşdıqda onu qeyd etmək vacibdir ki, obyektiv aləmin cisim və hadisələrinin riyazi ifadəsi çoxluqlar olduğundan bu əməliyyatların məqbul variantlarla həyata keçirilməsi məhz gündəlik fəaliyyətimizə əvəzolunmaz fayda verəcəkdir. Bu baxımdan riyazi məntiqin doğruluğunu isbata yetirmək fikrinə düşsək, ilk növbədə, biz çoxluqların müqayisəsinin zəruri və kafi şərtinin təhlilinə geniş yer ayırmalıyıq. Çoxluqlar özlüyündə ümumidir və ümumilik də ən ümuminin əvvəlki və sonrakı formalarından biridir. Təfəkkür fəaliyyətinin təhlil (mülahizənin fikrən hissələrə bölünməsi) və tərkib (həmin hissələrin fikrən, uyğunluq prinsiplərinə əsasən qarşılaşdırılması və birləşdirilməsi) əməliyyatları əldə olunan nəticənin mükəmməlliyini xeyli artırır. Riyazi məntiqdə predmetlərin uyğunluğu və proseslərə gərəkliliyi problemin nə dərəcədə həll olunması ilə ölçülür. Təlim prosesində şagirdlərə öyrənməyi öyrətməliyik ki, şagird bilik, bacarıq və vərdişləri müstəqil əldə etmək məcburiyyətində qalsın. Qloballaşma dövründə "öyrənməyi öyrətmək" tendensiyasından istifadəyə dünya praktikasında xüsusi diqqət yetirilir. Bu tendensiyanın önə çəkilməsi böyüyən nəsli xüsusi düşüncə texnikasından bəhrələnərək yeni-yeni nailiyyətlərə və mükəmməl uğurlara aparacaq.

Müxtəlif tendensiyalardan belə bir obrazlı nəticə hasil olur: təfəkkür fenomenini bir gölə, formal məntiqi həmin gölə axan çaylara, riyazi məntiqi isə çaylarda axan suyun həcmini və sürətini şərtləndirən yağışa bənzətmək olar. Belə ki, yağış gücləndikcə, çaylarda axan suyun hərəkət sürəti intensivləşdikcə yaranan sel qarşılaşdığı bəndləri və sədləri qeyri-şərtsiz dəf etdiyi kimi, riyazi məntiq də insan psixologiyasının bütün laylarını hərəkətə gətirə bilir. Beləliklə, gölün məcrası axan suların hesabına genişlənib dənizlərə, dənizlər okeanlara, okeanlar isə nəhayətsiz coğrafiyalara çevrilə

bilər. Bu məntiqdən çıxış edərək deyə bilərik ki, təfəkkür məhz mədaxil düşüncə tərzlərinin hesabına hüdudları müşahidə imkanlarımızdan çox-çox uzaq sərhədlərə qədər genişlənə bilər. Bu nəticənin alınması insan amilinin iradi cəhdləri hesabına reallaşır.

Yuxarıda qeyd etdiyimiz kimi, bəşəriyyətdə baş verən ictimai-siyasi və sosial-iqtisadi inkişafın fonunda cəmiyyətin bizə ünvanladığı haqlı çağırışları nəzərə almaqla böyüyən nəsli müasir, dinamik tələblərə cavab verən bir şəxsiyyət kimi formalaşdırmağa çalışmalıyıq. Bu məqsədin reallaşmasının əsas yollarından biri və bəlkə də ən vacibi böyüyən nəslin məntiqi düşüncəyə dəvət olunmasındadır. İndiki dövrdə modernləşmə dünyanın əksər yerlərində dominant səviyyədə qəbul olunur. İnsanın təfəkkür məhsullarının və kreativ insan amilinin ön sıralarda qərar tutması təhsil sistemimizin bu sferada qurulmasını və bu yönümdə istiqamətlənməsini tələb edir. Belə olduğu halda davamlı nailiyyətlərin əldə olunması mümkün həddə çatacaqdır. Elmi tədqiqatların və fundamental araşdırmaların qeyd etdiyimiz məsələlərə istiqamətlənməsi elmi nailiyyətlərimizdə yeni-yeni perspektivlərin əldə olunmasına şərait yaradacaqdır. Sosial-iqtisadi tərəqqinin və texnoloji sıçrayışların daim növbələşdiyi bir şəraitdə təhsil müəssələrində mütəmadi olaraq qeyd etdiyimiz istiqamətlərdə seminarlar təşkil olunmalıdır ki, böyüyən nəslin qazandığı bilik, bacarıq və vərdişlər modernləşərək dinamikanın tələblərinə cavab verib müasirləşsin.

***Rəyçi*: *prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Əlizadə Ə., Bayramov Ə. Sosial psixologiya. Bakı, 2003.
2. Əliyev B., Əliyeva K., Cabbarov R. Pedaqoji psixologiya. Bakı, 2014.
3. Sadıqov N. Riyaziyyatın ibtidai kursunun elmi əsasları. Bakı, 1991.
4. Mayers D. Psixoloqi. Minsk, 2001.
5. Stolərenko L. Pedaqoqiçeski psixoloqi. Feniks, 2000.
6. Seyidov S., Həmzəyev M. Ümumi psixologiya. Bakı: YYSQ, 2014.

**С.Джафаров**

**Психологическая характеристика логического мышление**

**Резюме**

В статье анализируется роль возможности математической логики в психологическом развитии человека. Статья в основном посвящается перспективе развития математической логики на основе особенностей деятельности мышления.

**S.Jafarov**

**Psychological peculiarity of logical thinking**

**Summary**

Resources of mathematical logic are analyzed in the article from the point of view of psychological development of human being. The article deals with the development perspectives of mathematical logic on the basis of the mentalitx activities.



# ELMİLİK ƏSAS KRİTERİYADIR

**Ədalət Abbasov,**
***Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin kafedra müdiri, dosent***

***Açar sözlər:*** *assonans, alliterasiya, fono-semantika, leksik-semantika, sintaktik semantika, təkrir, ekspressiv.*

***Ключевые слова:*** *ассонанс, аллитерация, фоно-семантика, лексическая семантика, синтаксическая семантика, повторение, экспрессивность.*

***Key words:*** *assonance, alliteration, phono-semantics, lexic-semantic, syntactic-semantic, reiteration, expressive.*

Ali məktəblərin bakalavriat səviyyəsində nitq mədəniyyəti fənninin tədris edilməsi mütəxəssislər tərəfindən dilimizin elmi əsaslarına münasibəti də dəyişdirmişdir. Müstəqillik illərində Azərbaycan dilinin dövlət dili kimi geniş istifadə edilməsi bunun üçün əlverişli şərait də yaratmışdır. Azərbaycan dilinin təkmilləşdirilməsi sahəsində görülən işlər dilin ayrı-ayrı bölmələrinin də öyrənilməsini zəruri etmişdir. Çünki nitq inkişafının əsası bütün bilik-lərin xəzinəsidir" (K.D.Uşinski).

Dil millətin varlığını təmsil edən ən qiymətli abidədir, dil özünü təlim, tərbiyə və inkişafın mühün vasitəsi kimi göstərir.

Pedaqoji elmlər sisteminin mühüm bir sahəsini təşkil edən Azərbaycan dilçiliyi barədə ixtisas sahibi olmayan adamlar da məlumatlandırılmalı, onun əsaslarına dair elmi biliklər haqqında ən zəruri materiallardan xəbərdar olmalıdır. Belə hallarda praktik əhəmiyyətli nəzəri biliklərə daha çox yer verilməli, asandan çətinə, sadədən mürəkkəbə prinsipi gözlənilməlidir.

Elmdə hədsiz-hesabsız mübahisəli məsələlərin olması məktəb proqramlarına cilalanmış məlumatların salınmasını tələb edir. Fonetika, morfologiyaya dair kifayət qədər biliklərə yiyələnmiş şagirdlər cümlə, cümlə üzvləri, o cümlədən sadə cümlə haqqında fikir söyləməyə hazırlanırlar. Bu yanaşmalardan biri də sadə cümlənin sintaktik sistematikasının formalaşmasında fonetik vasitələrin rolu məsələsidir.

Dilçilik elminin həm terminoloji, həm də ümumişlək xarakterə malik kateqoriyaları sırasında semantika (məna) anlayışının xüsusi mövqeyi vardır. Bu leksik vahid daxili mənası və formalaşma obyekti baxımından rəngarəngdir: a) fono-semantika b) leksik semantika c) sintaktik semantika. Bunların formalaşma üsulları zəngin və rəngarəng olduğu kimi, hər birinin yaranma yolları da çoxşaxəlidir.

Bu xüsusiyyətinə görə də haqlı olaraq həmin linqvistik proses mənanın ilk obyekti olan səs nəticəsində təzahür etdiyindən obrazlılığın fonetik səviyyə göstəricisi adlandırılır. Fono-semantik proses alliterasiya (eyni samit səslərin təkrarı), assonans (eyni saitlərin təkrarı), təkrar (ritmik-fonetik) və intonasiya (şeirin və ya cümlənin xüsusi intonasiya ilə oxunması) vasitəsi ilə reallaşdırılır.

Bütün bu fono-semantik hadisə kompleks şəkildə sözün oynaq, axıcı səslənməsini və nəticə etibarilə nitqin ifadəliliyini təşkil edən amilə çevrilir.

Leksik-semantik istiqamət fono-semantik ifadə tərzindən fərqli olaraq sözün məna çalarlılığının rəngarəngliyinin formalaşmasına hesablanan linqvistik bir prosesdir. Linqvistik prosesin bu cür təzahürünə isə obrazlılığın leksik göstəriciləri deyilir.

Sintaktik semantika əvvəlkilərdən fərqli olaraq mənanı formalaşdıran vasitələrin ayrı-ayrılıqda (individual qaydada) deyil, vəhdətdə (konstruktiv-semantik aspektdə) fəaliyyəti kimi anlaşılır. Əslində, semantik elementlər biri digərini təşkil edir. Yəni səsin mənası öz təsir dairəsi ilə sözün mənasını formalaşdırır.

Haqlı olaraq deyirlər ki, cümlə dilin özüdür. Əgər bu fikrə istinad etsək, dil kimi cümlə də kommunikativ funksiyanı yerinə yetirir. Demək, dilin iki funksiyası olduğu kimi (kommunikativ, ekspressiv), cümlə də iki vəzifəni icra edir. Kommunikativ funksiya anlayışına həm də informativ vəzifə daxildir. Dil ilə cümlə arasında funksional mövqe baxımından paralelizm aparsaq, belə bir qənaətə gələ bilərik ki, cümlə həm informativ, həm də ekspressiv (obrazlı) xarakterə malikdir. Hər iki mövqedə cümlə müəyyən məna yükü daşıyır. Birincidə məlumat xarakterli məna, ikincidə isə bədii və emosional məna çaları ifadə edir.

Məlumat xarakterli məna cümlənin ənənəvi qrammatik strukturuna əsaslanır. Bu prosesdə ən azından qrammatik əsas öz sabit mövqeyində qalır. İkinci halda isə vəziyyət tamam dəyişir. Belə ki, digər amillərlə yanaşı, struktur dəyişikliyi də mütləq mövqe tutur.

Əsas məqsəd – sintaktik semantikanın fonetik üsullarla formalaşması probleminin həllinə yönəldiyi üçün birbaşa mətləbə keçməyi məsləhət bilirik. Əvvəldə ümumi sxem şəklində təsvir etdiyimiz məsələləri fərdi analizə çevirsək, problemin həllini bir qədər də asanlaşdırmış olarıq. Bunun üçün konkret aşağıdakı amillər tədqiq obyektinə cəlb olunmalıdır: təkrir və alliterasiya; təkrir və assonans; ritmik (fonetik) təkrir; fonetik intonasiya və vurğu.

Təkrir və alliterasiya. Bu başdan deyə bilərik ki, təkrir anlayışı özünün semantik çalarına və tutduğu mövqeyə görə genişdir. Hətta ədəbiyyatşünaslıq termini olan “rədif” də bu anlayışın tərkib hissələrindən biri sayılır. Bu geniş anlayış sxeminin ardıcıllığını nəzərə alsaq, birinci sırada səs təkririni görərik. Danışıq səsləri təsnifi cəhətdən iki cür (sait və samit) olduğu üçün səs təkriri də iki baxımdan mövcuddur: a) alliterasiya, b) assonans.

Alliterasiya – eyni samit səslərin təkrarı. Sözün ritmik (oynaq) və ahəngdar səslənməsi məhz bu cür fonetik hadisələrin sayəsində mövcud olur. Məsələn, “İgid odur, atdan düşə atlana, igid odur hər əzaba qatlana”; “Az aşım ağrımaz başım” atalar sözlərində: a) birincidə *g, d*; b) ikincidə isə *ş* və *m* samitləri nitqdə alliterasiya yaradır.

Assonans - eyni sait səslərin təkrarı. Sözün təsirli, rəvan səslənməsində sait səslərin təkrarlanmasının da xüsusi rolu vardır. Ümumiyyətlə, səsdən bacarıqla istifadə olunması, eləcə də danışıq səslərinin düzgün tələffüz edilməsi nitqin təsirliliyini gücləndirir. Fono-semantik prosesin reallaşmasında istifadə edilən bu cür fonetik üsullar semantik qatda zənginləşməni təşkil etməklə yanaşı, həm də yeni bir semantik təzahürün formalaşmasına gətirib çıxarır.

Təkrar sözünün obrazlılığın fonetik səviyyə göstəricisi terminlərindən biri kimi işlənməsi də, sözsüz, emosional nitqə yeni bir rəng qatan anlayış kimi düşünülməsinə

əsas verir. Bu anlayışın semantik komponentinə daxil olan "rədif" termini də eyni semantik funksiyanın təşkiledicilərindən sayılır. Bir qayda olaraq, misranın sonunda, qafiyədən sonra işlənən rədif bəndin tərkibində və bütöv şeir bəndlərində ola bilər. Şeirin bu əlaməti fikrin ahəngdar, obrazlı ifadəsinə şərait yaradır.

"İntonasiya şifahi nitqdə özünü göstərən mürəkkəb nitq hadisəsidir. Buraya səs tonunun alçalması və ya artması, nitqin tempi, hecaların uzun və qısa tələffüzü, tələffüzün güclü və ya zəifliyi, ifadələr, sözlər arasında pauzanın olub-olmaması, danışanın hadisəyə münasibəti və s. ünsürlər" daxildir. Sadə cümlənin sintaktik-semantik mövqeyinin güclənməsində intonasiyanın rolu böyükdür. İntonasiyanın köməyi ilə cümlədə ifadə olunan rəngarəng fikirlər, rəylər, təkliflər bir-birindən fərqlənir. Bir sözlə, intonasiya məqsədin tələbindən doğur. Məhz məqsəd və intonasiyasına görə də cümlənin dörd tipi vardır: nəqli cümlə, sual cümləsi, əmr cümləsi, nida cümləsi.

İntonasiyanın səciyyəvi cəhəti dil vahidinin (cümlənin) rəngarəng səs tempində, emosional-semantik çalarlıqda tələffüz edilməsidir.

Təbii ki, bu xüsusda vurğunun da mövqeyi və rolu danılmazdır. Şifahi ünsiyyətdə vurğu hər bir müstəqil sözün xarici əlamətlərindən biri kimi özünü göstərir. O, eyni formada olan sözlərin və qrammatik formanın mənaca bir-birindən fərqlənməsinə xidmət edir. Əks halda sözün mənası anlaşılmaz vəziyyət yaradar və cümlənin konstruktiv (bütöv) məna mühitini təzadlı rəngə bürüyər.

Nəzərə alaq ki, dildə sözün hər bir mənası ayrılıqda öz-özünə başqa sözlərin mənalarından təcrid olunmuş şəkildə deyil, qarşılıqlı əlaqə əsasında yaşayır. Söz müəyyən mənanın daşıyıcısıdır. Məna sözə müəyyən maddi işarə ilə möhkəmləndirilir. Sözün müəyyən mənaya malik olması o deməkdir ki, söz müəyyən məna sisteminə, müxtəlif məna tiplərinə, üslubi xüsusiyyətlərə malikdir.

"Sözün mənası dedikdə əşya və hadisələrin ümumi və fərqləndirici əlamətlərini əks etdirən məfhumun məzmunu, leksik-semantik variantlarının məcmusu düşünülməlidir" [3].

Vurğu da bu cəhətdən sözdə mənanı tənzimləyən, onu cümlənin sintaktik semantikasına uyğunlaşdıran vasitədir.

Canlı danışıqda sadə cümlə vasitəsilə fikrin, hissin, iradənin təzahür etməsinə nail olmaq üçün yuxarıda bəhs olunan vasitələrdən məqamında və yerində istifadə edilməsi prioritet məsələlərdəndir. Şübhəsiz, bu dediklərimiz sadə cümlənin sintaktik semantikasının şifahi nitqdə formalaşmasında rolu olan fonetik vasitələrdir.

Yazılı nitq üzrə isə vəziyyət bundan fərqlidir. Belə ki, şifahi nitqdə (canlı danışıqda) sadə cümlədə sintaktik-semantik mövqeyi gücləndirən amilləri yazılı nitqdə əsas fonetik vasitə olan durğu işarələri əvəz edir. Cümlənin müxtəlif intonasiyada tələffüzü yazılı nitqdə nöqtə, sual, tire, nida işarələri ilə ifadə olunur.

"Durğu işarələri fikrin aydın başa düşülməsində, yazının düzgün, ifadəli tələffüzündə çox mühüm və əhəmiyyətli qrafik vasitədir. Bunları yerində işlətmədikdə fikirdə dolaşıqlıqlar yaranır, şifahi nitqlə yazılı nitq arasında məzmun eyniliyi pozulur" [1].

Durğu işarəsinin düzgün qoyulmaması ilə cümlənin məzmunu tamamilə dəyişə bilər. Məsələn,

Yaxşı, filmə baxıram...

Bu cümlədə yaxşı modal sözündən sonra vergül qoyulmazsa, həmin söz (yaxşı) film sözünün təyini kimi başa düşülər və cümlənin sintaktik mənası (nəqli sintaktik, yəni məlumat vermə) dəyişmiş olar.

Durğu işarələrinin funksiyası yalnız sözləri, cümlələri bir-birindən qrammatik

cəhətdən fərqləndirməklə tamamlanmır. Yəni bunlar ( . , ; ? ! ... - ) təkcə orfoqrafik səciyyəyə malik deyil. Durğu işarələri hətta insan taleyinin idarə olunmasında da mühüm rol oynayır.

Məsələn, qədim rəvayətlərə əsasən hökmdar əsiri öldürtmək üçün yaxın adamlarından birinin vasitəsi ilə cəllada göndərir. Cəllada bir məktub da yazır. Həmin adam məktubu oxuyur. Məktubda yazılmışdır: “Əsiri çatan kimi güllələmək, olmaz gözləmək”. Hökmdarın adamı rəhimli olduğu üçün güllələmək sözündən sonrakı vergülü (,) silərək olmaz sözündən sonraya qoyur. Beləliklə, əsirin ölüm fərmanı məzmunca dəyişmiş olur.

Durğu işarələrinin yerinə yetirdiyi vəzifələrdən biri də cümlənin sintaktik emosional-ekspressiv rəngarəngliyini formalaşdırmaqdır. Bu üsulla subyektin hiss-həyəcanı, danışığındakı rəngarəng xüsusiyyətlər, psixoloji durumu, xarakteri təzahür edir. Hər bir durğu işarəsinin işlədilməsində bir məqsəd olur.

Şeiri təhlil süzgəcindən keçirdikdə obrazlılığın əsas vasitəsi olan məcazlıqla yanaşı, bədiiliyə orijinal rəng qatan, onun emosional-semantik variantlığını daha da mükəmməl səviyyəyə çatdıran vasitələrdən birinin istifadə edilmiş durğu işarələrinin olduğunu açıq şəkildə görürük.

Yuxarıda qoyulan problemin yanaşma tərzi və tədqiqata cəlb etdiyimiz məsələlərin rolu onu göstərir ki, sadə cümlənin sintaktik semantikası digər üsullarla yanaşı, həmçinin fonetik vasitələrin istifadə mövqeyi, işlənmə məqamları ilə də formalaşa bilir.

***Rəyçi: dos. B.Həsənli***

## İstifadə edilmiş ədəbiyyat

1. Budaqova Z. Azərbaycan dilində durğu işarələri. Bakı: Elm, 1977.
2. Cavadov Ə. Müasir Azərbaycan ədəbi dilində sintaktik vahidlərin sırası. Bakı: Elm, 1977.
3. Hüseynoğlu S. İfadəli oxunun əsasları. Bakı: ADPU-nun mətbəəsi. 2013.
4. Qurbanov A. Ümumi dilçilik (II cild). Bakı: Elm, 2011.

**А.Аббасов**

**Научность основное критерия**

**Резюме**

В простом предложении формирование семантико-синтаксических отношений происходит как фонетическими средствами, так и другими способами.

Повторение, аллитерация, ассонанс, ударение в разговорной речи (в устной речи) и знаки препинания в письменной речи выполняют одинаковую функцию.

**A.Abbasov**

**Scientific proof as the main criteria**

**Summary**

Besides other factors, the position of syntactic-semantics in a simple sentence is appeared by phonetic means. Reiteration, alliteration, assonance, stress have the same functions in a colloquial speech and punctuation has she same functions ma written language.



# AZƏRBAYCANDA ALİ PEDAQOJİ TƏHSİLİN MƏZMUNUNUN TƏKMİLLƏŞDİRİLMƏSİ İSTİQAMƏTLƏRİ

**Şiruyə Azadəliyeva,**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *təhsilin məzmunu, ali pedaqoji təhsil, tədris planı, pedaqoji kadr hazırlığı, ali təhsil müəssisəsi.*

***Ключевые слова:*** *содержание образования, высшее педагогическое образование, учебные планы, подготовка педагогических кадров, высшее учебное заведение.*

***Key words:*** *the content of education, higher teacher training, curriculum, training of teaching staff, higher education.*

Təhsilin məzmunu təlim prosesində tələbələrə öyrədilən bilik, bacarıq və vərdişlər sisteminin məcmusundan ibarətdir. Məzmun pedaqoji prosesin əsas komponentlərindən biri olmaqla bütün prosesin gedişinə həlledici təsir göstərir. Təhsil cəmiyyətin sosial-iqtisadi, elmi-mədəni həyatı ilə bilavasitə bağlı olduğundan o daim təkmilləşməlidir. XX əsrin 20-ci illərində Azərbaycanda pedaqoji sahədə təhsil alan tələbələrin sayı artdıqca, onların sosial və milli tərkibi dəyişdikcə təlimin məzmunu da təkmilləşdirilir və zənginləşdirilirdi. O dövrdə ali pedaqoji kadr hazırlığını həyata keçirən müəssisələrdə istifadə olunan tədris planları, proqramları və dərsliklərin təhlili bunu deməyə əsas verirdi. Təhsilin məzmunu təkmilləşdirildikcə təlimin metodları, pedaqoji təcrübənin keçirilməsi metodikası keyfiyyətcə dəyişir, məzunların hazırlıq səviyyəsi yüksəlir, professor-müəllim kadrlarının tərkibi yaxşılaşır. Təhsilin məzmununu əks etdirən sənədlərin təhlili ali pedaqoji təhsil müəssisələrinin ayrı-ayrı inkişaf mərhələlərində onlarda aparılan dəyişikliklər haqqında tam təsəvvür yaradır.

XX əsrin 20-ci illərində və 30-cu illərinin əvvəllərində pedaqoji ali təhsil müəssisələrinin tədris planları bir neçə dəfə dəyişdirilmişdir. Bu elə bir dövr idi ki, həm ümumtəhsil, həm də ali məktəblərin tədris planları tez-tez dəyişirdi. Azərbaycan SSR Xalq Maarif Komissarlığı Kollegiyası tərəfindən 13 iyun 1921-ci ildə təsdiq edilmiş ilk tədris planı üç ildə ali məktəbdə tədrisi nəzərdə tutulan fənləri və pedaqoji təcrübənin təşkilini özündə ehtiva edən mühüm dövlət sənədi idi. Azərbaycan SSR Xalq Maarif Komissarlığının kollegiyası tərəfindən 14 sentyabr 1924-cü ildə Ali Pedaqoji İnstitut üçün yeni tədris planı təsdiq edildi. Bu tədris planı əvvəlkilərdən fərqlənirdi. Əvvəlki tədris planları ilə müqayisədə müsbət məziyyətlərinə görə seçilən yeni tədris planları daha keyfiyyətli müəllim kadrları hazırlığını nəzərdə tuturdu. Gələcək müəllimlərin elmi-metodik, ixtisas hazırlığı ilə yanaşı siyasi mövqeyinin forma-

laşmasına xüsusi diqqət yetirilirdi. Tədris planlarının təkmilləşdirilmiş variantı respublikanın orta məktəbləri üçün yüksək təhsilli və praktiki cəhətdən yaxşı hazırlanmış pedaqoji kadrların geniş hazırlığının əsasını qoydu.

Universitetin pedaqoji fakültəsinin tədris planının təhlili göstərir ki, o, digər tədris planları ilə müqayisədə bir sıra üstünlüklərə malik idi. Belə ki, universitetin pedaqoji fakültəsinin tədris planı respublikanın iqtisadi və mədəni tələbatları ciddi nəzərə alınmaqla tərtib edilmişdi.

Tədris planında məşğələlər dekadalar üzrə bölünmüşdü. Ümumtəhsil fənləri – rus dili, bədən tərbiyəsi, hərbi təlim dekadada 8 saat təşkil edirdi ki, bu da ümumi saatların 16,6% -ni təşkil edirdi. İctimai-siyasi fənlər (təşkilati-metodiki və ictimai-tarixi fakültələr istisna olunmaqla) hər dekadada 10-12 saat idi, bu da ümumi saatların 20-22%-ni təşkil edirdi. Pedaqoji fənlərə gəldikdə isə hər fakültə üzrə dekadada 12 saat nəzərdə tutulurdu, bunlardan 6-8 saatı praktik məşğələlərə ayrılırdı. Bu tədris planlarında pedaqoji fənlər 20-22% təşkil edirdi. Beləliklə, hər dekadada 48-50 saatdan 28-30 saatı ümumtəhsil, pedaqoji və siyasi fənlərə, 18-20 saat xüsusi fənlərə (təşkilati-metodiki fakültədən başqa) ayrılırdı. Bu da ümumi tədris yükünün 37-40%-ni təşkil edirdi. Tədris planında pedaqoji-psixoloji fənlərə ayrılan saatlar gələcək müəllimlərin peşə hazırlığı üçün tam kifayət edirdi.

Ali pedaqoji institutun tədris planının müsbət cəhəti nəzəriyyə ilə təcrübənin sıx əlaqələndirilməsi ilə bağlı idi. Demək olar ki, bütün fakültələrdə pedaqogika fasiləsiz pedaqoji təcrübə və ixtisasın tədrisi metodikası ilə vəhdətdə öyrənilirdi.

Tədris planında pedaqoji və siyasi fənlərin xüsusi çəkisi nisbətən yüksək idi. Bütün fakültələrdə tələbələr eyni səviyyədə həm pedaqoji, həm də ictimai-siyasi fənləri öyrənirdilər.

1940-1950-ci illərdə Azərbaycanda ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi prosesi davam etdirildi. 1936/1937-ci dərs ilinin tədris planlarının əsasını təşkil edən prinsiplər sonrakı illərdə də saxlanıldı, universitetin tədris planlarında pedaqoji fənlərin tədrisi genişləndirildi. Tədris planlarında çoxfənlilik kəskin şəkildə ixtisar olundu.

1949/1950-ci tədris illərində universitetlərin tədris planlarında, 1951/1952-ci tədris illərində isə pedaqoji ali məktəblərin tədris planlarında əsaslı dəyişikliklər edildi. Universitetin 1949/1950-ci tədris illərindəki tədris planında tələbələrin peşə-pedaqoji hazırlığı zəif əks olunmuşdu. Müharibəyə qədər və müharibə ərəfəsində olduğu illə müqayisədə tədris planında pedaqoji fənlərə ayrılan saatların miqdarı kəskin şəkildə azaldılmışdı.

1950/1951-ci dərs ilinin stabil tədris planı ümumtəhsil silsiləli bəzi fənlərin tədris planından çıxarılması hesabına müəllimlərin praktiki hazırlığını müəyyən qədər gücləndirdi. Lakin bu tədris planlarında tarix və öyrənilən dilin coğrafiyası fakültativ fənlərə çevrildi, ümumi ədəbiyyat, rus və sovet ədəbiyyatı fənləri isə tamamilə çıxarıldı. Bunu isə müsbət hal kimi qiymətləndirmək olmaz. Sonrakı illərdə tədris planında prinsipial xarakter daşımayan cüzi dəyişikliklər edildi.

Respublikanın pedaqoji ali təhsil müəssisələrinin tədris planlarına 29 may 1954-cü ildə qəbul edilmiş "Respublikanın pedaqoji ali təhsil müəssisələrində müəllimlərin peşə hazırlığının vəziyyəti və yaxşılaşdırılması haqqında" qərar əsasında köklü

dəyişikliklər edildi.

Qərarda göstərilir ki, tədris işinin qeyri-qənaətbəxş təşkili nəticəsində respublikanın pedaqoji ali təhsil müəssisələri öz məzunlarına məktəbdə müstəqil işləmək üçün əsaslı peşə bilikləri verə bilmirlər.

Daha sonralar tədris planlarının daha da yaxşılaşdırılması və təkmilləşdirilməsinə "Ali və orta ixtisas təhsilli mütəxəssislərin hazırlanmasının, bölünməsinin və istifadə olunmasının yaxşılaşdırılması haqqında" qərar (30 avqust 1954-cü il) xeyli kömək etdi. Bu qərarda ali təhsil müəssisələrinin tədris planlarının icbari tədris məşğələləri ilə yüklənməsi, eyni materialların müxtəlif fənlərdə təkrar olunması və həmçinin istehsalat təcrübəsinin təşkilinin qeyri-təkmil olması göstərilirdi.

Partiya və hökumətin qərarlarındakı bu vəzifələri nəzərə alaraq SSRİ Ali Təhsil Nazirliyi ölkənin pedaqoji ali təhsil müəssisələri üçün yeni tədris planları təsdiq etdi. Bu tədris planları respublikanın pedaqoji ali təhsil müəssisələrinin tədris planlarının əsasını təşkil etdi. Bu tədris planları SSRİ Ali Təhsil Nazirliyi tərəfindən 15 oktyabr 1954-cü ildə təsdiq edildi.

Pedaqoji ali təhsil müəssisələrinin 1954-cü il tədris planları 1951-ci ildəki tədris planlarından aşağıdakı xüsusiyyətlərinə görə fərqlənirdi: bəzi ixtisaslar üzrə (tarix, coğrafiya) öyrənilən fənlərin miqdarı azaldılmadığı halda, Azərbaycan dili və ədəbiyyatı ixtisasında fənlərin sayı 41-dən 25-ə, təbiətşünaslıq və kimya fakültəsində 33-dən 29-a endirilmişdi. Beləliklə, Pedaqoji İnstitut üzrə fənlərin ümumi sayı 28 fənn azaldılmışdı ki, bu da ümumi fənlərin 13% -ni təşkil edirdi.

Bununla yanaşı qeyd etmək lazımdır ki, pedaqoji, tədris və istehsalat təcrübəsinə ayrılan saatların ümumi miqdarı artırılmışdı. Bütün ixtisaslar üzrə belə artım təqribən 1000 saat təşkil edirdi ki, bu da 1954-cü il tədris planlarının vacib və müsbət cəhətlərindən idi.

Yeni tədris planları fizika-riyaziyyat fakültəsində bir sıra texniki fənlərin (tədris emalatxanalarında praktikum, rəsmxətt, tədris kinosunun metodikası, maşınşünaslığın əsasları, istilik texnikası, elektrotexnika, radiotexnika və s.) öyrənilməsinə böyük diqqət yetirirdi.

1954-cü ilin tədris planları da nöqsanlardan xali deyildi. Əvvəlki tədris planlarından fərqli olaraq burada pedaqoji fənlər üzrə tələbələrin nəzəri hazırlığına xidmət edən fənlər xeyli ixtisar edilmişdi: psixologiya kursu 17 saat, pedaqogika tarixi 26 saat, məktəb gigiyenası 18 saat ixtisar edilmişdi.

Məqbul və imtahanların sayında ciddi dəyişikliklər baş verməmişdi. Pedaqoji ali təhsil müəssisələrinin 1954/1955-ci tədris ilinin planlarında nöqsanların olmasına baxmayaraq onların gələcək müəllimlərin peşə-pedaqoji hazırlığı sahəsində tələblərin ödənilməsi işində universitetin tədris planları ilə müqayisədə böyük üstünlüyə malik idi. Pedaqoji ali təhsil müəssisələrinin 1954/1955-ci dərs ilinin tədris planlarında pedaqoji fənlərə xeyli yer ayrılmışdı. Bunu universitetlərin o vaxtkı tədris planları haqqında demək olmaz. Bundan əlavə, universitetlərin tədris planlarında pedaqoji fənlərin sayı hər fakültədə fərqli idi. Pedaqoji ali təhsil müəssisələrinin tədris planlarında pedaqoji fənlərə ayrılan saatların miqdarı universitet tədris planlarındakına nisbətən 2-3 dəfə çox idi. O dövrdə universitetin məzunlarının təqribən 80%-nin orta məktəbdə müəllim işlədiyini nəzərə alsaq, bu halı normal hesab etmək olmaz. 1957/1958-ci dərs ilində ali

pedaqoji təhsil müəssisələrinin tədris planlarında ciddi dəyişikliklər edildi. 1954-cü ilin tədris planlarından fərqli olaraq pedaqoji ali təhsil müəssisələrinin 1957/1958-ci dərs ilindəki tədris planlarından məktəb gigiyenasına ayrılan saatların miqdarı 36 saata qədər artırıldı.

60-cı illərdə pedaqoji ali təhsil müəssisələrində yüksək ixtisaslı müəllim kadrlarının hazırlanması istiqamətində xeyli səmərəli işlər həyata keçirildi. "Məktəbin həyatla əlaqəsinin möhkəmləndirilməsi və SSRİ-də xalq təhsili sisteminin daha da inkişaf etdirilməsi haqqında" qanuna müvafiq olaraq respublikanın pedaqoji ali təhsil müəssisələrinin tədris planları və proqramlarında müəyyən dəyişikliklər edildi.

Məktəb haqqında qanunda nəzərdə tutulanları həyata keçirmək üçün tədris planlarını daha da təkmilləşdirmək məqsədilə onlara yenidən baxılması vacib idi. Həm də 1957/1958-ci illərin tədris planlarında tədris işinin təşkilində və müəllimlərin praktiki hazırlığının məzmununda müəyyən nöqsanlar var idi. Yeni tədris planlarına əsasən ictimai və pedaqoji-psixoloji fənlər əvvəlki həcmdə qaldı. Pedaqoji fənlərin tədrisi təkmilləşdirildi, xüsusilə psixologiya kursunda yaş psixologiyasının öyrənilməsi nəzərdə tutuldu.

Geniş profilli müəllim hazırlığı ideyası özünü doğrultmurdu. Tələbələr hər iki ixtisas üzrə yaxşı hazırlaşa bilmirdilər. İxtisasın hər ikisini yüksək səviyyədə öyrənmək çətinlik törədirdi. Digər tərəfdən pedaqoji ali təhsil müəssisələrində təlim müddətinin artırılması da müəllim kadrlarına olan ehtiyac baxımından özünü doğrultmadı. Bununla əlaqədar Sov. İKP MK və Nazirlər Sovetinin 9 may 1963-cü il qərarının həyata keçirilməsi ilə əlaqədar olaraq 1963/1964-cü tədris ilində pedaqoji ali təhsil müəssisələrinin tədris planlarında yeni dəyişikliklər edildi. Pedaqoji ali təhsil müəssisələrində müəllimlərin bir ixtisas üzrə hazırlanmasının yeni tədris planları təsdiq edildi.

ADU-nun 1959-cu ildəki yeni tədris planı əvvəlki tədris planlarından xeyli fərqlənirdi. Bu tədris planlarında təlimin təcrübə ilə əlaqələndirilməsi xeyli gücləndirilmişdi. Bir çox fakültələrdə (şərq, fizika, kimya, biologiya) mühazirə saatları ilə müqayisədə praktik saatların miqdarı xeyli artırılmışdı. Filologiya, tarix, coğrafiya və riyaziyyat fakültələrində nəzəri və praktiki məşğələlər arasındakı saatların nisbəti o qədər də fərqlənmirdi.

Universitetin yeni tədris planları onunla fərqlənirdi ki, onlarda pedaqogika, digər fənlərin metodikası və pedaqoji təcrübənin keçirilməsi genişləndirilmişdi.

1964-cü ildə universitetin tədris planlarına yenidən baxıldı. Yeni tədris planı 1959-cu ilin tədris planlarından bəzi fakültələrdə pedaqoji fənlərin ixtisar olunması ilə fərqlənirdi. Universitetdə pedaqoji fənlərə ayrılan saatların ümumi həcmi artırılsa da, pedaqoji institutlarla müqayisədə bu saatların miqdarı xeyli az idi. Universitetin məzunlarının 80%-dən çoxunun pedaqoji sahəyə işə göndərilməsini nəzərə alsaq, bu həmin saatların azlığının müəllim kadrları hazırlığına mənfi təsir göstərməsi qənaətinə gəlməyə imkan verir. Həmin dövrdə pedaqoji institutların proqramlarında da dəyişikliklər edildi, yerli əhəmiyyət kəsb edən fənlərin yeni proqramları yaradıldı. Bu müddət ərzində pedaqogikadan 3 proqram nəşr edildi. 1960-cı ilin əvvəlində SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyi tərəfindən müttəfiq respublikaların pedaqoji institutla-

rına pedaqogikadan tədris proqramlarının layihəsi göndərildi. Proqramlara məktəbin həyatla və əməklə əlaqəsinə dair yeni məsələlər daxil edildi. Pedaqogika üzrə mövcud proqram gənc nəslin təhsil-tərbiyəsi ilə bağlı artan tələbatı ödəmirdi.

1965-ci ildə SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyi və RSFSR Maarif Nazirliyi tərəfindən pedaqoji institutlar üçün yeni pedaqogika proqramları nəşr edildi. Bu proqramda yenə də tərbiyə nəzəriyyəsi təlim nəzəriyyəsindən əvvəl verilmişdi. Pedaqoji proseslərin psixoloji əsaslandırılmasına diqqət yetirilmiş, təlim və tərbiyənin prinsipləri və metodlarının təsnifatında müəyyən dəyişikliklər edilmişdi. Universitet tələbələri üçün pedaqogika proqramı qismində SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyi tərəfindən 5 noyabr 1960-cı ildə buraxılan proqramdan istifadə edilirdi. Pedaqogika kafedralarının iradları nəzərə alınmaqla həmin proqram 1965-ci ildə dəyişdirildi və nəşr olundu.

60-cı illərin sonunda bütün ali pedaqoji məktəblər üçün yeni tədris planları tərtib edildi. Tədris planlarının layihəsi keçmiş SSRİ ali pedaqoji məktəblərinin pedaqogika və psixologiya kafedralarının müdirlərinin iştirakı ilə müzakirə olundu. Tədris planları və proqramlarının tərtibində gələcək müəllimlərin nəzəri və praktiki hazırlığının təkmilləşdirilməsi, dünyagörüşlərinin genişləndirilməsi əsas götürülürdü.

70-ci illərin əvvəllərində pedaqoji institutlarda yeni tədris planları və proqramları tətbiq edildi. Əsas fənlərlə yanaşı xüsusi kursların, seminarların, fakültativlərin də aparılması planlaşdırıldı. Az sonra ali pedaqoji məktəblər üçün nəzərdə tutulan tədris planları ciddi tənqid olundu. 1974-cü ildə SSRİ pedaqoji institutların pedaqogika və psixologiya kafedra müdirlərinin müşavirəsində "Pedaqogikaya giriş" kursunun tədrisi qeyri-qənaətbəxş hesab edildi. Çünki kursun tədrisində pedaqogikanın fundamental metodoloji məsələlərinin şərhi nəzərdə tutulurdu ki, bu da tələbələrdən yüksək fəlsəfi və pedaqoji hazırlıq tələb edirdi. Digər tərəfdən isə həmin mövzular "Pedaqogika"da (II kursda) yenidən öyrənilirdi. Öyrədilməsi nəzərdə tutulan mövzular arasında rabitəsizlik kursun nəzəri-metodoloji əhəmiyyətini, elmi səviyyəsini azaldırdı. Bu səbəbdən də xüsusi kursun məzmunu ciddi dəyişdirildi və 1975-ci ildən "Müəllimlik ixtisasına giriş" adı ilə tədris planına daxil oldu. Bu kursun tədrisində məqsəd tələbələri pedaqoji peşənin sosial əhəmiyyəti, mahiyyəti, müəllimlik işinin xüsusiyyətləri, keyfiyyətləri və pedaqoji peşə hazırlığı sistemi ilə tanış etməkdən ibarət idi.

20-ci illərdən başlayaraq 90-cı illərin əvvəllərinə kimi pedaqogika tarixinə aid proqram, əsasən, rus dilindən tərcümə edilmişdir. Moskvada hazırlanan tədris planları və proqramları bütün ali pedaqoji məktəblər üçün eyni idi. Respublikaların milli xüsusiyyətləri, təhsil və tərbiyə ənənələri nəzərə alınmadan tədris olunurdu.

Qeyd etmək lazımdır ki, XX əsrin 20-80-ci illərində Azərbaycanda ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi istiqamətlərinin öyrənilməsi mühüm əhəmiyyət kəsb edir. O da qeyd edilməlidir ki, XX əsrin 20-80-ci illərində Azərbaycanda ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi istiqamətləri müqayisəli şəkildə öyrənilməli, tədqiq və təhlil olunmalıdır. Çünki XX əsrin 20-80-ci illərində Azərbaycanda ali pedaqoji təhsilin məzmununun

təkmilləşdirilməsi istiqamətlərinin öyrənilməsi həm nəzəri, həm də praktik əhəmiyyət kəsb edir.

***Rəyçi: prof. F.Rüstəmov***

## İstifadə edilmiş ədəbiyyat

1. Ali Pedaqoji İnstitutun salnaməsi. 1924, №1.
2. Atakişiyev A. Bakı Dövlət Universitetinin tarixi. Bakı: Bakı Universiteti, 1991.
3. Azərbaycan Dövlət Pedaqoji Universiteti (1921-2006). Bakı: Nurlan, 2006.
4. Əliyev H. Təhsil millətin gələcəyidir. Bakı: Təhsil, 2002.
5. Əmrahov M., Salahov M., Əsədov N. Azərbaycanda ali məktəb quruculuğu, ali pedaqoji təhsilin təşkili və inkişafı tarixinin oçerkləri (1917-1941-ci illər). Bakı: Mütərcim, 2007.
6. Rüstəmov F. Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri (1920-1991). Bakı: Bakı Universiteti, 1998.
7. Salahov M. Azərbaycanda ali təhsilin inkişaf tarixi (1920-1941-ci illər) Namizədlik disser. Bakı, 1967.
8. Алиев К. и др. Развитие высшей школы в Советском Азербайджане. Под общей ред. Алиева К. Баку: Маариф, 1984.
9. Мехтизаде М. Очерки истории советской школы в Азербайджане. М.: Изд-во АПН РСФСР, 1962.
10. Рзаев А. Основные этапы развития высшего педагогического образования в Азербайджанской ССР. Дис. докт. пед. наук. Тбилиси, 1968.

**Ш.Азадалиева**

**Направления улучшение содержания высшего педагогического образование в Азербайджане**

**Резюме**

В статье рассматриваются направления усовершенствования учебных планов в высших педагогических образовательных учреждениях в Азербайджане в 20-80-е годы XX века. Обосновывается, что содержание образования адекватно изменилось из-за часто менявшегося общественно-политического положения в исследуемом периоде. Были оформлены новые учебные планы, программы, подготовлены учебники. В статье сравнительно анализированы учебные планы АГПУ и БГУ.

**Sh.Azadalieva**

**Directions to improve the content of higher pedagogical education in Azerbaijan**

**Summary**

The article deals with the direction of curriculum improvement in the higher pedagogical educational institutions in Azerbaijan in 20-80 years of the twentieth century. It is proved that the content of education adequately changed due often to change the socio-political situation in the studied period. New curricula have been issued, the program prepared textbooks. The paper comparatively analyzed curricula ASPU and BSU.

***Arxivimizdən***

# HAFİZƏNİN TƏRBİYƏ EDİLMƏSİ

**Əhməd Zəkuzadə,**
***pedaqoji elmlər namizədi, dosent***

Yaxşı, möhkəm hafizəyə sahib olmaq insan üçün bir xoşbaxtlıqdır.

Hafizə sayəsində insan öz şüurunda keçmişi əks etdirir və keçmişin təcrübələrindən özünün hal-hazırdakı fəaliyyəti üçün istifadə edir. Buna görə də yaxşı hafizə sayəsində insan öz həyatında müxtəlif səhvlərin buraxılmasının qarşısını ala bilir. Hafizənin zəifliyi isə keçmiş təcrübələrin unudulmasına, həyatda çoxlu səhvlərin buraxılmasına və beləliklə də insanın öz həyatında müxtəlif peşmanlıqlara məruz qalmasına səbəb olur.

İnsanın qavrayışı, yaradılışı və fikirləşməsi kimi yüksək dərəcəli müxtəlif psixi fəaliyyətləri hafizəyə əsaslanır və hafizə sayəsində saxlanmış təsəvvür və fikirlərlə qidalanır. Buna görə həmin psixi fəaliyyətlərin müvəffəqiyyətli olması hafizənin möhkəmliyi ilə sıx surətdə əlaqədardır.

Yaxşı hafizənin, xüsusən, pedaqoji əhəmiyyəti çox böyükdür. Uşağın məktəbdəki müvəffəqiyyəti yalnız onun hafizəsinin yaxşı və möhkəm olmasından asılı deyildir. Lakin möhkəm hafizəyə sahib olan uşaq təlim materialını daha tez öyrənir, daha möhkəm yadda saxlayır və daha yaxşı xatırlaya bilir. Beləliklə, hafizənin möhkəm və mükəmməlliyi uşağın dərsdəki müvəffəqiyyətində böyük rol oynayır. Buna görədir ki, hər kəs öz hafizəsinin möhkəm olmasını arzu edir və onun möhkəm olmasına çalışır.

Bəs hafizəni tərbiyə etmək, əgər zəifsə onu qüvvətləndirmək mümkündürmü? Mümkün isə onu hansı yolla qüvvətləndirmək olar? Bu məqalədə bizi maraqlandıran da elə bu məsələdir. Bu barədə müxtəlif psixoloqların rəyləri vardır. Bəzi burjua psixoloqları (Şarko, Semon, Qerinq, Uniçi və s.) hafizənin möhkəmliyini yalnız irsiyyətə və üzvi şəraitə bağlayır və buna görə hafizənin tərbiyə edilməsinin mümkün olmadığını iddia edirlər. Həmin psixoloqlara görə bir şəxsin hafizəsinin zəifliyi və yaxud mükəmməlliyi müxtəlif irsi və üzvi səbəblərdən əmələ gəldiyindən onu tərbiyə etmək mümkün deyildir. Guya hər şəxsin hafizəsinin həcmi və qüvvəti onun irsi və üzvi şəraiti ilə təmin olunur, deməli, insanın hafizəsini tərbiyə ilə deyil, ancaq müalicə yolu ilə, üzvi şəraiti dəyişdirmək yolu ilə yaxşılaşdırmaq mümkündür.

Doğrudur, hafizənin möhkəm olmasında üzvi şəraitin əhəmiyyətini inkar etmək olmaz. Hafizənin möhkəm olması üçün sinir sistemasının və xüsusən beynin yaxşı inkişaf etməsi və yaxşı vəziyyətdə olması lazımdır. Hafizəni yadda saxlamaq, yada salmaq və tanımaq kimi proseslər beynin funksiyalarıdır. Buna görə həmin proseslərin yaxşı keyfiyyətdə olması üçün beynin normal inkişaf etməsi və normal işləyə bilməsi lazımdır, beynin normal işi üçün isə ümumiyyətlə,

bədənin və bədəndə gedən həyati proseslərin normal olması lazım gəlir. Lakin, bütün bunlara baxmayaraq, hafizənin möhkəm və mükəmməlliyini yalnız üzvi şəraitə bağlayan və beləliklə də, onun tərbiyə edilməsini imkan xaricində hesab edən fikir bir çox faktlarla rədd edilən yanlış və fatalist fikirdir. Həqiqətdə isə hafizəni tərbiyə etmək və onun qüvvət və məhsuldarlığını yüksəltmək mümkündür.

Burjua psixoloqlarından Vilyam Cemsin nəzəriyyəsi də hafizənin tərbiyə edilməsinin mümkün olmadığını irəli sürən nəzəriyyəyə qismən yaxındır.

Cemsə görə hafizə insanda ümumi və elementar bir qabiliyyət olaraq mövcud deyildir. Cems vahid və ümumi hafizəni inkar edərək ayrı-ayrı xüsusi hafizələrin varlığını irəli sürür. Belə ki, Cemsə görə eyni bir cinsdən olan və bir-biri ilə əlaqədar olan materiala aid hafizə başqa bir cins materiala aid hafizədən fərqlidir, beləliklə, insanda bir deyil, bir çox hafizələr vardır. Bundan başqa Cems hafizəni assosasiyaya bağlayır və onun möhkəmliyini çoxlu və möhkəm assosasiya əlaqələrinin əmələ gəlməsində görür. Cems, ümumiyyətlə, hafizəni qüvvətləndirmənin mümkün olmadığını, bir sistema materiala aid hafizənin, ikinci bir sistema materiala aid hafizədən fərqli olduğunu, buna görə də bir sistema materiala aid hafizənin qüvvətlənməsi ilə, başqa bir sistemə aid materiala aid hafizənin qüvvətlənmədiyini irəli sürür. Demək ki, Cemsə görə hafizənin ancaq müəyyən və eyni bir sistemaya material haqqında mümarisə etdirilməsi və qüvvətləndirilməsi mümkündür. Cems deyir ki, “ümumi, yaxud da elementar, hafizə qabiliyyətini yaxşılaşdırmaq mümkün deyildir, biz öz hafizəmizi ancaq müəyyən sistema haqqında yaxşılaşdıra bilirik”.

Hafizənin ümumi və elementar bir qabiliyyət kimi inkarını və habelə müxtəlif hafizələrin olduğunu Meyman da irəli sürür. Lakin Meyman bir sahədə hafizənin mümarisə edilməsi ilə başqa sahədə də onun mümarisə olunmasını və beləliklə də, ümumiyyətlə və bütün sahələrdə hafizənin yaxşılaşdırılmasının mümkün olduğunu qəbul edir. Meyman deyir ki, “Hafizənin mükəmməlləşdirilməsinə gəlincə biz deyə bilirik ki, hafizə hədsiz inkişaf edə bilər”.

Bəzi psixoloqlar və o cümlədən də M.M.Rubenşteyn hafizənin tərbiyə və inkişafını istedadla əlaqələndirməyə çalışır və istedadlı insanlarda onun tərbiyə vasitəsi ilə inkişaf etdirilməsi mümkün isə də, istedadsız şəxslərdə onun tərbiyəsinin bir nəticə vermədiyini irəli sürürlər. Rubenşteyn deyir ki, “Hafizə məqsədə uyğun tərbiyə sayəsində inkişaf edir, lakin bu cəhətdən istedadsız insan böyük bir müvəffəqiyyətə ümid bağlamamalıdır”.

Tərbiyənin fayda və müvəffəqiyyətini ancaq istedadlılara məxsus hesab edən və istedadı tərbiyədən qabaq və müstəqil hesab edən həmin fikir də yanlış və mürtəce xarakterli bir fikirdir. Tərbiyə istedaddan deyil, əksinə olaraq istedad tərbiyədən asılıdır. Bir insanın istedadı onun tərbiyəsindən qabaq və müstəqil olaraq deyil, onun tərbiyəsindən və onun inkişafının konkret şəraitindən asılı olaraq inkişaf edə bilər. Bundan başqa, möhkəm hafizə yalnız istedadlılara məxsus deyildir, istedadca zəif olan bəzi şəxslərdə də kəskin və möhkəm hafizəyə təsadüf edilir.

Hafizənin tərbiyəsini tamamən,

***3**

yaxud da qismən inkar edən nəzəriyyələrin əksinə olaraq onun tərbiyəsini oyuncaq halına salan və onun inkişafını mexanikləşdirən nəzəriyyələr də vardır. Bu axırıncı nəzəriyyə tərəfdarlarına görə hafizəni qüvvətləndirmək çox asandır, onu müxtəlif süni vasitələrlə qüvvətləndirmək olar ki, bu vasitələrə "mnemonikalar" deyilir. Mnemonikanın əhəmiyyəti ondan ibarətdir ki, yadda qalmayan və yaxud yada salınması çətin olan şeyləri yada salmaq və xatırlatmağa kömək edir. Aydın bir şeydir ki, fikirlərə və mənalı kəlmələrə nisbətən say, rəqəm yadda çətin qalır. Lakin biz hər hansı bir sayı, rəqəmi və sairəni müəyyən bir hadisə ilə, yaxud da müəyyən kəlmələrlə əlaqələndirməklə onu çox asan surətdə xatırlaya bilirik.

Məsələn 26 nömrəli bir evi yadda saxlamaq üçün 26-lar meydançasını xatırlamaq kifayətdir.

Hafizəni qüvvətləndirmək və xatırlama işini asanlaşdırmaq üçün müxtəlif psixoloqlar tərəfindən təklif edilmiş müxtəlif mnemonikalar vardır ki, bunların arasında professor Faynşteynin və professor Pelmanın mnemonikaları xüsusilə məşhurdur. Biz burada həmin mnemonikaların qiymət və əhəmiyyəti üzərində dayanacaq deyilik, ancaq qeyd etməliyik ki, hafizənin tərbiyə və inkişafı üçün yuxarıda zikr edilmiş professorlar tərəfindən təklif edilən mnemonikaların heç bir əhəmiyyəti yoxdur.

Hafizəni belə asanlıqla və xüsusən mnemonik yollarla yaxşılaşdırmaq mümkün deyildir. Mnemonikalardan tək-tük şeyləri yada salmaq üçün istifadə etmək olursa da onlar, ümumiyyətlə, hafizəni yaxşılaşdıra bilməzlər.

Hafizəni inkişaf etdirmək üçün onu sistematik və məqsədə uyğun bir şəkildə tərbiyə etmək, onun maddi, üzvi şəraitini yaxşılaşdırmaq və məhsuldarlığı üçün pedaqoji tədbirlərdən istifadə etmək lazımdır.

Hafizənin həyati əhəmiyyəti çox böyükdür, uşağın məktəbdəki müvəffəqiyyəti də onun hafizəsinin möhkəmliyi ilə əlaqədardır. Buna görə hafizəni inkişaf etdirmək və genişləndirmək lazım gəlir. Lenin yoldaş Gənclər İttifaqlarının vəzifələri haqqında söylədiyi məşhur nitqində demişdir ki: "Bizə əzbərləmə lazım deyil, lakin biz hər bir oxuyanın zehnini əsas faktları bilməklə inkişaf etdirməli və təkmilləşdirməliyik". Lenin yoldaşın bu göstərişindən anlaşılır ki, insanın hafizəsi tərbiyə-təlim prosesində, obyektiv aləmi öyrənmə prosesində inkişaf etdirilə bilər. Buna görə məktəbimiz qarşısında duran əsas vəzifələrdən biri də şagirdlərin hafizələrini tərbiyə etməkdən ibarətdir.

Oktyabr inqilabından əvvəlki köhnə məktəb əzbərçilik məktəbi idi və həmin məktəb tərbiyə-təlim işini ən çox mexanik hafizə ilə bağlayırdı. Köhnə məktəb Lenin yoldaşın göstərdiyi kimi, şagirdlərə lüzumsuz, mənasız ölü bilikləri mexaniki bir şəkildə əzbərlətdirirdi.

Vaxtilə burjuaziya ölkələrində əmələ gəlmiş və oradan bizə - Sovetlər İttifaqına keçmiş və bizdə yayılmış olan pedalogiya hafizənin əhəmiyyətini inkar edirdi. Pedalogiya tərbiyə-təlimi qiymətdən saldığı kimi, hafizəni də qiymətdən salır və beləliklə də məktəblərimizə, tərbiyə-təlim işlərimizə böyük zərər verirdi. Halbuki hafizə tərbiyə-təlim prosesində böyük rol oynayan bir amildir. Buna görə Lenin yoldaşın göstərişi əsasında hər bir şagirdin hafizəsini tərbiyə ilə inkişaf etdirmək və təkmilləşdirmək

lazımdır.

Hafizənin tərbiyəsini, vasitəsiz və vasitəli olmaq üzrə, başlıca iki qismə ayırmaq mümkündür. Hafizənin vasitəsiz tərbiyəsi onu mümarisə etmək, sistematik və məqsədə uyğun işlətmək sayəsində olur. Məlumdur ki, hər hansı bir funksiya işdə inkişaf edir, fəaliyyətdən qalan funksiya isə kütləşir...

Bəzi psixoloqlar və o cümlədən amerikalı Qinçi, hafizənin inkişafı üçün mümarisənin əhəmiyyətini şübhə altına almağa çalışırlar. Halbuki mümarisə sayəsində hafizənin inkişafı bir çox faktlarla isbat edilmişdir. Hələ qədim Roma pedaqoqu Kvintilian hafizə inkişafının mümarisə ilə əlaqəsini qeyd edərək onun inkişafı üçün hər gün bir neçə parça şeirin əzbərlənməsini təklif etmişdir. Tarixi məlumatdan anlaşılır ki, keçmiş zamanlarda kitab, kağız və sair memotexnik vəsait az olduğundan bəzi şairlər, ədiblər on minlərcə beyt şeiri və başqa ədəbi parçaları əzbərləməyə məcbur olurdular. Buna görə onlarda əzbərləmə qabiliyyəti çox inkişaf etmişdi.

Bir çox psixoloqların və o cümlədən Ebbinqauzun, Meymanın, Hartmanın, Ebertin və Neçaevin təcrübələri də hafizənin mümarisə vasitəsilə möhkəmləşməsini göstərir. Meyman: “Doktor Ebertlə mən hafizənin ümumi mümarisə məsələsini təcrübi tədqiqatdan keçirdik və aşkar müsbət nəticəyə gəldik” deyə qeyd edir. Meyman mənasız sözləri əzbərlətmək vasitəsilə hafizəni mümarisə etdirmiş və bununla hafizəni qüvvətini artırmışdır.

Meyman müxtəlif təcrübələrə əsaslanaraq deyir ki: “Əgər yaşlı adamın hafizəsinin qüvvəti mümarisə sayəsində iki dəfə artırsa, mümarisə sayəsində uşaq hafizəsi qüvvətinin daha çox artmasını gözləmək olar”.

Məlum olduğu üzrə vərdişin keçmə xassəsi vardır, belə ki, bir işə aid əmələ gəlmiş vərdiş, ona yaxın başqa bir işə də keçir.

Buna görə mümarisə nəticəsində bir materialı yadda saxlamaq vərdişini qazanan insan, ona yaxın başqa bir materialı da asanlıqla yadda saxlamağa başlar.

Hafizə sadə bir funksiya deyildir, müxtəlif proseslərin mürəkkəb sistemasıdır. Bundan başqa hafizədə diqqət, assosiasiya və təfəkkür kimi müxtəlif psixi proseslər iştirak edir ki, hafizənin məhsuldarlığında bunların rolu böyükdür. Hafizəni mümarisə etmək sayəsində, onda iştirak edən həmin psixi funksiyalar da mümarisə olunur. Demək ki, yadda saxlama və yada salma proseslərinin mümarisəsi həmin proseslərdə iştirak edən müxtəlif psixi proseslərin mümarisə olunmasına səbəb olur. Hafizənin mümarisəsi sayəsində xüusən diqqətin sabitliyi, həcmi və sürəti artır ki, bu da hafizənin məhsuldarlığına çox kömək edir. Aşağıda görəcəyik ki, hafizənin möhkəmliyi üçün diqqətin əhəmiyyəti çox böyükdür.

Burada qeyd etmək lazım gəlir ki, hafizənin mümarisə edilməsi məqsədə uyğun və düşüncəli olmalıdır.

Hafizənin mümarisəsi yaş və bilik səviyyəsinə mütənasib, mötədil, sistematik olmalı və proqressiv bir şəkildə artmalıdır. Hafizəni mümarisə edərkən diqqətə də alışmaq lazım gəlir: çünki diqqətsiz hafizənin mümarisəsi yaxşı nəticə verməz. Hafizədə diqqətin işini asanlaşdırmaq üçün hiss, maraq və təxəyyülün köməyinə müraciət etmək lazımdır.

Hafizəni məktəb yaşında mümarisə etdirən əsas vasitə məktəbdə gedən təlim əməyidir. Buna görədir ki, məktəbə gələn-

dən sonra uşağın hafizəsinin qüvvəti sürətlə artır. Şübhəsiz, şagirdlərin hafizələrinin inkişafında müəllim böyük rol oynayır. Müəllimin işi yalnız öyrətməkdən, şagirdlərə yalnız bilik verməkdən ibarət deyildir, o, eyni zamanda onları həm tərbiyə etməli və həm də onların, hafizə də daxil olmaqla, müxtəlif qabiliyyətlərini inkişaf etdirməlidir. Çünki təlim ilə tərbiyə ayrılmaz vəhdətdədir. Buna görə də müəllim dərsdə şagirdlərin hafizələrini mümarisə etdirən momentlərin olmasına fikir verməlidir. Dərsdə şagirdlərin hafizələrini mümarisə etdirən momentlər olduqca çoxdur. Müxtəlif ədəbi parçaları əzbərləmək, oxunmuş kitabın məzmununu hekayə etmək, qabaqca görülmüş bir şeyin şəklini əzbərdən çəkmək, müşahidə edilmiş bir hadisəni yazı vasitəsilə təsvir etmək və sairə kimi işlər dərsdə şagirdlərin hafizələrini mümarisə etdirən işlərdəndir.

Uşaq hafizəsinin mümarisəsi həmin hafizənin tələblərinə görə olmalı və proqressiv bir şəkildə artmalıdır.

Mümarisə sayəsində hafizə birdənbirə deyil, tədrici olaraq qüvvətlənir. Buna görə də hafizə mümarisəsinin tədrici və proqressiv bir şəkildə artdırılması və mürəkkəbləşdirilməsi lazım gəlir.

Hafizənin bilavasitə tərbiyəsi, bir tərəfdən onunla əlaqədar olan psixi prosesləri inkişaf etdirməklə, ikinci tərəfdən yadda saxlama və yada salma metodlarını yaxşılaşdırmaqla və üçüncü tərəfdən hafizənin maddi, üzvi şəraitini yaxşılaşdırmaq vasitəsi ilə mümkün olur.

Hafizənin diqqət, assosiasiya, təfəkkür, nitq, emosiya və iradə kimi müxtəlif psixi proseslərlə sıx əlaqəsi vardır. Buna görə uşaqda hafizəni inkişaf etdirmək üçün, onda həmin psixi prosesləri də tərbiyə və inkişaf etdirmək lazım gəlir.

Hafizənin möhkəmliyi üçün xüsusən diqqətin əhəmiyyəti çox böyükdür. Buna görədir ki, "Diqqət hafizənin kəsici dişidir" deyilir. Məlumdur ki, diqqətimizi bir yerə toplamadan qavradığımız, gördüyümüz və eşitdiyimiz hadisələr tez yaddan çıxdığı halda, diqqətlə gördüyümüz və eşitdiyimiz hadisələr bizim yadımızda yaxşı qalır. Buna görədir ki, təcrübəli müəllim dərsdə keçilən materialı şagirdlərə yaxşı mənimsətmək və onların yadlarında yaxşı möhkəmlətmək üçün onların diqqətlərini yaxşı təşkil etməyə və həmin material üzərində mərkəzləndirməyə çalışır. Uşaq hafizəsinin məhsuldarlığı üçün təfəkkür inkişafının da böyük əhəmiyyəti vardır. Çünki bir materialın yadda yaxşı saxlanması və xatırlanması onun yaxşı anlaşılması ilə mümkündür ki, bu da fikirləşmək sayəsində olur. Buna görədir ki, biz, məsələn, mənalı kəlmələri nisbətən yaxşı yadda saxladığımız halda mənasız və yaxud mənalarını başa düşmədiyimiz kəlmələri yadda saxlamaqda çətinlik çəkirik.

Hafizənin möhkəmliyi nitqin inkişafından da çox asılıdır. Nitqin zənginliyi, söz ehtiyatının çoxluğu yadda saxlamaq və yada salmaq işlərinə çox kömək edir.

Hafizənin möhkəm və məhsuldarlığında iradənin də rolu böyükdür, çünki hafizənin yüksək şəkilləri iradəvi xarakter daşıyır və buna görə uşaq hafizəsinin inkişafı və möhkəmlənməsi onun iradəsinin inkişafı ilə çox əlaqədardır.

Hafizənin möhkəmliyində maraqla emosiyanın da rolu böyükdür. Məlumdur ki, bizdə emosiya doğuran və maraqla qavranan hadisələr yadımızda möhkəm qalır. Soyuq və maraqsız bir şəkildə qavradığımız hadisələr isə bizim yadımızdan tez çıxır.

Demək, hafizəni tərbiyə etmək və onun qüvvətini artırmaq üçün maraq və emosiyanın istifadə edilməsi də lazımdır.

Hafizənin möhkəmləndirilməsi və məhsuldarlığı onun proseslərində (yadda saxlama, yada salma və tanıma proseslərində) istifadə edilən metodlardan və pedaqoji tədbirlərdən də çox asılıdır. Bu tədbirlərin başlıcası bunlardır: materialı diqqətlə öyrənərək yadda saxlamaq, materialı müəyyən müddət sonra yada salmaq məqsədi ilə öyrənmək, materialı qısa bir vaxt içərisində deyil, nisbətən uzun vaxt içərisində öyrənmək, material çox böyük isə onu əvvəlcə hissə-hissə və bundan sonra da tam və əlaqəli olaraq öyrənmək, yadda saxlamaq və yada salmaq işlərində mnemotexnik vasitələrdən istifadə etmək və öyrənəndən sonra onu tez-tez təkrar etmək və sairə.

Demək olar ki, hər hansı bir insanın hafizəsinin möhkəm olmasının sirri onun bu cür tədbirlərdən istifadə edə bilməsindəndir. Müəllim hafizənin möhkəm olmasında diqqətin rolunu ayrıca olaraq çox hesaba almalı, şagirdlərin diqqətini yaxşı təşkil etməyə və keçilən materiala cəlb etməyə çalışmalıdır.

Hafizəni bilavasitə tərbiyə etmək, onun maddi orqanik şəraitini yaxşılaşdırmaq surətilə də olur. Hafizə də daxil olmaq üzrə bütün psixi proseslər və ümumiyyətlə, psixi həyat "yüksək və xüsusi şəkildə mütəşəkkil maddənin, yəni insan beyninin məhsulu və xassəsidir" buna görə hafizənin də başqa psixi proseslərin möhkəm və məhsuldarlığı, beynin yaxşı işləməsi ilə əlaqədardır. Beynin yaxşı işləməsi üçün orqanizmin normal vəziyyətdə olması və orqanizmdə həyati proseslərin normal gedişi lazım gəlir. Buna görədir ki, orqanizmin normal həyatını pozan müxtəlif səbəblər beynin normal fəaliyyətinə və bunun vasitəsilə hafizə və başqa psixi proseslər üzərinə mənfi təsir buraxır. Nevrosteniya, qanazlığı, skleroz kimi qanın normal dövranına, maddənin mübadiləsinə və beynin normal fəaliyyətinə mane olan müxtəlif xəstəliklərin hafizəni qüvvətdən salması məlumdur. Yorğunluğun da hafizə üzərinə mənfi təsiri böyükdür. Məşhur ingilis həkimi Qolland xəstə bir ingilisin bildiyi nemes dilini yorğunluq vaxtında tamamən unudaraq, dincəldiyi zaman təkrar xatırladığını və nemescə danışmağa başladığını müşahidə etmişdir. Bu cürə hadisələr də hafizənin bədənin vəziyyətilə sıx şəkildə əlaqədar olduğunu göstərir. Demək ki, "sağlam bədəndə sağlam ruh" zərbməsəli hafizəyə də aid ola bilir. Buna görə müəllim şagirdlərin normal inkişaf etmələrinə, onların bədənlərinin yaxşı vəziyyətdə olmasına və dərsdə onların fərəhli, maraqlı və xoş əhvali-ruhiyyəli olmasına fikir verməlidir.

***Azərbaycan məktəbi, 1943, №2***



# EKOLOJİ MƏDƏNİYYƏTİN FORMALAŞDIRILMASININ MÜTƏRƏQQİ ƏNƏNƏLƏRİ

**Rauf Sultanov,**
***biologiya üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *ekologiya, məktəb ekologiyası, ekoloji durum, ekoloji qanunlar, ekoloji problemlər, ekoloji mühit, təbii mühit, ekoşüur, insan-cəmiyyət-təbiət, ekoloji eksperiment, tədqiqat eksperimenti, doğma diyar, ekoloji tədqiqat, ekoloji mədəniyyət, təbii resurslar, təbiəti mühafizə, ekoloji təhsil.*

***Ключевые слова:*** *экология, школьная экология, экологическая ситуация, экологические законы, экологические проблемы, экологическая среда, природная среда, экосознание, человек-общество-природа, экологический эксперимент, исследовательский эксперимент, родной край, экологическое исследование, экологическая культура, природные ресурсы, охрана природы, экологическое образование.*

***Key words:*** *ecology, school ecology, ecological situation, ecological laws, ecological problems, ecological environment, environment, ecoconsciousness, human-society-nature, ecological experiment, research experiment, native land, ecological research, ecological culture, natural resources, protection nature, ecological education.*

"Ekologiya" yunan sözü olub, yurd (məkan) haqda təlim deməkdir. Ekoloji tərbiyə ahəngdar şəxsiyyət tərbiyəsinin mühüm tərkib hissəsidir. O, gənc nəsli ekoloji biliklərlə silahlandırmağa, ekoloji mədəniyyəti formalaşdırmağa yönələn tədbirlər sistemidir.

Ekoloji tərbiyənin əsasını təbiətin mühafizəsi, onu sevmək işi təşkil edir. İnsan təbiətin bir üzvüdür. Təbiət öz sərvətləri ilə insanı bəsləyir, yaşadır, fiziki və mənəvi qüvvələrini inkişaf etdirir, ona həyat verir. Lakin çox təəssüf ki, bəzən insan özü təbiəti, ekoloji mühiti korlayır; udduğu havanı, içdiyi suyu, məhsulunu yediyi torpağı yararsız edir. Bu yolla insanlıq öz-özünü məhvə aparır, özü üçün dəhşətli fəlakətlər, xəstəliklər yaradır.

Ekoloji təhsil prioritet olmalıdır, o, təsərrüfat fəaliyyətinin bütün sahələrini qabaqlamalıdır. Təhsilin səviyyəsindən və həyatda tutduğu mövqedən asılı olmayaraq hamı ekoloji biliklərə malik olmalıdır.

Respublikamızın Konstitusiyasının II fəslinin 78-ci maddələrində ekoloji durumu qorumaq və ətraf mühitin mühafizəsinin hər bir vətəndaşın borcu olduğu göstərilir.

Ekoloji tərbiyə işində müxtəlif yollardan, forma və metodlardan istifadə edilir. Ekoloji tərbiyə hələ kiçik yaşlardan, ailə və uşaq bağçasından başlanmalıdır. Erkən yaşlardan uşaqlarda təbiət hadisələrinə düzgün baxışlar yaratmaq, onlara təbiəti, canlıları sevdirmək, uşaq qəlbində xeyirxahlıq hissləri oyatmaq lazımdır. Kiçik yaşlardan buna diqqət yetirilməzsə, uşaqda təbiətə, heyvan və quşlara qarşı laqeydlik, hətta qəddarlıq, rəhmsizlik hissləri baş qaldıra bilər. Təbiətə

qarşı qəddarlıq təbiət gözəlliklərinə laqeydlikdən, ətraf aləmə qeyri-həssas münasibətdən, bir sözlə, uşaq qəlbində xeyirxahlıq hisslərinin kütləşməsindən başlanır.

Ümumtəhsil məktəblərinin vəzifəsi şagirdləri yalnız ekologiya sahəsində müəyyən həcmdə biliklərlə formalaşdırmaqdan ibarət deyildir. Onlarda elmi təhlil vərdişi əldə etmək, cəmiyyət və təbiətin qarşılıqlı təsirini, təbiətə öz köməyinin əhəmiyyətini dərk etmək vərdişlərini aşılayır.

Azərbaycan Respublikasında ekoloji vəziyyətin yaxşılaşdırılmasına dair Kompleks Tədbirlər planında cəmiyyətin ekoloji maarifləndirilməsi əsas vəzifələrdən biri kimi göstərilir. Bu cür keyfiyyətlərin formalaşdırılması müstəqil axtarış-tədqiqat prosesində şagirdlərdə müstəsna əhəmiyyət kəsb edir. Ekoloji tədqiqat fəaliyyəti – problemli təhsilin vəzifələrindən birinə çevrilir.

Məktəblilərdə ekoloji tərbiyənin formalaşdırılması, şagirdlərdə doğma diyarın ekoloji problemlərinə, yaşadığı yerin ekoloji vəziyyətinin öyrənilməsinə, elmi eksperimentlərə fəal, vicdanlı münasibətin yaranmasına kömək edir. Tədris prosesi çərçivəsində ekoloji tədqiqat işləri məktəblilərin praktiki fəaliyyətində ən kütləvi və perspektivli formalardan biri kimi çıxış etməlidir.

Təhsil və tərbiyə sistemində ekoloji təhsil və tərbiyə özünəməxsus yerə malikdir. Ekoloji maariflənmənin köməyilə və ekoloji tərbiyə üzrə işlərlə əhatə olunmaq nəticəsində təhsilalanlar ətraf aləmin mühafizəsinə, gözəlləşdirilməsinə, yaşıllıqların artırılmasına qayğı ilə yanaşır. Vətənimizin maddi və mənəvi sərvətlərinə görə iftixar və qürur hissləri keçirir. Hər bir şagird respublikamızın florası və faunası ilə tanış olmalı, ətraf mühitin çirklənməsinə yol verməməli, ağacların, quşların və heyvanların qırılması ilə mübarizə aparmalı və həmin işə qrup yoldaşlarını, başqa insanları da cəlb etməlidirlər.

Elmi-texniki tərəqqinin sürətlə inkişaf etdiyi müasir şəraitdə ekologiyanın, təbiətin mühafizəsi, onun sərvətlərindən qənaətlə və səmərəli istifadə olunmaları məsələləri müstəqil Azərbaycan Respublikasının qəbul etdiyi bir sıra rəsmi sənədlərdə öz əksini tapmışdır.

Təbiətin ayrılmaz tərkib hissəsi olan insan onsuz yaşaya bilməz. Onun bütün fəaliyyəti təbiətlə bağlıdır və təbiətə münasibəti həmişə əxlaqi-mənəvi səciyyə daşıyır.

Böyüməkdə olan nəslin təbiətə yeni təfəkkür tərzində münasibəti, ekoloji mədəniyyəti onları həm mənəvi normalara riayət etməyə, həm də başqa adamların diqqətini bu aktual problemin həllinə yönəlməyə vadar edir.

Ekoloji tərbiyə ekoloji şüurun və mədəniyyətin formalaşdırılması, məktəblilərin təbiətə qayğı göstərməsi və onu mühafizə etməsi üzrə fəaliyyətinin təşkili üzrə müəllimin məqsədəuyğun ardıcıl və planlı işidir.

Ekoloji mədəniyyət təkcə təbiətə müəyyən baxışlar, onun sisteminin işlənib hazırlanması demək deyildir. O, həm də konkret insan fəaliyyəti ilə əlaqədardır. Şagirdlərin təbiətin mühafizəsinə aid konkret fəaliyyət vərdişlərinin formalaşması böyük ekoloji tərbiyə məzmununa malikdir. Şagirdin müəyyən fəaliyyətində şəxsiyyətin iştirakı nəzəri bilik, praktik vərdiş və mənəvi sistem arasındakı ziddiyyətləri qaldırmağa imkan verir.

Göründüyü kimi, ekoloji mədəniyyətin əsasını şagirdlərdə təbiətə, onun ehtiyatlarından istifadəyə durğun münasibətin aşılanması təşkil edir. Ekoloji biliklərin şagirdlərdə formalaşdırılması prosesində,

onlar yaşadığı ərazinin ekoloji problemlərini və eyni zamanda, bəşəriyyəti qlobal səviyyədə narahat edən ekoloji problemləri, onların həlli yollarını bilməlidir.

Ekoloji problemlər kompleks xarakter daşıyır və buna görə də onların öyrənilməsi fənlərarası əlaqələrin imkanlarından optimal istifadə edildikdə səmərəli nəticələr verir. Bunun üçün təbiətşünaslıq biliklərinin, bacarıq və vərdişlərinin ayrı-ayrı fənlər və fənlər qrupu arasında diferensiallaşması, bölünməsi vacibdir. Həmçinin fəndaxili bilik və vərdişlərin ardıcıl inkişaf etdirilməsinə çalışmaq lazımdır. Tədris prosesində ekoloji biliklərin mərhələlər üzrə inteqrasiya edilməsinə çalışmaq lazımdır.

Mədəniyyətin formalaşdırılmasında pedaqoji prosesin imkanlarından faydalanaraq, şagirdlərin ekoloji dünyagörüşünü artırmaq lazımdır. Müasir ekoloji şəraitin mahiyyətini şagirdlərə çatdırmaq üçün təhsil prosesində yalnız metodik vəsaitlərdən istifadə edilməlidir.

Şagirdlər respublikamızda metodik, elmi və kütləvi mətbuat səhifələrində ekologiya, ekoloji mədəniyyət, ekoloji tərbiyə məsələlərinə dair çap olunmuş materiallardan istifadə etməlidir. Bunları toplamaq, təfəkkür süzgəcindən keçirmək, ardıcıllıqla sistemləşdirib şagirdlərə çatdırmaq lazımdır. Bunun üçün ilk növbədə müəllimlər özləri ekoloji maariflənmə ilə əhatə olunmalı və ekoloji mədəniyyətə yiyələnməlidirlər.

Şagirdlərdə ekoloji mədəniyyətin formalaşmasına imkan verən pedaqoji vasitələrdən istifadə edilməlidir. Pedaqoji vasitələrə təlim-tərbiyə prosesinin təşkili formaları, əyani vasitə və metodları, məzmun cəhətləri və s. daxildir.

Yerli şəraitdən asılı olaraq təbiəti mühafizə işinin müxtəlif formalarından istifadə olunur: məktəb meşəçiliyi, gənc təbiətçi dərnək və klubları, məktəb qoruqları, meyvə bağları, şagird istehsalat briqadaları, ekologiya üzrə olimpiada və viktorinalar, məktəb ekologiya cəmiyyəti, ekologiya ayları, ekologiya reydləri və s. belə maraqlı formalardandır. Məktəblərdə və yaşayış yerlərində yaşıllıq iməcliklərinin keçirilməsi, mavi və yaşıl keşikçi dəstələrinin yaradılması, ilk çiçək bayramlarının, meşə və quş günlərinin, təbiət dostları və gənc bağbanların müsabiqələrinin təşkili kimi tədbirləri məktəblərdə ənənə şəklinə salmaq lazımdır.

Biliklərin davranışda əks olunmasını göstərən təlim şəraitinin yaradılması son dərəcə mühüm vəzifədir. Bu zaman ekoloji tərbiyənin zəruriliyi, cəmiyyət qarşısında duran problemlər ekoloji təhsilin fasiləsizliyini irəli sürmüşdür.

Ailədə və uşaq bağçasında aparılan ekoloji tərbiyə işləri məktəbdə daha da inkişaf etdirilir və sistemli şəkil alır. Təlim prosesi ekoloji tərbiyənin çox mühüm yoludur. Ayrı-ayrı fənlərin tədrisində ekoloji təhsil və tərbiyə üçün böyük imkanlar vardır. İbtidai siniflərdə şagirdlər təbiətşünaslıq və ətraf aləmlə tanışlıq dərslərində təbiət və onun mühafizəsi haqqında ilkin təsəvvürlərə yiyələnir, onlarda təbiətə məhəbbət, onu qorumağın vacibliyi fikri aşılanır.

Müəllim şəxsiyyətinin şagirdlərdə ekoloji mədəniyyətin formalaşmasına təsiri böyükdür. Müəllim şəxsiyyətinin ekoloji mədəniyyətinin formalaşmasının özünəməxsus yeri, psixoloji, sosioloji və s. xüsusiyyətləri vardır. İnsanın ümumi mədəniyyətinin formalaşmasının göstəriciləri olan qazanılmış biliklərin əqidəyə çevrilməsi ilə bağlı informatik-idraki vəzifələr mövcuddur. Onlardan biri, əldə olunmuş yeni bilikləri

qiymətləndirmək və mənimsəmək vəzifəsidir. İnsanın sosial yaradıcılıq xəttini müəyyən edən idraki fəallıq vəzifələri, davranış və fəaliyyətin emosional normalarını təmin edən ünsiyyət vasitələri yalnız müəllim peşəsində inteqrasiya olunur, öz əksini tapır.

Təbiətin qorunmasına əsaslanan təfəkkür sisteminin formalaşdırılması üçün cəmiyyətin bütün üzvlərinin psixologiyasında ətraf mühitdə vəziyyətin başa düşülməsi və təbiətin mühafizə edilməsinə, qorunmasına münasibətdə müsbət dəyişiklik olmalıdır.

Bunun qarşısını almaq üçün kiçik yaşlardan uşaqları təbiətə qayğılı münasibət ruhunda tərbiyə etmək, ekoloji şüuru və mədəniyyəti formalaşdırmaq lazımdır. Hər bir insan - şəxsiyyət və vətəndaş kimi öz yurdunun, bəşər övladı kimi isə dünyanın ekoloji vəziyyəti və tarazlığı üçün məsuliyyət hiss etməli, onun pozulması hallarına barışmazlıq göstərməlidir. Bu, dünyanın hər bir sakininin insanlıq borcudur.

Müəllim şəxsiyyəti, cəmiyyətin sağlam, mütərəqqi mədəniyyətinin formalaşması barədə söylənmiş fikirlər bu gün də öz aktuallığını saxlamaqdadır.

***Rəyçi: prof. Ə.Hüseynov***

## İstifadə edilmiş ədəbiyyat

1. Əliyeva R., Mustafayev Q. "Ekologiya" dərs vəsaiti. Bakı, 2004.

2. Göyçaylı Ş., Mikayılov N. və başqaları. Ətraf mühiti mühafizə və təbii ehtiyatlardan səmərəli istifadə. Bakı: Hərbi, 1996.

3. Sadıqov F., Əliyeva E., Abbasov M. Ekoloji tərbiyənin etnopedaqoji əsasları. Bakı:Nurlan, 2007.

**Р.Султанов**

**Прогрессивные традиции формирования экологической культуры**

**Резюме**

Молодое поколение, подрастающее в образовательных учреждениях в связи с образом жизни в первую очередь должно овладеть необходимыми экологическими знаниями. Экологическое образование приоритетное, независимо от специальности, уровня образования и занимаемого в жизни положения экологическими знаниями необходимо обладать всем. Поэтому планирование преподавания предмета «Школьная экология» имеет большое значение в защите природы и здоровья человека.

**R.Sultanov**

**Traditions of ecological awarenesses**

**Summary**

The young generation growing in educational institutions in connection with a way of life first of all should seize necessary ecological knowledge. Ecological education is priority, irrespective of specialty, an education level and situation occupied in life by ecological knowledge is necessary to possess everything. Therefore planning of teaching of a subject "School ecology" is of great importance in protection of the nature and health of the person.



# ŞAGİRDLƏRDƏ VƏTƏNƏ MƏHƏBBƏT HİSSLƏRİNİN TƏRBİYƏSİ

**Sevil Abdinova,**
***S.C.Pişəvəri adına Humanitar fənlər gimnaziyasının müəllimi, doktorant***

Məqalədə Azərbaycan Respublikası öz dövlət müstəqilliyini bərpa etdikdən sonra yenidən qurulmuş təhsil sistemimizdə milli tərbiyə işinin əsas prinsipləri qeyd olunmuş, bu prinsiplər çərçivəsində ibtidai sinif şagirdlərində Vətənə məhəbbət hisslərinin aşılanmasında Milli Qəhrəmanlarımızın həyat, amal və qəhrəmanlıq əməllərindən bir örnək kimi istifadə olunmasının səmərəliliyi göstərilmişdir.

***Açar sözlər:*** *təhsil sistemimiz, milli tərbiyə prinsipləri, tərbiyə prosesi, ibtidai sinif şagirdi, sinif müəllimi, vətənə məhəbbət, milli qəhrəman, mentalitet.*

***Ключевые слова:*** *система образования, принципы национального воспитания, процесс воспитания, учащихся начальных классов, классный учитель, любовь к Родине, Национальный Герой, менталитет.*

***Key words:*** *education system, national educational policies, educational process, primary school student, teacher, love of country, a national hero, mentality.*

Ölkənin siyasi, iqtisadi və mədəni həyatının keyfiyyətcə köklü şəkildə dəyişərək, beynəlxalq standartlara uyğun şəkildə yenidən qurulması yetişməkdə olan gənc nəslin təlimi və təhsili ilə yanaşı, onun tərbiyəsi işinin də tamamilə yeni prinsiplərinin formalaşması zərurətini ortaya qoymuşdur.

Respublikadakı digər həlledici (iqtisadi, inzibati və sosial) sahələr kimi, təhsil sistemi də keçmiş təhsil sistemimizin müsbət, mütərəqqi elementlərini özündə qoruyub-saxlamaqla, milli, müasir, demokratik və dünyanın qabaqcıl təhsil sistemlərindəki müsbət cəhətləri də nəzərə almaqla, demək olar ki, yeni məzmuna malik bir şəkildə formalaşmışdır. Bu dövr ərzində ölkəmizdə gənc nəslin dünyanın qabaqcıl təcrübələrinin tələb etdiyi səviy-yədə təhsil və tərbiyəsi hər cür vasitələrdən və imkanlardan istifadə edilmişdir.

Ulu öndərimiz hələ dövlət müstəqilliyimizin ilk illərində ölkənin iqtisadiyyatının, hərbi gücünün, müdafiə qabiliyyətinin inkişaf etdirilməsi, möhkəmləndirilməsi ilə yanaşı, ölkə gənclərinin müasir standartlara uyğun şəkildə təhsil alması, onlarda doğma Vətəninə hərtərəfli məhəbbət hissinin tərbiyə olunması problemlərinə də ciddi diqqət yetirmişdir. Müxtəlif vaxtlarda, təhsil işçiləri, məktəb kollektivləri, şagirdlər, yeni tələbə adı qazanmış gənclərlə görüşlərində onların millətin, xalqın, ölkənin gələcəyi, təhsil aldıqları xarici ölkələrdə Azərbaycanın layiqli təmsilçiləri olmalarını yada salmış, tövsiyələr etmişdir. Hələ müstəqilliyimizin ilk dövrlərində məhz Heydər Əliyev tərəfindən verilən fərman və sərəncamlar əsasında təhsil sistemimizdə aparılan islahatlar buradakı tədris, təlim prosesi ilə yanaşı, tərbiyə, daha doğrusu, təhsil sistemində milli tərbiyə işinin prinsiplərinin müəy-

yənləşdirilməsini zəruri etmiş, onun əsas istiqamətlərini müəyyənləşdirmişdir.

Həmin prinsiplərə görə tərbiyə çoxşaxəli bir proses olsa da, o, yalnız dövlətin, cəmiyyətin, ailənin və məktəbin birgə səyi nəticəsində düzgün həyata keçirilə bilər. Ancaq belə bir birgə fəaliyyət nəticəsində əsl, mükəmməl, vətənpərvər, vətənini böyük məhəbbətlə sevən şəxsiyyət tərbiyə etmək mümkündür.

Təhsil sisteminin milli tərbiyə prinsiplərinin başlıca bir istiqaməti olan ümumbəşəri dəyərlər şəxsiyyət tərəfindən düzgün qavranıldıqda həmin şəxsin öz Vətəninə layiqincə qulluq göstərməsinə xidmət edir. Məhz ümumbəşəri dəyərləri düzgün dərk edən vətəndaş demokratik, hüquqi, dünyəvi dövlət quruculuğu prosesində layiqincə iştirak edə bilər.

Tərbiyə prosesində nəzərə alınmalıdır ki, şagirdlər ümumbəşəri dəyərlərlə yanaşı öz milli tarixi kökləri, ənənələri, mənəvi sərvətləri barədə də biliklərə malik olmalı, həmin biliklərlə özlərinin şəxsi keyfiyyətlərinin yüksəldilməsindən əlavə, həm də bu dəyərləri imkan düşdükcə beynəlxalq aləmdə də təbliğ etməlidirlər. Bu iş həmin uşaqların vətənə məhəbbət tərbiyəsinin ən vacib komponentlərindən biri kimi, daima diqqət mərkəzində olmalıdır. Şagirdlərin vətənə məhəbbət ruhunda tərbiyəsi üzrə aparılan tərbiyə işinin bu istiqamətdəki qolunda milli-mənəvi dəyərlərə millətimizin, xalqımızın həm keçmiş zamanlardakı, həm də indiki dövrdəki qəhrəmanlıq ənənələri, onun Milli Qəhrəmanlarının amal, əməl, arzu və istəkləri, göstərdikləri şücaətlərin mənəvi, humanist keyfiyyətləri, məqamları qabardılmalı, uşaqların şüurunda kifayət qədər həkk olunmalıdır.

Milli-mənəvi dəyərlər əsrlər boyu millətimizin, xalqımızın həyatında, məişətində, fəaliyyətində formalaşıb-toplanmış, onun canına hopmuş, əlindən alına bilinməyən, işğal və zəbt olunmaz bir sərvətdir. Milli-mənəvi dəyərlərin kökündə vətən, vətənə məhəbbət dayandığı kimi, onun əsas qayəsi də vətənə sevgidir. Kiçikyaşlı məktəblilərə aşılamaq lazımdır ki, milli-mənəvi dəyərləri olmayan millət və xalq həqiqi millət və xalq ola bilməz.

Azərbaycan xalqının isə bu barədə bəxti gətirib. O, milli-mənəvi sərvətlər baxımından dünyanın ən böyük saylı millət və xalqları ilə, dövlət və ölkələri ilə müqayisə oluna biləcək səviyyədə zəngindir. Bu zənginliklə fəxr etmək, öyünmək, qürurlanmaq mümkün olduğu kimi, onu sevmək, qorumaq, daha da zənginləşdirmək lazımdır. Bunun üçün isə hər bir vətən övladının, hər bir milli vətəndaşın qəlbində öz vətəninə sonsuz böyük məhəbbət olmalıdır-Milli Qəhrəmanlarımızda olduğu kimi.

İbtidai sinif şagirdlərində milli-mənəvi dəyərlərimizə, xalqımızın mentalitetinə-kiçiklərin yaşlılara, övladların öz valideynlərinə, şagirdlərin müəllimlərinə xüsusi hörmətlə yanaşmasına, eləcə də əksinə, çox ciddi şəkildə əməl olunmasına və bundan hər bir şüurlu vətəndaşın böyük qürur və iftixar hissi keçirməsinə müxtəlif yollarla məhəbbət hissi aşılanmasına və onlarda da bu hisslərin tərbiyə olunmasına çalışılmalıdır.

Sinif müəllimi öz ibtidai sinif şagirdlərinə Milli Qəhrəmanlarımızın həyat və əməllərini əks etdirən hadisələrdən, onların vətənin bir hissəsi olan insanlar uğrunda necə igidliklər göstərməsinə dair hadisələrdən danışmalıdır. Nəzərə almaq lazımdır ki, ümumi həyatımızda olduğu kimi, təhsil sistemimizdə aparılan milli tərbiyə prinsiplərinin də əsasında Azərbaycançılıq durur. Bütövlükdə götürülmüş dövlətçilik, milli-mənəvi və ümumbəşəri dəyərlər, eləcə də bu qəbildən olan digər amillər hamısı məhz Azərbaycançılıq anlayışının tərkib hissələridir. Azərbaycançılığın ən müqəddəs

sərvəti isə vətənimiz Azərbaycandır.

Demokratik, hüquqi bir dövlətin milli təhsil sistemi olaraq, Azərbaycan Respublikası təhsil sisteminin başlıca və müqəddəs vəzifələrindən biri də uşaq, yeniyetmə və gənclərimizi ümumbəşəri və ümummilli dəyərlər ruhunda şəxsi keyfiyyətlərə malik bir insan kimi tərbiyələndirməklə yanaşı, həm də onlardan dövlətçilik ideyalarına sadiq, əsl vətənpərvər, doğma xalqına və dövlətinə sədaqətli olan, öz doğma Vətənini, torpağını sönməz məhəbbətlə sevən, humanist ruha və harmonik inkişafa malik olan bir insan tərbiyə etməkdir.

Şagirdlərin tərbiyəsi prosesində tərbiyə edən pedaqoq, yəni sinif müəllimi öz fəaliyyətində uşağa dərk etdirməlidir ki, hər bir uşaq kimi həmin uşaq da bəşəriyyətin bir üzvü olmaqla yanaşı, həm də konkret bir millətin nümayəndəsidir. Müəllim çalışmalıdır ki, onun tərbiyə etdiyi ibtidai sinif şagirdi olduğu vaxtdan milli mənsubiyyətini dərk etsin və vahid milli birliyin layiqli üzvü olsun. Nəzərə almaq lazımdır ki, ibtidai sinif şagirdləri həyatlarının elə bir yaş dövrünü keçirirlər ki, bu dövrdə onların yaddaşlarına, xarakterlərinə yazılan hər bir əməl, keyfiyyət və xüsusiyyət onların bütün sonrakı həyatları boyu beyinlərində qalır.

Hər bir insanın vətəndaşı olduğu ölkənin dövlətçiliyi və yaşadığı ailə onun Vətəninin bir hissəsi, bir atributudur. Ona görə də ibtidai sinif şagirdlərinin pedaqoji tərbiyəsi işi prosesində müəllim, həm də uşağı vətəndaşa çevirməli, dövlətin və onun ictimai sisteminin mahiyyətini ona başa salmalı, ölkə qayda-qanunlarına riayət etməyi və qorumağı öyrətməli, uşaqda ölkənin dövlət rəmzlərinə hörmət hissi aşılamalıdır. Uşaqlarda vətənə məhəbbət hisslərinin tərbiyəsində müəllim diqqət yetirməlidir ki, hər bir şagirddə belə bir fikir formalaşsın ki, hər bir insan kimi, o da bir ailənin üzvüdür və o öz ailəsinin pozitiv ənənələrini, dəyərlərini, qayda-qanunlarını dərk etməli və onların daşıyıcısı olmalıdır. Bu işdə müəllimlə yanaşı, şagirdin yaşayıb-böyüdüyü ailədəki mühit və ailə tərbiyəsi də əsas yer tutur. Müəllim bu amili öz pedaqoji tərbiyə işi sahəsindəki fəaliyyətində nəzərə almalıdır.

Hər bir insan-yeniyetmə və gənc kimi, ibtidai siniflərdə təhsil alan kiçikyaşlı uşaqlarda da vətənə məhəbbət hisslərinin tərbiyəsi işinin səmərəliliyinin və effektivliyinin artırılmasının bir yolu da onlara vətənin, xalqın, ölkənin tarixi ilə yanaşı, mənsub olduğu millətin də tarixini öyrətməkdir.

Millətinin tarixini bilmək hər bir şəxs üçün vacib olmaqla yanaşı, uşaqların tərbiyəsi, onların şəxsi keyfiyyətlərinin formalaşması üçün də xüsusi əhəmiyyəti var. Şagird (kiçikyaşlı uşaq) dərk etmək imkanları daxilində milli səviyyədə haradan gəldiyini, harada olduğunu və haraya gedəcəyini bilməlidir. Çünki ölkənin tarixini bilmədən onun nə bu gününü, nə də gələcəyini təsəvvür etmək, dərk etmək mümkün deyil. Vətənə əsl, məzmunlu məhəbbət hissləri tərbiyə edə bilmək üçün hər bir insana, o cümlədən ibtidai sinif şagirdinə mənsub olduğu millətin bəşəriyyət tarixindəki yerini və rolunu çatdırmaq lazımdır.

Milli qanunları bilmək, müdafiə etmək, onlara hörmətlə yanaşmaq bütövlükdə Vətənə məhəbbətin çox vacib tələblərindən biridir. Şagirdlər də hüquqlarını və özünün ölkə, vətən, ictimaiyyət, dövlət qarşısındakı vəzifələrini yaxşı bilməlidir. Bu məsələlər də hər bir ibtidai sinif müəlliminin şagirdlərlə apardığı pedaqoji tərbiyə işinin bütövlükdə və vətənə məhəbbət hissləri tərbiyəsinin bir tərkib hissəsidir.

Uşaqların fiziki tərbiyəsi məsələləri ilə məşğul olan müəllim, həm də onlara başa salmalıdır ki, fiziki sağlamlıq yalnız fərdin özü üçün lazım olan keyfiyyət deyil. Fiziki

cəhətdən sağlam olmağa çalışmaq, həm də vətənə olan məhəbbətdən irəli gəlir. Çünki fiziki cəhətdən sağlam vətəndaş, insan Milli Qəhrəmanlarımız kimi öz ölkəsinə, vətəninə, xalqına lazım olan səviyyədə daha yaxşı xidmət göstərə bilər.

Bu səbəbdən də müəllim öz şagirdlərinin fiziki inkişafının, onların bədən tərbiyəsi və idmanla lazımınca məşğul olmasının qayğısına qalmalı, bu məsələni onların tələbatına çevirməyi bacarmalı, uşaqları sağlam fiziki və zehni əməyə, vətənin layiqli müdafiəçisi olmağa hazırlamalıdır.

Hələ kiçik yaşlarından şagirdlərdə əmək mədəniyyətini aşılamaq, formalaşdırmaq da onlarda Vətənə məhəbbət hisslərinin tərbiyəsinin mühüm şərtlərindən biridir. Hər bir uşaq dərk etməlidir ki, həm şəxsi həyatda, həm də vətən qarşısında qazanılan hər bir uğur, müvəffəqiyyət, qəhrəmanlıq, ilk növbədə, yüksək bilik, möhkəm iradə və işgüzarlığın sintezi nəticəsində əldə edilə bilər. Bu səbəbdən də müəllim öz şagirdlərində vətənə məhəbbət hissləri tərbiyə edərkən onlarda əməksevərliyi də təlqin etməli və onlarda işgüzarlığı formalaşdırmalıdır.

Şagirdlərdə vətənə məhəbbət hisslərinin pedaqoji tərbiyəsi işində qarşıya qoyulan bütün bu məqsədlərə uğurla nail olmaq üçün müəllim ilk növbədə müxtəlif formalı tərbiyə işlərinin elmi əsaslarına, bu barədə milli və beynəlxalq təcrübəyə yiyələnməli, öz ölkəsinin, xalqının, millətinin tarixi, maddi və mənəvi sərvətləri, dövlətçilik prinsipləri barədə müfəssəl məlumatlara malik olmalıdır.

Digər tərəfdən pedaqoji tərbiyə işlərinə dair bütövlükdə və xüsusi halda vətənə məhəbbət hissləri tərbiyəsi işinə dair bütün səviyyə və pillələrdə konkret proqramlar, metodologiyalar, şagird, müəllim, tərbiyəçi və valideynlər üçün elmi-metodiki vəsaitlər, dərsliklər, köməkçi ədəbiyyatlar hazırlanmalıdır. Respublikamızın, xalqımızın, millətimizin gələcəyi olan indiki uşaqlardan, bugünkü ibtidai sinif şagirdlərindən çox şeylər - gələcəkdə ölkəni qurmaq, inkişaf etdirmək və həm də ən başlıcası Vətəni sevmək, onu böyük məhəbbətlə qorumaq tələb olunur. Bunun üçün isə onları kifayət qədər biliklərə yiyələndirməklə yanaşı, həm də vətənə sönməz bir məhəbbət ruhunda tərbiyə etmək lazımdır. Vətənə məhəbbət hisslərinin ibtidai sinif şagirdlərində tərbiyəsi işini isə müxtəlif üsullarla həyata keçirmək mümkündür. Bunlardan biri də onlarda Qəhrəman Vətən övladlarının xarakteri, amal və əməlləri haqqında tam təsəvvürlər yaratmaq, Milli Qəhrəmanları onlara örnək göstərməklə onlarda Vətənə məhəbbət hissləri tərbiyə etməkdir. Azərbaycan xalqı isə çox qədim keçmişə və şərəfli qəhrəmanlıq tarixinə malik olduğu kimi, həm də örnək göstəriləsi igid, mərd oğullar – Milli Qəhrəmanlar vətənidir.

***Rəyçi: prof. L.Məmmədova***

## İstifadə edilmiş ədəbiyyat


1. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu”. Bakı, 2012.
2. İsmayılov R., Orucov G., Zahid X., Cəfərova D. “Azərbaycan dili” (I-IV siniflər üçün dərsliklər). Bakı, 2016.
3. Qasımova L. Məktəblinin milli-mənəvi dəyərlər əsasında tərbiyə edilməsi. Bakı, 2003.
4. Qasımova L., Mahmudova R., Pedaqogika. Bakı, 2012.
5. Abdinova S. Şagirdlərin Milli Qəhrəmanlara məhəbbət ruhunda tərbiyəsi təcrübəsindən. // Məktəbəqədər və ibtidai təhsil, 2015, № 2.
6. Abdinova S. Təhsilalanın Vətənə məhəbbət ruhunda tərbiyə edilməsi. // Azərbaycan məktəbi, 2015, № 4.

7. Abdinova S. İbtidai sinif şagirdlərinin Vətənə məhəbbət ruhunda tərbiyəsinə dair. Naxçıvan Müəllimlər İnstitutunun Xəbərləri, 2015, № 4.

8. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı, 1998.

9. Рожков М., Байбородова Л., "Организация воспитательного процесса в школе". М., 2000.

**С.Абдинова**

**Воспитния любви к Родине у учащихся**

**Резюме**

В статье отмечены основные принципы национального воспитания в почти заново сформированного системе образования Азербайджанской Республики после восстановления ее государственной независимости. Показана эффективность использования примера жизни, идей и героизма Национальных Героев в воспитании любви к Родине у учащихся начальных классов

**S.Abdinova**

**Teaching patriotic feeling at schools**

**Summary**

The article is dedicated to the major principles of national education after Azerbaijan Republic gained its independence. These basic principles of education which promotes feeling of love to motherland at primary schools, national heroes' life and heroism deeds shown as an example are investigated.

## *CƏBHƏDƏN MƏKTUB*

*Əziz yoldaşlar! Bu məktubu Sizə cəbhədən yazırıq. Biz hamımız buraya gəlməmişdən qabaq günəşli respublikamızın kənd və rayonlarında müəllimliklə məşğul olurduq. İndi isə vətənimizin çağırışı ilə biz əlimizdə silah doğma torpağımızı, namus və vicdanımızı, qoca atalarımızın müqəddəs duyğularını, ana və bacılarımızın ismətini qoruyuruq. Biz burada qardaş rus, Ukrayna, belorus, gürcü, erməni xalqı ilə birlikdə çiyin-çiyinə vuruşuruq. Ucsuz-bucaqsız vətənimizin hər tərəfindən buraya biz yalnız bir məqsəd üçün gəlmişik – bu da bizi böyüdən, alnımızı açıq, gözlərimizi işıqlı edən doğma Vətənin müdafiəsidir...*

*Əziz yoldaşlar! Biz cəbhədə Azərbaycan müəllimlərinin şöhrətini doğruldacağıq. Siz buna əmin ola bilərsiniz. Biz cəbhəyə gələrkən məktəblərimizi, körpə və uşaqlarımızın tərbiyəsini sizə tapşırmışıq. Burada vəhşi düşmənə qarşı amansızcasına vuruşaraq körpələrimizin rahat həyatını qoruyuruq, siz də bütün ölkəmiz tərəfindən etibarlı əllərinizə tapşırılmış uşaqlarımızın tərbiyəsi üçün bacardığınızı əsirgəməyin...*
*Məktəb vətənpərvərlərin məskənidir. Məktəb müqəddəs hisslərin kəbəsidir.*

***Bir qrup cəbhəçi müəllim.***
***"Azərbaycan məktəbi", 1943, №2***



# MƏNƏVİ DƏYƏRLƏR TƏRBİYƏ İŞİNİN TƏRKİB HİSSƏSİDİR

**Xədicə Əliyeva,**
***Bakı şəhəri, Məktəb-Lisey Kompleksinin tərbiyə işləri üzrə direktor müavini***

Məktəblərdə tərbiyə işi məqsədyönlü fəaliyyətdir. Onun məqsədi gənc nəsli elmlərin əsasları ilə silahlandırmaqla yanaşı onlarda dünyagörüşü formalaşdırmaq, milli və ümumbəşəri dəyərlər tərbiyə etməkdir. Bu strateji məqsədə nail olmaq üçün təlim, tərbiyə və təhsilin müxtəlif istiqamətləri sahəsində mühüm vəzifələr həyata keçirilməlidir. Bunun uğurlu həlli üçün məktəb öz çərçivəsinə qapanıb qalmamalı, o, cəmiyyətin həyatında yaxından iştirak etməli, özünü ondan ayrı təsəvvür etməməlidir.

Məktəbdə tərbiyə prosesi geniş, mürəkkəb və çoxcəhətlidir. Bu prosesin mayasını isə milli-mənəvi dəyərlər təşkil edir. Şagirdlər bu dəyərlərin mahiyyətinə bələd olduqca, sanki özlərini yenidən dərk edirlər, daha açıq desək, öz soyköklərini tanıyırlar. Ona görə də tərbiyəvi tədbirlər elə qurulmalıdır ki, onun təsirliliyi keçici olmasın və bir qayda olaraq ölkədə gedən böyük hadisələrlə nəfəs ala bilsinlər. Bu mənada 2017-ci ilin “İslam Həmrəyliyi İli” elan olunması təhsil ocaqlarında aparılan tərbiyəvi işlərin də məzmununda əsaslı dəyişiklik yaratmışdır. İndi elə məktəbli tapmaq olmaz ki, qarşıdan gələn idman oyunlarından xəbərsiz olsun.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sözləri ilə desək: “İslam Həmrəyliyi Oyunlarının Azərbaycanda keçirilməsi ölkəmizin həyatında çox əlamətdar hadisədir. Qədim tarixə malik olan Azərbaycan cəmi 25 ildir ki, müstəqil dövlət kimi yaşayır. İndi Azərbaycan beynəlxalq aləmdə böyük nüfuza malikdir. Bu oyunlarda 57 ölkəni təmsil edən 6 mindən çox idmançı yarışacaqdır.

Azərbaycan ilk dəfə deyil ki, belə məsul yarışlara ev sahibliyi edir. İslam Həmrəyliyi Oyunları bütün müsəlman ölkələrini bir-biri ilə daha da sıx birləşdirmək üçün irəli sürülən önəmli təşəbbüsdür. Bu oyunlar imkan verəcəkdir ki, bütün müsəlman ölkələri birlik, həmrəylik nümayiş etdirsinlər. Bu ilin may ayında keçiriləcək bu oyunlar həm böyük idman bayramı olacaq, həm də bizim dostluğumuzu əks etdirəcəkdir”. Prezident xatırlatmışdır ki, iki il əvvəl Bakıda keçirilmiş Birinci Avropa Oyunlarında Azərbaycan idmançıları 56 medal qazanmışlar və komanda hesabında ikinci yerə layiq görülmüşlər. Rio Olimpiya Oyunlarında Azərbaycan 18 medal qazanmışdır. İslam Həmrəyliyi Oyunlarına da böyük ümidlər bəslənilir.

İslam Həmrəyliyi Oyunlarının rəmzinin su olması da maraq doğurmuşdur. Azərbaycan Respublikası Prezidentinin sözlərini xatırlayaq: “Su həyat deməkdir. Təbiət və insan susuz yaşaya bilməz. Azərbaycan füsunkar təbiətə malik bir ölkədir. Gözəl göllərimiz, çaylarımız, bulaq-

larımız, şəlalərimiz, gözəl Xəzər dənizimiz bizim təbii sərvətimizdir. Bu gün Xəzərin sahilindən ölkəmizin müxtəlif istiqamətlərinə böyük səyahət başlayır. Su, əslində bir rəmzdir və Oyunların rəmzi məhz sudur. Hesab edirəm ki, bu seçim yüksək qiymətə layiq olmalıdır. Qoy, bizim yolumuz su kimi aydın, niyyətimiz su kimi təmiz olsun".

Məktəblərdə keçiriləcək tədbirdə şagirdlərə belə məlumat verilməsi onlarda vətəni sevmək, vətənpərvərlik hisslərini oyadır. Çünki bu sözlər həmrəyliyin əzəmətinə yeni töhfədir. Bütün bunlar barədə məktəbdəki tədbirlərdə şagirdlərə çatdırılan məlumatlar həm də İslam Həmrəyliyi Oyunlarına marağı daha da artırır, onlar bu barədə daha geniş təsəvvürə malik olurlar. Ona görə də ölkəmizdə keçirilən belə qlobal yarışlar barədə şagirdlərə daha əsaslı izah və şərhlər verilməlidir. Onlar çox təəssüf edirlər ki, yaşları imkan vermədiyinə görə könüllülər cərgəsinə qatıla bilmirlər.

Məlum olduğu kimi, IV İslam Həmrəyliyi Oyunları 2017-ci il mayın 12-dən 22-dək Bakıda keçirilir. Bu oyunlar Azərbaycan üçün təkcə idman oyunları deyil, eyni zamanda xalqlar arasında əlaqələrin, dialoqun təşviqi platforması kimi dəyərləndirilməlidir, IV İslam Həmrəyliyi Oyunlarının təşkili və keçirilməsi ilə əlaqədar bəzi tədbirlər haqqında 2017-ci il 2 mart tarixli Sərəncam da vardır. Görüləcək işlərin miqyası və vaxtı dəqiq müəyyənləşdirilmişdir.

Qeyd etmək lazımdır ki, İslam dünyasını birləşdirən maraqlı, çoxnövlü idman tədbiri olan Bakı-2017-də müsəlman dövlətlərini təmsil edən idmançılar on gün ərzində idmanın müxtəlif növlərində mübarizə aparacaqlar. Yarışlar paytaxtın 16 ən müasir idman qurğusunda təşkil olunacaqdır.

2017-ci ilin "İslam Həmrəyliyi ili" elan olunması münasibətilə məktəbdə keçirilən tədbirlərdə 2016-cı ildə çox uğurlu nəticələri olan Multikulturalizmə dair geniş söhbətlər aparıldı. Şagirdlərə tam bəlli oldu ki, bu iki böyük ictimai hadisə bir-biri ilə sıx əlaqəlidir, biri o birinin davamıdır. Məktəbimizdə rus bölməsi də fəaliyyət göstərdiyindən belə tədbirlər onlar üçün daha maraqlı olur. Multikulturalizmə dair bədii əsərlərdən gətirilən nümunələrlə yanaşı konkret faktlar da yada salındı. Ədəbi-bədii gecələrdə qoyulan mövzular yalnız Azərbaycan klassiklərinin üzərində qurulmur. Puşkin, Lermontov, Tolstoy da yada salınır. Anna Axmatovaya həsr edilən ədəbi-bədii gecə çox maraqlı keçdi. Anna Axmatovanın həyat yoluna nəzər salındı. Böyük tədqiqatçı Qumilyov xatırlandı. Uşaqlar tədbirdən çox razı qaldılar. Tədbirlərin biri mütaliəyə həsr olunmuşdu. Burada Təhsil Nazirliyinin göstərişləri nəzərə alınaraq, mütaliəyə marağın yaradılmasına dair çoxlu faktlar sadalandı. Elm, maarif xadimlərinin, hər şeydən əvvəl, zəngin mütaliəyə sahib olduğuna dair faktlar gətirildi. İnsanın bütün həyat uğurları, əsasən, onun mütaliə mədəniyyəti ilə bağlıdır.

Azərbaycanda bu oyunlar "Həmrəylik bizim gücümüzdür" şüarı altında keçirilir. Azərbaycan, ev sahibliyi etdiyi əvvəlki beynəlxalq idman yarışlarında olduğu kimi, bu Oyunlara da yüksək səviyyədə hazırlaşmışdır.

İslam Həmrəyliyi Oyunlarına hazırlıq və işin gedişi bir daha təsdiq edir ki, Bakıda keçirilən İslam oyunları təkcə idman yarışı kimi deyil, həm də İslam ölkələrinin birliyi, müsəlman dünyasında gənc nəsillərin həmrəyliyi kimi yadda qalacaqdır. Xalqımız əmindir ki, bu möhtəşəm tədbirdən sonra müsəlman ölkələri iqtisadi, siyasi

və mənəvi cəhətdən bir-birinə daha çox bağlanacaq, bir–birini daha ciddi şəkildə müdafiə edəcək və bu istiqamətdə yeni fəaliyyət mühitinə daxil olacaqdır. Bütün bunlar Azərbaycanın, həqiqətən, “Şərqin qapısında yanan bir şam” olduğunu bütün dünyaya göstərəcəkdir.

Pedaqoji kollektivin üzvləri ona da diqqət yetirir ki, ümumtəhsil məktəblərində dərs yalnız təlimin deyil, həm də tərbiyə işinin əsas təşkilat formasıdır, təlimin bütün cəhətləri dərsdə əks olunur. Ona görə də, bir sıra tərbiyəvi işlər təlimin tərbiyəedici funksiyası vasitəsilə həyata keçirilir. Səmərəli keçən dərs şagirdlərdə vətəndaşlıq borcu və tapşırılan iş üçün məsuliyyət hissi formalaşdırır.

“Heydər Əliyev və müstəqil Azərbaycan” mövzusunda keçirilən tədbirdə “Azərbaycan dünyaya günəş kimi doğacaq” deyiminə istinad olundu. Azərbaycan indi bütün dünya ölkələri içərisində öz nüfuzunu artırmaqdadır.

Məktəbdə tarixi hadisələrə həsr olunmuş tədbirlər də canlı və maraqlı keçir. Məktəbdə keçirilən rəngarəng tədbirlər sahəsində tərbiyə işləri üzrə zəngin təcrübə toplanmışdır. Şagirdlərin özünü-tərbiyə məsələlərinə də düzgün istiqamət verilir. Pedaqoq V.A.Suxomlinski deyirdi ki, “yeniyetmələrin tərbiyəsi yalnız özünütərbiyə olduğu zaman baş verir. Özünütərbiyə isə fəaliyyətdə olan insan ləyaqətidir, insanın ləyaqət çarxını hərəkətə gətirən güclü axındır”. Ona görə də, məktəb rəhbərləri, məktəb psixoloqu və sinif rəhbərləri şagirdlərlə fərdi söhbətlərə geniş vaxt ayırır. Onların hər biri böyük tədbirlərə fərdi söhbətlərlə hazırlaşır. Bu da özünün effektiv nəticələrini verir.

Dərs prosesində, sinifdənxaric tədbirlərdə şagirdlərə o da izah olunmalıdır ki, İslam dini bizim xalq kimi formalaşmağımızda çox ciddi rol oynamışdır. Ümumiyyətlə, türk xalqlarının mütləq əksəriyyətinin xalq kimi formalaşmasında da onun təsiri az olmamışdır. Eyni zamanda, biz həm ərəb, həm İran dünyası ilə bağlı olmuşuq. Təsadüfi deyil ki, bizim dilimizdə çoxlu sayda ərəb və fars sözləri işlənir. Yəni İslam dünyasına daxil olan bütün xalqlarla, ilk növbədə, ərəb və farslarla mədəni əlaqələrimiz, həmrəyliyimiz həmişə güclü olmuşdur. Doğrudur, onun sosial, siyasi baxımdan müəyyən münaqişəli tərəfləri də olub, amma bununla yanaşı, İslamın yayılmasında türklərin böyük xidmətləri danılmazdır. Müasir dövrdə də Azərbaycan dövlətinin İslam həmrəyliyində xüsusi yeri vardır. Müsəlman dünyasına qarşı hər hansı konyunktur müdaxilələr olursa, ölkəmiz buna dərhal etiraz edir, öz obyektiv mövqeyini bildirir.

Ötən il Azərbaycanda multikulturalizm ili elan olunmuşdur. Builki həmrəylik ili də onun davamıdır. Dərin kökləri olan türk multikulturalizmi dünyada harmoniya, sülh, əmin-amanlıq kimi başa düşülür. Qədim ənənəyə malik türk multikulturalizmi xalqlar arasında qarşılıqlı əlaqələrə, inteqrasiya meyillərinə xidmət edir və həmrəylik, multikulturalizmə dair tədbirlər onları daha da gücləndirir. Azərbaycan dünyada öz multikulturalizmi ilə xüsusilə fərqlənir. Azərbaycanda keçirilmiş dünya miqyaslı tədbirlərin iştirakçıları bundan ürək dolusu danışırlar.

İslam Həmrəyliyi Oyunları İslam dünyasındakı inkişafa yeni töhfə olacaqdır. Hər bir azərbaycanlı qürur hissi keçirir ki, Beynəlxalq İslam Təşkilatlarının işində fəal iştirak edən Azərbaycan İslam dünyasının birliyində aparıcı rol oynayır. Beynəlxalq yarışların mərkəzi kimi tanınan Bakımız

dünya xalqlarının dillərində dostluq, qardaşlıq, həmrəylik diyarı kimi səslənir. İndi Latın Amerikasından tutmuş Yaponiyaya qədər ən tanınmış qəzetlərdə Azərbaycan haqqında xoş sözlər yazılır. Ümummilli liderimiz Heydər Əliyevin "Azərbaycan dünyaya günəş kimi doğacaq" sözləri həqiqətə çevrilmişdir. İndi Azərbaycan türkcəsi bir çox ölkələr üçün örnək olmuşdur.

Azərbaycanda keçirilən İslam Həmrəyliyi Oyunları ölkəmizin İslam dünyasındakı inkişafa töhfələr verir və İslam ölkələri ilə bizim əlaqələrimizi daha da möhkəmləndirir. Azərbaycanlılar İslamı milli-mənəvi dəyər kimi qoruyur, qısa müddət ərzində ölkəmizdə çoxlu ibadətgahlar və məscidlərin tikilib bərpa olunması da bunu təsdiq edir.

Azərbaycan, Bakı yenə dünyanın nəzərini bizə cəlb etmişdir. IV İslam Həmrəyliyi Oyunları özü də artıq çoxdandır ki, bütün dünyanın diqqət mərkəzindədir. İslam dünyasının bir parçası olan Azərbaycanda yüksək keçirilən bu oyunlar İslam həmrəyliyinə böyük dəstək kimi yadda qalacaqdır.

İslam Həmrəyliyi İli həm də bizim yaddaşımızı təzələyir. Xalqımız milli-mənəvi dəyərləri, milli mənliyini bir daha təsdiq edir, İslam dininin qorunmasının vacibliyini özünə vəzifə borcu bilir. AMEA-nın müxbir üzvü, professor Nizami Cəfərovun sözləri ilə desək: "Biz İslam həmrəyliyini iki mənada başa düşürük. Birincisi, İslam daxilində həmrəylik, ikincisi isə, İslamın dünyada yaratdığı həmrəylikdir. İslam sonuncu din olduğuna görə, həmişə bütün dinlərə humanist münasibət bəsləyib, hörmətlə yanaşıb. Bu gün bütün bunlar Azərbaycan dövlətçiliyinin və ideologiyasının təcrübəsində mövcuddur".

Unudulmamalıdır ki, belə tədbirlər gəncləri mütəşəkkilliyə hazırlayır. Onlara yeni keyfiyyətlər aşılayır. Hazırda uşaqların tərbiyəsi müasir dövrdə ən çətin problemlərdən biridir. Çünki onlar artıq inkişaf etmiş elmi-texnika əsrində yaşayırlar. Onların özlərinə məxsus dünyagörüşü var, televiziya, mətbuat, radio, internet, kino, şeir onların bilik ehtiyatını zənginləşdirmiş, təfəkkürünü inkişaf etdirmişdir. Onların hərəsi bir ailədən gəlmişdir. Buna baxmayaraq, onların düzgün tərbiyəsi üçün daha geniş şərait və imkanlar vardır. Atalarımız yaxşı demişdir: "Ağac yaş ikən əyilər. Onu hansı formada istəyirsənsə yaş ikən o hala salmaq olar". Məktəb heç zaman özünü tərbiyədən kənar qoymamışdır və hətta, bəlkə də, tərbiyə sahəsində üzərinə daha çox yük götürmüşdür. Uşaq elə bir fərddir ki, onun necə tərbiyə olunmasından asılı olmayaraq onda həmişə rasional toxumlar var. Onların hər birində incə hissləri, duyğuları oyatmaqla hər bir uşağın tərbiyəsində müsbət keyfiyyətlərə nail olmaq heç də qeyri-mümkün sayılmır. Böyük pedaqoqlar uşağa inanmağı, etibar etməyi həmişə tövsiyə etmişlər. A.S.Makarenkonun bu sahədəki təcrübəsi bütün dünyaya məlumdur. Ən çətin tərbiyə olunan uşağın da tərbiyəsində müsbət dəyişiklik etmək mümkündür. Bunun üçün ailə və məktəbin vahid tələb, tərbiyə sisteminə ehtiyacı vardır. Deməli, ölkə tədbirləri haqqında valideynlər maarifləndirilməlidirlər.

***Rəyçi: prof. Q.Hüseynov***



# ƏNƏNƏLƏR YAŞAYIR

**Gülcahan Dəmirçiyeva,**
***Gəncə şəhəri, akademik Mehdi Mehdizadə adına 4 nömrəli tam orta məktəbin müəllimi***

Məqalədə 2017-ci ilin Azərbaycanda "İslam Həmrəyliyi İli" elan edilməsi ilə əlaqədar ölkəmizdə aparılan işlərdən, bununla bağlı məktəblərdə keçirilən tədbirlərdən danışılır. Buna nümunə kimi Gəncə şəhər 4 nömrəli tam orta məktəbinin uğurları qeyd olunur.

***Açar sözlər:*** *multikulturalizm, həmrəylik, tolerantlıq, mənəvi tərbiyə, müdriklər.*
***Ключевые слова:*** *мультикультурализм, солидарность, терпимость, нравственное воспитание, мудрые.*
***Key words:*** *multiculturalism, solidarity, tolerance, moral education, wise.*

Azərbaycan təhsili özünün möhtəşəm günlərini yaşayır. Respublikamızda quruculuq işləri, ölkənin iqtisadi-siyasi vəziyyəti öz təsirini təhsil sahəsində də göstərir.

Azərbaycanda multikulturalizm ili xalqımızın tarixi kökündə formalaşmış, tarix boyu xalqımızın yaratdığı elmi-siyasi, ədəbi-mənəvi qaynaqlara söykənmişdir. 2016-cı ilin Azərbaycanda "Multikulturalizm ili" elan olunması bir daha təsdiq etdi ki, doğma vətənimiz tolerant ölkədir və indi də davam etməkdədir. Əsrlər boyu xalqımız bu mənəvi sərvəti birləşdirmiş və başqalarına örnək olmuşdur. Bunlar isə Azərbaycanı bütün xalqların mehriban şəraitdə yaşadığı bir diyara çevirmişdir.

2017-ci ilin "İslam Həmrəyliyi İli" elan olunması da bunun davamı olmuş və öz uğurlu addımlarını atmışdır. Ona görə də dünyanın aparıcı ölkələrində də Azərbaycanda İslam Həmrəyliyi sahəsində aparılan işlərə təqdirəlayiq hal kimi baxılmış, mütərəqqi dünyada təqdirəlayiq iş kimi dəyərləndirilmişdir. İslam Həmrəyliyi Oyunlarında iştirak etmək üçün Azərbaycan 57 ölkədən 6 minə qədər idmançı gözləyir. Ölkəmiz 4-cü islam ölkəsidir ki, bu oyunlara sahiblik edir. 2004-cü ildə Səudiyyə Ərəbistanından start götürmüş İslam Həmrəyliyi Oyunları bu gün estafeti İndoneziyadan alaraq Azərbaycanı ev sahibi etmişdir.

Bu oyunlar bütün dünyanın diqqətini Azərbaycana yönəltmişdir. Ölkənin hər yerində olduğu kimi, Gəncədə də bu abu-hava hökm sürür. Məktəblərimizdə İslam Həmrəyliyi geniş təbliğ olunur, xalqımızın islam mənə-viyyatına sadiqliyinə dair çoxlu faktlar gətirilir. Ulu öndərimiz Heydər Əliyevin: "İslam dini bizim mənəvi dəyərlərimizə daxildir. Onu qorumalıyıq, onun müqəddəsliyinə inamımızı itirməməliyik", sözü tez-tez təkrar olunur.

Prezidentimiz İlham Əliyev 2017-ci ili "İslam Həmrəyliyi İli" elan etməklə tarixdə ilk dəfə olaraq İslam dünyasına siyasi mesaj ünvanladı, birliyə nail olmağın vacibliyinə işarə etdi.

Azərbaycanda əvvəlki illərdə keçirilmiş beynəlxalq tədbirlərdə qazanılmış təcrübə növbəti oyunların daha əzəmətli keçirilməsinə əsaslı təminat verir. Azərbaycana gələn qonaqlar ölkəmizin az müddətdə əldə etdiyi nailiyyətlərlə tanış olur, qədim və zəngin mədəniyyətə malik olan respublikamızdakı durumu, tolerantlıq mühitini yüksək qiymətləndirirlər. Gəncə-lilər də dəfələrlə bunların şahidi olmuşlar. Azərbaycan cəmiyyətinin indiki inkişaf səviyyəsində məktəblərdə aparılan multikultural təlim-tərbiyə artıq təhsilimizin bütün sahələrində özünü qabarıq göstərməkdədir. Gənclərimizin bu ruhda tərbiyə edilməsi öz nəticələrini 2016-cı ilin aprel hadisələrində özünü daha qabarıq büruzə vermişdir. Qarabağ cəbhələrində qəhrəmanlıq göstərənlərin içərisində gəncəlilər də fərqlənmişlər. Onların xatirəsinin əbədiləşdirilməsi sonrakı nəsli də vətən uğrunda mübarizəyə hazırlayır.

İslam həmrəyliyi Azərbaycan xalqını İslam ölkələri arasında tutduğu mövqeyini də möhkəmləndirir. Bütün tarix boyu multikulturalizm, həmrəylik ideyaları ilə nəfəs alan Azərbaycan xalqının böyük oğlu Nizami Gəncəvinin əsərlərində həmrəylik, tolerantlıq qızıl xətlərlə keçir. Gəncəlilər Nizami ənənələri ilə qürur duyur və onu yaşatmaq üçün əllərindən gələni əsirgəmirlər. Son illərdə mədəni quruculuq sahəsində Gəncənin uğurları, gəncliyin arzu və istəkləri ilə tam üst-üstə düşür.

Bakıda keçirilən hər hansı möhtəşəm tədbirlərə Gəncə də dərhal adekvat cavab verir. Gəncə öz böyük qardaşı ilə həmrəyliyini həmişə nümayiş etdirir. Belə bir ruh məktəblərimizdə hazırda da hakimdir. Gəncənin elə bir məktəbi yoxdur ki, bu gözəl ənənələrdən kənarda qalsın. Gəncənin ən qabaqcıl və böyük ənənələri olan məktəblərdən biri də bizim məktəbdir - M.Mehdizadə adına Gəncə şəhər 4 nömrəli tam orta məktəbi. Adlı-sanlı məktəbimiz ötən əsrin ikinci yarısından həmişə öz qabaqcıl mövqeyini qoruyub saxlamışdır. Təlimi Azərbaycan və rus dillərində aparılan bu məktəb Gəncədə əsl tolerantlıq simvolu kimi məşhurdur. Uzun müddət bu məktəbə respublikanın əməkdar müəllimi Əkrəm Əsgərov başçılıq etmişdir. Onu, demək olar ki, bütün ölkə tanıyırdı. Hər yerdə ona hörmətlə yanaşılır, hətta onu indi də öz uşaqlıq adı ilə: “Çingiz müəllim” - deyə xatırlayırlar.

Təsadüfi deyildir ki, indi bu məktəbə çox zaman 4 nömrəli məktəb deyil, “Çingiz müəllimin məktəbi” deyirlər. Müəllimlər də, uşaqlar da onu bu gün də özlərinin “müəllimi” sayırlar. O illərdəki uğurlar yenə də öz səviyyəsində qalır. “Ənənələr möhkəm olur”,- deyənlər yanılmırlar. Bu ənənələr dayanıqlı olmuşdur. Artıq 7-ci ildir ki, bu adlı-sanlı məktəbə Əliağa Səfərəliyev rəhbərlik edir. Məktəbdə həmin ruh olduğu kimi qorunub saxlanılır, dəyişikliklər isə ancaq müsbət səmtə istiqamətlənmişdir.

4 pilləli tam orta məktəb şəhərin ən iri məktəblərindəndir. Burada 2500 uşaq təhsil alır. Onların 1100-ü Azərbaycan bölməsində, 1400-ü rus bölməsində təhsil alır. Uşaqlar da, valideynlər də məktəbi öz doğma evi bilirlər. Məktəb şagirdlər kimi valideynləri də gözəl məqsədlərə doğru yönəldir. Onlar bilirlər ki, onların uşaqları bu möhtəşəm təhsil ocağında qayğı və tələbkarlıqla əhatə olunmuşdur. Rus bölməsində oxuyan uşaqlar Azərbaycan dilini həvəslə öyrənirlər. Son vaxtlar rus bölməsini qurtaranların ali məktəbə qəbul vaxtı Azərbaycan dilindən imtahan verməsi onları qətiyyən

qorxutmur. Onlar buna çoxdan hazırdırlar. Qəbul imtahanlarının nəticələri də bunu təsdiq edir. Yalnız ötən il 100-dən çox şagirdimiz Azərbaycanın və dünyanın ən tanınmış ali məktəblərinə qəbul olunmuşdur. Onların böyük əksəriyyəti 600-dən çox bal toplamışdır. Məzunlarımız əsl vətəndaş kimi yetişirlər: XXI əsrin vətəndaşı! Gənclərin elmdə, təhsildə, o cümlədən idman sahəsindəki uğurları onları ardıcıl izləyənləri də ruhlandırır. Belə qələbələrdə bizlərin də payı vardır. Ölkədə keçirilən respublika və beynəlxalq səviyyəli tədbirlər gənclərin həyata pozitiv köklənmələrinə kömək edir. Xalqımızın böyük ədib və şairlərinin, pedaqoqlarının, bir sözlə müdriklərin vəsiyyət və tövsiyələri təhsilalanların böyük amallara doğru irəliləməsinə yol göstərmişdir.

Məktəbimizin kadr potensialı da güclüdür. Demək olar, bütün müəllimlər ali təhsillidir. Onlardan 3-ü respublikanın “əməkdar müəllim”idir. 2 nəfər “Tərəqqi” medalına layiq bilinmişdir. Məktəbimiz 2 dəfə “İlin ən yaxşı məktəbi” statusunu qazanmışdır. 6 nəfər “Ən yaxşı müəllim” müsabiqəsinin qalibi sayılmışdır.

Müəllimlərin 60 faizdən çoxu gənclərdir. Məhz onların iştirakı və fəal köməyi ilə tez-tez uğurlarımızı nümayiş etdirən sərgilər təşkil olunur, bu sərgilərə valideynlər də dəvət olunur. Rus icmasının Gəncə şəhər bölməsi məktəbə ən tez-tez gələn qonaqlardandır. İslam həmrəyliyi ilində belə görüşlərin sayı daha da çoxalmışdır. Hər dəfə şəhərin ziyalıları bu əzəmətli binaya daxil olanda nastalji hisslər keçirirlər. Məktəbin rəhbərliyi pedaqoji kollektivin üzvlərinə bu durumu saxladıqları üçün “sağ ol”,-deyirlər.

Məktəbin məzunları şəhərə gələn kimi məktəbə gəlirlər, müəllimlərlə, uşaqlarla görüşürlər. İşlədiyi ölkələr, şəhərlər haqqında uşaqları məlumatlandırırlar. Hamısının da son sözü birdir: Azərbaycanı sevin, ölkəmizin uğurları ilə fəxr edin, öz əməyinizlə Azərbaycana baş ucalığı gətirin!!!

Məktəbimizin gəncləri böyük arzularla yaşayır. Bu arzular Azərbaycanın gündəlik uğurları ilə böyüyür və reallaşır. Onlar bilirlər ki, Azərbaycanın gələcəyi gənclərin həyatda tutacaqları mövqe ilə ayrılmaz tellərlə bağlanır. Onlar sağlam, hərtərəfli biliyə malik, vətənpərvər gənclər kimi yetişməlidirlər ki, Vətənimizə dayaq olsunlar.

***Rəyçi: dos. N.Nəcəfov***

**Г.Демирчиева**

**Традиции живы**

**Резюме**

2017 г. обьявлен годом “Исламской солидарности”. В статье говорится о проделанных работах и проведенных мероприятиях связанных с этим болышим событием. К примеру приведены успехи школы №4 г. Гянджа.

**G.Damirchiyeva**

**Traditions live**

**Summary**

In the article it is spoken about the declaration of “Islamic Solidarity” in Azerbaijan in 2016 and about the school events concerning to these issues. As an example the achievement of school № 4 in Ganja is shown.



# MİLLİ PEDAQOJİ İRSİMİZDƏN SƏHİFƏLƏR

**Mehriban Şirzadova,**
***pedaqogika üzrə fəlsəfə doktoru***

*"Tərbiyə məsələsi insaniyyət aləmində ən ali və ən mühüm məsələdir. İnsanın xoşbəxtliyi və ya bədbəxtliyi məhz tərbiyənin yaxşı və ya yamanlığından asılıdır"*

***S.M.Qənizadə***

***Açar sözləri:*** *S.M.Qənizadə, körpə uşaqlar, "Rəhbər" jurnalı, övlad tərbiyəsi, "insan əşrəfi məxluqatdır".*

***Ключевые слова:*** *С.М.Генизаде, младенцы, журнал "Рахбер", воспитание ребенка, дети бесценное сокровище.*

***Key words:*** *S.M.Ganizadeh, babies, "Rehber" journal, child nurture, precious human beings.*

Müxtəlif dövrlərdə yaşamış böyük şəxsiyyətlər kimi S.M.Qənizadə də insanı məxluqatın, yəni yaradılmışların əşrəfi olan, Xaliqin ən gözəl əsərinə müraciət etmiş, bu sahədə qələmini sınamışdır. Onun fikrinə görə məxluqat öz növlərinə, cinsinə, çeşidinə görə aşağı-yuxarı qrup bənzərliklərə və özəlliklərə malikdir.

Şərq məntiq elmində insanın belə bir tərifi vardır: "İnsan-heyvani-natiq"dir, yəni insan danışan heyvandır. Buradakı "heyvan" sözü bizim anladığımız mənada deyil, diri olan, yaşayan, canlı mənalarında, hər zaman diri olan həyat sahibi, həm də həyat verən, can verən anlamındadır. İnsan özünün ağlı, şüuru, nəfsi, nitqi, təfəkkürü, təxəyyülü, əməyə münasibəti və digər keyfiyyətləri ilə başqa canlılardan seçilir.

Bütün bunlara görədir ki, bəşər cəmiyyətinin müxtəlif dövrlərində yaşamış böyük şəxsiyyətlər, mütəfəkkirlər, alimlər, şair və yazıçılar, müəllim və maarifçilər özlərinin dini, siyasi, fəlsəfi və pedaqoji baxışlarından asılı olmayaraq öz yaradıcılıqlarında insanların təlimi, tərbiyəsi və təhsili ilə daim maraqlanmış və bu sahədə orijinal fikirlər söyləmişlər. Bu gün də əhəmiyyətini saxlayan bu fikirlər içərisində körpə uşaqların tərbiyəsi mərkəzi yer tutur.

Məşhur "Əxlaqi-Nasir" əsərinin müəllifi, dərin zəka sahibi, Azərbaycan məktəb və pedaqoji fikir tarixinə qocaman Şərqin əxlaq nəzəriyyəçisi kimi daxil olmuş Nəsirəddin Tusi (1201- 1274), elmi- pedaqogikanın korifeyi hesab edilən, yetişməkdə olan gənc nəslin həyatını müvafiq yaşlar üzrə dövrlərə bölən və bu yaş dövrlərində müvafiq təlim və tərbiyə verilməsini elmi-pedaqoji cəhətdən əsaslandıran məşhur çex pedaqoqu Y.A.Komenski (1592- 1670) özünün 1638-ci ildə yazdığı "Ana məktəbi" (buna bəzən "ana qucağı məktəbi" də deyirlər. - M.Ş.) adlı məşhur əsərində bu məsələni geniş şəkildə işıqlandırmışdır. "Ağ

lövhə” nəzəriyyəsinin banisi Con Lokk (1632- 1704) “Tərbiyə işləri” adlı məşhur əsərində insan şəxsiyyətinin formalaşmasında körpə uşaqların tərbiyəsinin həlledici rolunu təsdiq etmişdir.

Xəyali sosialistlərin tanınmış nümayəndəsi olan R.Ouen (1771-1858) “Xarakterin təşəkkülü” adlı əsərində, bütün bədbəxtliklərin səbəbini ata-babaların avamlığında, onların pis tərbiyəsində görürdü.

“İnsanı insan mərtəbəsinə çatdırmaq istəyən” məşhur fransız filosofu və maarifçisi J.J.Russo (1712- 1778), XVIII əsrin sonlarında Avropada (əsasən Almaniyada) meydana gəlmiş mütərəqqi pedaqoji cərəyan olan filantropizmin tanınmış nümayəndəsi, “tərbiyənin başlıca məqsədi uşaqları ictimaifaydalı əməyə, vətənpərvərlik və xoşbəxtlik həyatına hazırlamaqdan ibarət olmalıdır”, - fikrinin müəllifi İ.B.Bazedov (1723- 1790), “Körpə uşaqlar tərbiyəsi” adlı pedaqoji traktatın müəllifi, tanınmış Azərbaycan pedaqoqu və maarifçisi Sultan Məcid Qənizadə (1866-1942) və onlarla başqaları körpə uşaqların tərbiyəsi, başqa sözlə desək, məktəbəqədər tərbiyə pedaqogikasının bir sıra elmi-pedaqoji və nəzəri məsələlərinə aid dəyərli fikirlər söyləmişlər.

S.M.Qənizadənin mühüm xidmətlərindən biri onun o zamankı dövrü mətbuatda pedaqoji mövzularda silsilə məqalələrlə çıxış etməsidir. Onun yaradıcılığında mühüm yer tutan məqalələrdən biri də aşağıda haqqında ətraflı bəhs edəcəyimiz “Körpə uşaqlar tərbiyəsi” adlı məqaləsidir. Mütərəqqi ideyalarla zəngin olan və bu gün də öz təravətini saxlayan həmin məqalə ardıcıl olaraq “Rəhbər” jurnalının dörd nömrəsində, 1906-cı ildəki 2,3,4 və 1907-ci ildəki 5-ci nömrələrində çap olunmuşdur. “Rəhbər”- 1906-1907-ci illərdə Bakıda nəşr edilən ilk pedaqoji jurnaldır. Jurnalın redaktoru dövrünün tanınmış maarifçisi Mahmudbəy Mahmudbəyov idi. Jurnalın ətrafında S.M. Qənizadə, M.Ə.Sabir, A.Səhhət, F.Köçərli və bu kimi tanınmış pedaqoqlar toplanmışdır. Jurnalda çap olunan məqalələr arasında uşaqların tərbiyəsi ilə bağlı yazılar mərkəzi yer tuturdu. Sovetlər hakimiyyəti illərində bu məqalələrin elmi-pedaqoji dəyərləri nəzərə alınaraq müəyyən ixtisarla “Füqəra Füyuzatı” jurnalında yenidən nəşr edilmişdir. S.M.Qənizadənin “Körpə uşaqlar tərbiyəsi” adlı məqaləsindən bəhs edən S.M.Qənizadə yaradıcılığının tanınmış tədqiqatçısı professor X.Məmmədov yazır: “Pedaqoq yazıçının uşaq tərbiyəsi mövzusuna müraciət etməsi hər şeydən əvvəl onun bir vətəndaş kimi vətənin gələcək tərəqqisi, həmvətənlərinin hərtərəfli inkişafı haqqında qayğı və düşüncələrindən irəli gəlirdi”(1). Məqalədə müəllifin məqsədi, onun bütün qayəsi-mənəvi və fiziki cəhətdən sağlam nəsl yetişdirmək ideyası öz əksini tapmışdır.

S.M.Qənizadə körpə uşaqların-məktəbəqədər yaşlıların tərbiyəsinin təbii yollarını, bu yaşlı uşaqların əqli, əxlaqi, mənəvi, fiziki, hissi tərbiyəsinin forma və metodlarını çox dəqiq göstərmişdir.

Yeri gəlmişkən qeyd edək ki, 1989-cu ildə Moskvada rus dilində nəşr olunan ilk “Azərbaycan SSR pedaqoji fikir antologiyası”nın tərtibçiləri Ə.Ağayev ilə Ə.Həşimov məqalənin mühüm elmi və pedaqoji əhəmiyyətini nəzərə alaraq həmin məqaləni oraya daxil etmişlər. Professor H.M.Əhmədov tərəfindən həmin kitaba təqdim edilən bu məqalə ilk dəfə rus dilində məhz bu kitabda çap olunmuşdur (2). Son vaxtlar üç cilddən ibarət nəzərdə tutulan “Azərbaycan pedaqoji Antologiyası”nın ikinci cildinin tərtibçisi akademik H.Əhmədov həmin məqalələrin elmi-pedaqoji məziyyətlərini nəzərə alaraq

onu müəyyən ixtisarla həmin kitaba daxil etmişdir (3).

S.M.Qənizadənin bəhs etdiyimiz məqaləsi bu sözlərlə başlayır: "Körpə uşaqlara pərvəriş vermək xüsusunda indiyədək Azərbaycan dilində ədəbiyyat yoxdur və əgər xırda- para məktubat varsa da, o qədər deyilki təcrübəsiz ata- analar haman yazılardan məlumat hasil edib işdə öz balalarını bəsləyə bilsinlər" (4). Həqiqətən də əvvəlki əsrlərdə olduğu kimi XX əsrin əvvəllərində də uşaqların tərbiyəsi məsələsi ayrıca əhəmiyyət kəsb edirdi. Lakin valideynlərin əlində tibbi və pedaqoji cəhətdən rəhbər ola biləcək müvafiq ədəbiyyat yox idi. Uşaqların tərbiyəsində köhnə üsullardan, elmi-pedaqoji cəhətdən zərərli yollardan istifadə edilirdi ki, bu da xeyirdən çox zərər verirdi. Türkəçarə məsələsi hələ artacaq gücdə idi. Tərbiyə işində bizim böyük bədbəxtliyimiz onda idi ki, canımızın riştəsi ifritə qarılar külfünə bağlı idi.

Müəllif yazır: "Ümumən müsəlmanlar arasında, ələlxüsus biz Qafqaz türkləri arasında qapıya gələn hər bir qarı nənə loğmanlıq iddiası ilə əlin salıb öz dağarcığından hər nə çıxardırsa, can tiryəki deyib qəbul edəriz... Belə cəhalət səmərəsindən Allah bilir nə qədər canlar tələf olubdur, nə qədər gözlər kor və nə qədər qulaqlar kar olubdur?! Bimürvət türkəçarələrin bidadlığına ələlxüsus bitəcrübə ata-analar uyuböz övladların bədbəxt edirlər" (5).

Bütün bunlara qarşı çıxan və insanı "əşrəfi-məxluqat" adlandıran müəllif tərbiyəni uşağın bütün müvəffəqiyyətlərinin rəhni hesab edirdi.

Böyük maarifçinin fikrincə əslində tərbiyə məsələsi insaniyyət aləmində ən ali və ən mühüm məsələdir. Belə ki, insanların gələcək xoşbəxtliyi və ya bədbəxtliyi məhz tərbiyənin vaxtında və düzgün, məqsədyönlü verilib-verilməməsindən asılıdır.

S.M.Qənizadə şəxsiyyətin formalaşmasında tərbiyənin rolunu belə yüksək qiymətləndirərkən özünün çoxillik və məhsuldar pedaqoji təcrübəsi ilə yanaşı, həm də, müsəlmanların müqəddəs "Qurani-Kərim" kitabındakı məşhur kəlamlara istinad edirdi. O yazır: "Xudayi-Əzim Əlişan Qurani-Şərifdə buyurur ki, ata-analar üçün dünya və axirətdə övlad ən faxir zinətdir", yəni istər bu dünyada olsun, istərsə də axirətdə ata-analar üçün övlad ən qiymətli zinətdir.

Burada məqsəd insanı müdrikləşdirmək, onun ruhunu paklaşdırmaq, əxlaqını kamilləşdirmək, davranış və əməllərini salehləşdirməkdir. "Qurani-Şərif"də insanın bir məxluq kimi zəif xəlq olduğu və bu səbəbdən də tərbiyəyə, ailə qayğısına möhtac olduğu dəfələrlə qeyd edilmişdir. İslamın nəzərində ailə səadəti dünyəvi xoşbəxtlik və səadətlərin ən böyüyüdür. Bütün bunları mülahizə edən müəllif çox haqlı olaraq belə qənaətə gəlir ki, övlad ən böyük nemətdir və bu səbəbdən də valideynlər bu yolda, bu işdə daim çalışmalıdırlar. Bu vəzifə, yəni valideynin öz uşaqlarının tərbiyəsi ilə daimi, hər zaman ciddi-cəhdlə məşğul olması onun valideynlik vəzifəsindən başqa, həm də dini borcudur. Belə ki, balalarının tərbiyəsi işində laqeydlik göstərən valideynlər istər bu dünyada, istərsə də axirətdə hər şeydən məhrum olacaqlar. Müəllifin ilk öncə gəldiyi ilkin nəticə belədir: "Övlad həyat səmərəsidir. Hər bir təklifdən əvvəl övlad tərbiyəsi irəlidir".

Müəllif yazır ki, təbii ki, hər bir ata-ana öz övladının xoşbəxtliyini arzu edib, tərbiyəsinə şükürlər edərlər, lakin yalnız arzu etmək və ya şükür etməklə iş bitməz,

ata- ananın məsuliyyəti azalmaz. Belə ki, heç bir arzu əməlsiz, yəni fəaliyyətsiz nəticə verməz. Lazımsız fəaliyyət isə həmişə xəta ilə nəticələnər. Bütün bunlardan sonra müəllifin gəldiyi digər bir nəticə isə belədir: “Tərbiyə işi çətin işlərdən biridir ki, onu doğru yol ilə icra etmək üçün elm və təcrübə lazımdır”.

“Elmin zorunu inkar etmək olmaz”, - fikrinə istinad edən müəllif pedaqoji elmləri, tərbiyənin gücünü bağbanlıq elminin gücü ilə müqayisə edir və göstərir ki, əgər bağbanlıq elminin gücü ilə üç il müddətinə körpə ağaclardan iri və dadlı meyvələr yetişdirmək mümkün olduğu halda, elmsiz bağbanlar on beş il ərzində belə meyvələr yetişdirə bilmirlər. Beləliklə, elmli bağbanın məhsulu elmsiz bağbanın məhsulundan fərqli olursa, aşkar məsələdir ki, elmli ata-ananın övladı da nadan ata-ananın övladından həm əqli, həm də fiziki cəhətdən gözəl olur.

Bu fikir Azərbaycan xalq maarifinin görkəmli simalarından olan Səfərəlibəy Vəlibəyovun (1861- 1902) Cənubi Qafqaz məmləkətlərinin müftisi Mirzə Hüseyn Əfəndi Qayıbov və Şeyxülislam Axund Mirzə Hüseyn Tahirovun xeyir-duası əsasında 1888-ci ildə Tiflisdə nəşr etdirdiyi “Qüdrəti- xuda” yəni “Allahın qüdrəti” adlı əsərində də özünə yer tutub. Orada deyilir: yadda saxla ki, tanıdığın adamlardan biri - Rəşid pəhləvan da anadan doğulanda sənin kimi zəif, cahil bir məxluq idi. İşıqlı dünyaya gələndə heç şeyi bilmirdi, doğrunu yalandan, yaxşını yamandan seçə bilmirdi, fərq qoymurdu. Lakin onun qüdrətli bir pəhləvan, alim-fazil, kamil olmasına səbəb təlim-tərbiyə, təhsil, elm-fənn kitablarını qiraət etməsi oldu. Elm onda olan batini qüvvələri günü-gündən açıb artırdı, əqlini və dərrakəsini artırıb uca dərəcəyə çatdırdı. Bütün insanlar belədir. Dünyaya gələn hər bir kəs elmin gücü ilə əqlini və dərrakəsini inkişaf etdirər, istedad və qabiliyyətini büruzə verər. Bütün məxluqatın, yəni canlıların əşrəfi, ən alisi, daha şərəflisi, ən əzizi olan insan bunlara qadirdir (6).

Məhz buna görədir ki, bütün canlılardan daha fəzilətli və üstün, daha şərafətli və əziz olan insanın tərbiyəsinin də diqqət mərkəzində olması təbiidir.

Məlum həqiqətdir ki, uşaqların tərbiyəsi ilk öncə atalıq və analıq şərəfinə nail olan valideynlərdən asılıdır. Körpə uşağın qayğısına qalmaq, onu bəsləmək işində səhvə, qüsura, uğursuzluğa yol vermək olmaz. S.M.Qənizadənin fikrincə, insan övladı ən bahalı, ən qiymətli, ən dəyərli cövhərdir ki, onun tərbiyəsi ilə məşğul olanın öz sənətində mahir olması, tərbiyə işində külli məlumata malik olması gərəkdir. Bu məsələyə diqqəti daha çox cəlb edən mahir pedaqoq yazırdı: “İnsan elə bir cövhərdir ki, qiyməti çox gərənbahadır (yəni çox bahalıdır- M.Ş.). Gərənbaha cəvahirə heç bir naşı ustad, əgər insafı varsa, əl vurmaz. Necə ola bilər ki, tərbiyə işində naşı olan ata-analar insan kimi gərənbaha cövhərə biməhaba (yəni qorxusuz M.Ş.) əl uzadalar...?”

Müəllif naşı ata-ananın işini naşı ustanın işi ilə müqayisə edir və belə qənaətə gəlir ki, əgər qiymətli bir metal naşı ustanın əlində pis və zay olarsa, usta o qədər də qəm etməz. Lakin Allah eyləməsin, naşı tərbiyəçi əlində insan zay olarsa, dünyada fəsad baş verər.

İnsanın ürəyini, ruhunu, mənəviyyatını bərbad edənlər kor-koranə ox atana, kəbə evinə natəmiz ayaq basanlara bənzərlər. Bəşər tarixində hər bir iş, hər bir sənət tədriclə inkişaf edib, müvafiq mər-

hələyə çatdığı kimi, tərbiyə işi də əsrlər, qərinələr boyunca imtahandan çıxıb, təcrübə işində sınaqdan keçib və nəticə etibarilə zəmanəmizdə bu dərəcəyə yetişmiş, yəni tərbiyə bir elm sahəsi olan "pedaqogika" adı ilə formalaşmış, S.M.Qənizadənin fikrincə "bəlkə də bütün elmlərin mərkəzi mənziləsində yer tutmuşdur". Odur ki, hər bir millət körpə uşaqların tərbiyəsini daim diqqət mərkəzində saxlayır. Bunu da nəzərə alaq ki, bu dünya axirət üçün bir ziyarətgahdır, bu dünyada hansı bir əməlin sahibi olarıqsa, axirətdə də bu əməlin səmərəsini görəcəyik.

Beləliklə, axirət səadəti dünya işlərinə bağlı olduğu kimi, dünya işləri də məhz tərbiyə işinə möhtacdır.

Odur ki, istər bu dünya, istərsə də axirət səadəti insanların fiziki və mənəvi tərbiyəsi ilə bilavasitə bağlı olduğundan tərbiyə haqqında elm olan pedaqogikanın zəruri müddəalarını bilmək bütün valideynlər üçün zəruridir.

***Rəyçi: prof. H.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat:


1. Məmmədov M. Sultan Məcid Qənizadə. Bakı-Yazıçı, 1983.
2. Анталогия педагогической мысли Азербайджанской ССР. Москва, 1989.
3. Azərbaycan pedaqoji Antalogiyası. II cild. Bakı, 2011.
4. "Rəhbər" jurnalı, 1906, №2.
5. "Rəhbər" jurnalı, 1906, №4.
6. Səfərəli bəy Vəlibəyov. "Qüdrəti xuda". Tiflis, 1888. Transliterasiya və faksimeliye. 2009.
7. Şirzadova M. S.M.Qənizadə yaradıcılığında məktəbəqədər tərbiyə məsələləri, Bakı, 2013.


**М.Ширзадова**

**Страницы из национально-педагогического наследия**

**Резюме**

В статье анализируется высказывания известного педагога и просветителя Азербайджана С.М.Ганизаде (1866-1937), методы и сущности воспитания детей раннего возраста, которые были опубликованы в журнале «Рахбар» в 1906 и 1907 гг. под названием «Воспитание детей раннего возраста».

**M.Shirzadova**

**From the study of national pedagogy**

**Summary**

The article analyzes the statements of the famous teacher and educator of Azerbaijan S.M.Ganizadeh (1866-1937), Metgods and the essence of the upbringing of young children, which were published in the journal Rahbar in 1906 and 1907 entitled «Education of young children».



# AZƏRBAYCAN UŞAQ MƏTBUATININ TARİXİNDƏN

**Fərqanə Məlikova,**
***Bakı Slavyan Universitetinin doktorantı***

***Açar sözlər:*** *uşaq mətbuatı, maarifləndirmə, jurnalistika, təhsil, mədəniyyət.*
***Ключевые слова:*** *детские средства, просветление, журналистика, образование, культура.*
***Key words:*** *child press, enlightenment, journalism, education, culture.*

XIX əsrdə ölkədə baş verən əlamətdar hadisələrdən biri məktəb və maarif sahəsində canlanma və yeni üsullu məktəblərin açılması idi. Belə ki, Cənubi Qafqaz Rusiya tərəfindən işğal edildikdən sonra 1829-cu ildə Zaqafqaziya məktəblərinin ilk nizamnaməsi təsdiq edildi. Bu, Şuşa, Gəncə, Şəki, Şamaxı, Bakı, Naxçıvanda yeni tipli məktəblərin açılmasına imkan verdi. Tədris proqramına Azərbaycan dili də daxil edilən bu məktəblərin sayının əsrin sonuna doğru çoxalmağa başlaması ziyalıları ana dili fənninin tədris keyfiyyətini daha da yaxşılaşdırmaq üçün hərəkətə gətirdi. Belə mühüm vəzifənin həllini çətinləşdirən cəhətlərdən biri çarizmin yerlərdə maarif və təhsildə ana dilində dərslik və kitabların yaradılmasına hər vəchlə mane olmağa çalışması idi.

Maarifçilik hərəkatını doğuran sosial-mədəni səbəblər məscid məktəblərini əvəz edən yeni üsullu məktəblər və onlara uyğun dərsliklər, tədris vəsaitlərinin yaranmasına gətirib çıxartdı. Həmin hərəkatın qabaqcıl nümayəndələrindən olan Həsən bəy Zərdabinin əsasını qoyduğu “Əkinçi” qəzetinin səhifələrində mövcud məktəb və dərs kitablarının yararsızlığı göstərilirdi. Məsələn, “Əkinçi”də bu barədə oxuyuruq: “Biz məktəbxanada oxunan “Leyli-Məcnun”, Hafiz və qeyrə uşaq kitabı deyil. Onları ki böyük oxuyanda şura gəlir, uşaq başına nə kül töksün onları oxuyub eşqbaz, cürəkeş olmasın nə bir də bizi oxudanda məhz oxuyub yazmağı, öyrədirlər və dəxi səy edən yoxdur ki, bir xeyri olan şey də öyrətsin...”.

XX əsrin əvvəllərində bu ideyalarla mübarizə aparan xalqın mədəni hərəkatı həm də siyasi məzmun kəsb etməyə başladı. Ümumiyyətlə, XX əsrin əvvəllərindən başlayaraq maarifçilik hərəkatı özünü getdikcə yeni məzmun və keyfiyyətdə göstərməyə başladı; yəni əgər əvvəllər ancaq mollaxanaların əvəzinə məscid məktəbləri açılmasından, dərs kitablarının yararsızlığından söhbət gedirdisə, bu dövrdə artıq yeni məzmunlu dərsliklərin hazırlanması və s. günün vacib məsələlərindən biri kimi qarşıya qoyulurdu. Təsadüfi deyil ki, 1905-1907-ci illər inqilabından qorxuya düşən çar hökumətinin verdiyi 17 oktyabr manifesti milli dillərdə qəzet və jurnalların nəşrinə də imkan yaratdı.

Əgər XIX əsrin sonlarında, “Kəşkül” öz nəşrini dayandırdıqdan sonra Azərbaycan ziyalılarının milli mətbuat, o cümlədən uşaq mətbuat orqanları açmaq təşəbbüslərinin qarşısı alınırdısa, 17 oktyabr manifesti ilə hökumətin həmin maneə imkanları xeyli zəiflədi, “Şərqi-Rus”, “Həyat”, “İrşad”, “Molla Nəsrəddin”, “Füyuzat” və s. ilə yanaşı “Dəbistan”, “Rəhbər”, “Məktəb” adlı uşaq jurnalları da meydana çıxdı. Bu işdə XIX əsrin ortalarından başlanan mədəni maarifçilik, cəddidizm hərəkatı da öz rolunu oynamışdı.

İnqilabdan sonra əhalinin maariflənməsi üçün mətbu orqanların zəruriliyini nəzərə alan ziyalılar məhdud imkanlarla da olsa, yeni qəzet və jurnalların nəşrinə çalışırdılar. Qarşıda duran məsələlərdən biri də yeni üsullu məktəb, yeni tələblər səviyyəsində uşaq əsərlərinin yaradılması idi. Əhalinin geniş kütlələrini maarifləndirib, onlarda biliyə maraq oyatmaq üçün həmin məqsədə xidmət edən nəşrlərə tələb getdikcə artırdı. 1906-cı ilin avqust ayında Həsən bəy Zərdabi və Nəriman Nərimanovun, 1907-ci ildə isə Əli bəy Hüseynzadə və Mahmud bəy Mahmudbəyovun rəhbərliyi ilə Bakıda müəllimlərin birinci və ikinci qurultayı keçirildi (1). Hər iki qurultayın müzakirəsinə çıxarılan problemlərin həllinə nail olmaq üçün pedaqoji və metodiki istiqamətli mətbu orqanların nəşri də vacib idi. Müəllimlər qurultayından bir qədər əvvəl 1906-cı ilin 16 aprelində nəşrə başlayan “Dəbistan” jurnalı da belə bir zərurətdən yaranmışdı. Müəllimlər qurultaylarından sonra “Birinci il”, “İkinci il”, “Yeni məktəb”, “Uşaq gözlüyü”, “Gülzar”, “Ana dili”, “Ədəbiyyat məcmuəsi” və s. dərsliklər də hazırlanıb çap edildi.

Milli uşaq mətbuatımızın əsasının qoyulduğu “Dəbistan”ın çıxdığı üç il ərzində (1906-1908) jurnalın 27 nömrəsi çap edilmişdir. Ayda iki dəfə çıxan jurnalın 1907-ci ildə cəmi 8 nömrəsi işıq üzü görmüşdür. Jurnalın 1908-ci ildə çıxan yeganə nömrəsi milli mətbuatımızın banisi, 1907-ci ildə vəfat etmiş "Dəbistan"ın müxbiri Həsən bəy Zərdabinin xatirəsinə həsr edilmişdir.

"Dəbistan"ın naşir və redaktorları ibtidai sinif müəllimləri Əliisgəndər Cəfərzadə və Məhəmmədhəsən Əfəndizadə idi. Sonradan isə bu işləri Ə.Cəfərzadə təkbaşına görmüşdür.

“Dəbistan”ın ilk proqram yazısında deyilirdi: “Hal-hazırda qeyri lisanlarda olan kitablara nisbətən öz ana dilimizdə ən əlzəm dərs kitabları və əldə qiraət ediləcək kitabçalar tapmıyoriz. Bu səbəbə bizim xahişimiz budur ki, təb və nəşrinə başladığımız uşaqlara məxsus “Dəbistan” jurnalı vasitəsi ilə bu yolda qüvveyi-acizanəmizdən gələn qədər türk milləti - nəcibəmizin balalarına bir xidmət göstərək. Və ümidimiz budur ki, millətimizin balalarının lap uşaqlıqdan əql, zehin, əxlaqi-hüsn və hissiyyatların oyandırıb, günbəgün tərəqqi etmələrinə səbəb olaq, onlardan zəhmətkeş, millətpərəst və vətənpərvər cavanlar yetirək” (11, 1906, №1).

Jurnalın məqsəd və məramnaməsi başlıqdan da aydın şəkildə görünür. "Dəbistan"ın ətrafına bir çox ziyalıların, məktəb müəllimlərinin toplanması onun öz məramını istənilən səviyyədə həyata keçirməsini təmin edən amillərdən idi. Maraqlıdır ki, “Dəbistan”da çıxış edən müəlliflərin hər biri onun ideya-mövzu istiqamətini hökmən nəzərə alırdı. Məsələn, inqilabi satirik şair Mirzə Ələkbər Sabirin uşaq jurnallarında çap edilən şeirlərindən danışarkən Əziz Mirəhmədov onların şairin satiralarından fərqi haqda yazırdı: “Əgər o əsərlərdə şair fikrin, hissin kəskin, qatı və əlvan lövhələrlə

ifadəsinə çalışırsa, burada hər şeydən əvvəl, uşaqların təbii, həyati zövq və marağını oxşayan səhnələri ilk planda canlandırmağa çalışır. Təbiidir ki, burada nəsihət, didaktika, tərbiyə şərtləri nəzərdə tutulur” (6). Onun “Məktəb şərqisi” şeirin-də oxuyuruq:

Məktəb, məktəb, nə Dilgüşasən,
Cənnət, cənnət desəm səzasən;
Şadəm, şadəm təfərrücündən,
Əhləq, əhləq, gözəl binasən!-

Göründüyü kimi, şeirin dili aydın və məzmunu uşaqların yaş səviyyələrinə uyğundur.

Məlum olduğu kimi, “Dəbistan” jurnalına əlavə kimi “Valideynlərə məxsus vərəqə” də çap olunurdu. Bu haqda jurnalın “İfadeyi-məram”ında oxuyuruq: “Bundan əlavə aylıq valideynlərə məxsus vərəqəmiz ata, analarımıza uşaqlarımızın ev və məktəb tərbiyəsi, təlimi üçün lazım olan əhəmiyyətli məsələləri həll edib bu yolda onlardan ötrü rəhbər və dəlil olasıdır” (11, 1906, № 1).

“Dəbistan” azyaşlı oxucular və onların valideynlərində milli ədəbiyyata marağı artırmaq məqsədi ilə elan etdiyi müsabiqələrlə bağlı səhifələrdə məktublar, redaksiyaya gələn cavablar, nağıllar, tapmacalar dərc edirdi. Suallara, tapmacalara düzgün cavab tapan uşaqlara isə hədiyyə olaraq üç ay ərzində jurnalın nömrələri pulsuz göndərilirdi. Jurnalın hər nömrəsinin sonunda ərəb və fars dillərində olan anlaşılmayan sözlərin mənalarının lüğəti verilirdi.

Jurnal çıxdığı ilk aylardan çətinliklərlə üzləşmiş, maddi baxımdan vəziyyət getdikcə zəifləmiş, abunəçiləri və alıcıları azalmışdır. Redaktor Əliiskəndər Cəfərzadə qəzetə abunəçilərin getdikcə azaldığını görür və bütün cəhdlərə baxmayaraq 1908-ci ildə “Dəbistan”ın nəşrini dayandırır.

“Dəbistan”la eyni ildə əsası qoyulmuş ən qısaömürlü uşaq mətbuatından biri də “Rəhbər” jurnalıdır. Jurnalın 1906-cı ildə 4, 1907-ci ildə isə 5 nömrəsi çıxmışdır. Redaktoru Mahmud bəy Mahmudbəyov olan “Rəhbər”in ilk nömrəsində “İfadeyi-məram” adlı baş məqalədə jurnalın məqsədi bu cür səciyyələndirilir:

“Yaşadığımız əsr bir əsrdir ki, müntəzəm məktəbi, milli ədəbiyyatı, müəyyən məsləkdə ictimai məişəti və hər cür iqtisadi mücadiləyə hazırlığı olmayan millət məişət mücadiləsində tez-gec məhv olasıdır...Pəs hər bir millət ki, öz milliyyətini, dilini itirib yox olmaq istəmir, gərəkdir məktəblərinin müntəzəm olmasına, ədəbiyyatının sərvətlənməsinə, ədəbiyyatı vasitəsi ilə milliyyətini tanımağa və millətinin ictimai işlərinin vüsətlənməsinə çalışsın...” (13, 1906, №1).

Jurnal yeniyetmələrin təlim və tərbiyəsinə, zehni inkişafına istiqamət vermək, onları xalqa və vətənə məhəbbət ruhunda tərbiyə etmək, vətənpərvərlik və qəhrəmanlıq duyğularının aşılanması istiqamətində rəhbərlik edirdi.

Milli uşaq mətbuatının yeni mərhələsi kimi dəyərləndirilən daha uzunömürlü uşaq mətbuatı “Məktəb” jurnalının əsası 1911-ci ildə Qafur Rəşad Mirzəzadə tərəfindən qoyulmuşdur. “Məktəb” iki həftədə bir dəfə işıq üzü görürdü. Jurnal uşaqların yaş dövrlərini nəzərə alır, həm kiçik, həm də böyük yaşlı uşaqlar üçün əsərlər nəşr edirdi. “Məktəb” jurnalının istiqaməti haqqında baş məqalədə deyilirdi: “Bizim bu “Məktəb”i nəşr etməkdə məqsədimiz məktəb şagirdlərinin irəliləmələrinə acizanə bir xidmətdir. “Məktəb”i oxuyacaq şagirdlərin biliyi geniş bir dairə olarsa, o vaxt biz də məqsədimizə yetişmiş olarıq” (12, 1911, № 1).

“Məktəb” jurnalı da pedaqoji jurnalistika ənənələrinə sadiq qalaraq ilk nöm-

rəsindən başlayaraq yeniyetmələrin təhsil, təlim və tərbiyəsinə xidmət etmişdir (2).

Milli uşaq mətbuatı uşaqları maarifləndirmək, onları didaktik məzmuna, əxlaqi tutuma və tərbiyəvi əsərlərlə formalaşdırmaq lazım gədiyini başa düşür və bu istiqaməti özlərinə yol seçmişdilər. "Məktəb" jurnalının elə ilk nömrəsində Süleyman Sani Axundovun "Qorxulu nağıllar" silsiləsindən verilmiş hekayələr uşaqların böyük marağını və rəğbətini qazanmışdır. "Qaraca qız", "Abbas və Zeynəb", "Əhməd və Məleykə", "Əşrəf" adlı hekayələrdə humanizm, dostluq, ailə-məktəb, tərbiyə məsələləri öz əksini tapır. "Məktəb" jurnalının uşaqları elmə, biliyə çağırışı gah valideynlərin, gah da uşaqların dilindən bu cür qoyulur. Cəfər Bünyadzadənin "Loğmanın oğluna nəsihəti" adlı hekayəsində ata övladına əqli və əxlaqi cəhətdən ibrətamiz nəsihətlər verir: "Əgər aləmdə xoşbəxt olmaq istəyirsən...oxuyub elm almağa çalış ki, bilən ilə bilməyən bir deyildir. Tənbəl olma ki, bu, bədbəxtlik əlamətidir...Yaxşı sözləri, lətafətli danışıqları eşitməyə rəğbət et, gözəl kitab və məcmuələr oxumağa adət et..." (13, 1912, №9). Süleyman Saninin "Ata və oğul" hekayəsində isə oğlunun təhsilə həvəsi ilə atanın bu məsələyə münasibəti qarşı-qarşıya qoyulmuşdur: "...Oğul: Pəs sən məni oxutmayıb da nə edəcəkdin? Ata: heç nə! Ancaq baxıb görürəm ki, oxuyanların dini, məzhəbi olmayır; Axund və molla üzünü əsla görmək istəmirlər. Sən də oxuyub, onların tayı olmaqdan isə, atan baban gedən yol ilə getməyin daha yaxşı məsləhətdir" (12, № 20).

Milli uşaq mətbuatı və yeni tipli məktəblərə, onların proqramlarına uyğun dərsliklərin hazırlanması zərurəti uşaq ədəbiyyatının davamlı inkişafına, həmçinin mövzu və problematika baxımından genişlənməsinə rəvac verdi. Uşaq mətbu nəşrlərin qarşısında duran əsas vəzifə isə ibtidai və orta məktəb şagirdlərin yaş və qavrayış səviyyələrinə, onların maraqlarına layiqli vətəndaş kimi yetişdirilməsinə kömək edən əxlaqi-didaktik məzmunlu ədəbi bədii materialların nəşrinə nail olmaq, "Dəbistan", "Rəhbər", "Məktəb" kimi uşaq mətbuat orqanlarından seçilmiş poetik ədəbi elmi və publisistik materialları təhlilə cəlb etməkdir. Uşaq mətbu orqanlarında dərc olunan "Qorxulu nağıllar", "Hekayələr sil-siləsi", "Qurban bayramı", "Allah xofu", "Uşaq və dovşan", "Xoruz" və digər bədii nümunələrin əxlaqi-didaktik xarakter daşıdığını diqqət mərkəzində saxlamaq lazımdır. Həmçinin həmin xüsusiyyətlərinə və uşaqların yaş, qavrayış, dünyagörüşlərinə uyğunluqlarını nəzərə almaq, onların ayrı-ayrı dərsliklərə salınmasını diqqətə çatdırmaq lazımdır.

Nəşr illəri çox olmasa belə, Azərbaycan uşaq mətbuatının formalaşmasında "Dəbistan", "Rəhbər", "Məktəb" dərgilərinin çox böyük rolu olmuşdur. Bundan başqa maarifpərvər ziyalılarımızın tərtib etdikləri ilk dərsliklərdə, oxu kitablarında dünya folklorundan, dünya yazıçılarının əsərlərindən nümunələrin verilməsi uşaq ədəbiyyatımızın da inkişaf istiqamətinə əhəmiyyətli dərəcədə təsir göstərmişdir.

***Rəyçi: prof. A.Bayramoğlu***

## İstifadə edilmiş ədəbiyyat

1. Aslanov M. Bir daha müəllimlərimizin ilk qurultayları haqqında. // Azərbaycan məktəbi, 1972, № 2.

2. Bayramoğlu A. Azərbaycan jurnalistika məktəbləri. Bakı, 2014.
3. Bayramoğlu A. Müxtəsər Azərbaycan ədəbiyyatı tarixi oçerki (Qədim dövrdən 1930-cu illərədək). Bakı, 2013.
4. Əhmədov H. XIX əsr Azərbaycan məktəbi. Bakı, 2006.
5. “Əkinçi” (1875-1877). Tam mətni. Bakı, 1979.
6. Mirəhmədov Ə. Sabir. Bakı, 1958.
7. Məmmədov Ə. Azərbaycan uşaq ədəbiyyatı (“Dəbistan”, “Rəhbər” və ”Məktəb” jurnalları əsasında). Bakı,1977.
8. Məmmədov M., Babayev Y., Cavadov T. Pedaqoji mühit və uşaq ədəbiyyatı. Bakı, 1992.
9. Məmmədov M. Sabir və məktəb. Bakı, 1968.
10. Zeynalzadə A. Azərbaycan mətbuatı və Çar Senzurası. Bakı, 2005.

Dövri mətbuat:
11. “Dəbistan” (1906-1908).
12. “Məktəb” (1911-1920).
13. “Rəhbər” (1906-1907).

**Ф.Маликова**

**Из истории детской прессы**

**Резюме**

На фоне национальной прессы есть также специальные средства массовой информации для детей. Исходя из социальной и культурной жизни страны в результате прогрессивных тенденций, наряду с новыми типами учебных заведений и учебников были необходимы в формировании детских образовательных средств массовой информации. “Дебистан”, “Рехбер”, “Мектеб” и другие журналы были созданы в результате социально-культурного спроса. В статье были выявлены факторы, которые привели к проявлению детских средств массовой информации. В то же время, отмечены характерные черты каждой из них.

Было проведено обсуждение по поводу трудностей, возникающих в процессе публикации журналов.

**F.Malikova**

**From the history of children’ press**

**Summary**

Child press plays an original role in the common sight of national press. As the result of progressive tendency in socio-cultural life of the country the need to establish pedagogical child press was collateral with the foundation of modern educational institutions and manuals. The journals “Dabistan”, “Rahbar”, “Maktab” etc. were created according to this socio-cultural demand. The article deals with the main features of child press house foundation and also the attention is drawn to their peculiarities.

The difficulties in publishing of these journals is talked about in the article too.

# XX ƏSRİN 30-40-CI İLLƏRİNDƏ AZƏRBAYCANDA ORTA İXTİSAS TƏHSİLLİ MÜƏLLİM KADRLARI HAZIRLIĞININ ƏSAS İSTİQAMƏTLƏRİ

**Vüsalə Qurbanova,**
***Azərbaycan Dövlət Pedaqoji Kollecinin müəllimi, Bakı Slavyan Universitetinin doktorantı***

XX əsrin 30-cu illərinin I yarısı Azərbaycanda təhsil sahəsində ciddi dəyişikliklərin həyata keçirilməsi ilə səciyyəvidir. Bu dövrdə yeni ibtidai məktəblərin təşkili pedaqoji təhsilli müəllim kadrlarına olan ehtiyacı daha da artırdı. Mövcud pedaqoji məktəblərlə yanaşı yeniləri yaradıldı. Azərbaycan XMK-nın 29 dekabr 1930-cu il qərarı ilə Ağdam, Xankəndi, Salyan, Şamaxı, Göyçay, Qaryagin (indiki Füzuli) şəhərlərində olan iki dərəcəli məktəblər, Ordubad kəndli gənclər məktəbi pedaqoji məktəblərə çevrildi. 1931/1932-ci tədris ilində Hadrud, Astarxanbazar (Cəlilabad), Sabirabad və Laçın pedaqoji məktəbləri təşkil olundu. 1928/1929 - 1932/1933-cü tədris illərində respublikanın orta ixtisas təhsil müəssisələrində 8182 nəfər kadr hazırlanmışdı ki, bunların da böyük əksəriyyəti pedaqoji məktəblərin məzunları idi [7]. 1932-ci ildə Şamaxıda pedaqoji məktəb təşkil olundu. Pedaqoji məktəblərdə müəllim kadrlarının hazırlığı genişləndirildi. 1934-1935-ci illərdə Şamaxı pedaqoji məktəbini 57 nəfər (bunlardan 2 nəfəri qadın idi) bitirdi. Naxçıvan Muxtar Respublikasında da müəllimlərə olan kəskin ehtiyac orada təşkil olunan pedaqoji texnikumun məzunlarının hesabına qismən ödənildi. 1921/1922-ci tədris ilində Naxçıvanda cəmi 86 nəfər müəllim fəaliyyət göstərirdisə, 1930-1931-ci illərdə onların sayı 277-ə, 1935-1936-cı illərdə 575-ə, 1936-1937-ci illərdə 733-ə çatmışdı.

30-cu illərin əvvəllərində qiyabi pedaqoji texnikumlar öz fəaliyyət sferalarını genişləndirdilər. 1931-ci ildə qiyabi pedaqoji institut təşkil edildi. Respublikada qiyabi pedaqoji təhsil xeyli genişləndi. Əgər 1934/1935-ci tədris ilində respublikanın pedaqoji texnikumlarda 5854 nəfər tələbə təhsil alırdısa, 1936-cı ildə onların sayı xeyli artaraq 7534 nəfərə çatdı. Artımın əsas səbəblərindən biri də SSRİ Xalq Maarif Komissarlığının pedaqoji texnikumların quruluşu haqqında 4 iyul 1932-ci il tarixli qərarına əsasən pedaqoji texnikumlarda təhsil müddətinin 4 ildən 3 ilə endirilməsi ilə bağlı idi [6]. Qərarda belə əsaslandırılmışdı ki, əvvəllər tələbələr 5-ci sinifdən pedaqoji texnikuma qəbul olunduqları üçün 4 il oxuyurdular. İndi isə qəbul 7 illik məktəblərdən olduğu üçün təhsil müddəti 3 ilə endirilir. Bu dəyişiklik məzunların sayının xeyli artmasına səbəb olmuşdu. 1934/1935-ci tədris ilində Ağdam Pedaqoji Texnikumunda 467,

Ağdaş Pedaqoji Texnikumunda 340, M.Ə. Sabir adına Bakı Pedaqoji Texnikumunda 768, Salyan Pedaqoji Texnikumunda 251, Göyçay Pedaqoji Texnikumunda 412, Zaqatala Pedaqoji Texnikumunda 331, Kirovabad (Gəncə) Pedaqoji Texnikumunda 788, Qazax Pedaqoji Texnikumunda 500, Quba Pedaqoji Texnikumunda 424, Qusar Pedaqoji Texnikumunda 301, Qaryagin (Füzuli) Pedaqoji Texnikumunda 270, Lənkəran Pedaqoji Texnikumunda 478, Nuxa (Şəki) Pedaqoji Texnikumunda 437, Naxçıvan Pedaqoji Texnikumunda 255, Sabirabad Pedaqoji Texnikumunda 197, Şuşa Pedaqoji Texnikumunda 381, Şamaxı Pedaqoji Texnikumunda 167, Hadrud Pedaqoji Texnikumunda 192, Bakı Xalq Təhsil şöbəsi yanında Bakı Pedaqoji Texnikumunda 575 nəfər (cəmi 7534 nəfər) təhsil alırdı.

1934-cü ildən etibarən respublikada 7 illik təhsilin icbari olması ali və ali orta pedaqoji təhsilli müəllimlərin hazırlanması sahəsində təxirə salınmaz işlərin görülməsini zəruri etdi. 1934/35-ci tədris ilində Azərbaycandakı məktəblərdə 10897 müəllim fəaliyyət göstərirdi ki, onların 952-si ali, 590-ı natamam ali, 5678-i orta, 3677-si aşağı təhsilə malik idi [2]. Həmin illərdə müəllimlərin kəmiyyət artımı keyfiyyət artımını üstələsə də, əvvəlki illərlə müqayisədə müsbətə doğru dəyişiklik var idi. O dövrdə müəllim hazırlığında ən mühüm problemlərdən biri də müəllimlərin yenidən hazırlığı məsələsi idi. Məktəbin yenidən qurulması tədris planına yeni fənlərin daxil edilməsini zəruri etmişdi.

30-cu illərin ikinci yarısında respublikada 2 illik müəllimlər institutları təşkil edilməyə başlandı. 2 illik müəllimlər institutlarının yaradılması ilə əlaqədar olaraq respublikadakı Pedaqoji Texnikumların bəziləri birləşdirildi. 1940-cı ildə Sabirabad və Lənkəran Pedaqoji Texnikumları bağlandı. Bağlanmış texnikumların tələbələri digər pedaqoji texnikumlara göndərildilər. 1940/1941-ci tədris ilində Şuşa Pedaqoji Texnikumu bağlandı. Texnikumun Azərbaycan bölməsi-nin tələbələri təhsillərini Ağdam Pedaqoji Texnikumunda davam etdirdilər. 1941-ci ildə Qusar Pedaqoji Texnikumu Quba Peda-qoji Texnikumu ilə birləşdirildi. 1935/1936-cı tədris ilində Laçın pedaqoji texnikumu, 1935-ci ildə Astarxanbazar Pedaqoji Texni-kumu bağlandı. 1937-ci ildə isə Naxçıvan Pedaqoji Texnikumu Ordubad şəhərinə köçürüldü. Pedaqoji texnikumların birləşdirilməsinin əsas səbəblərindən biri kifayət qədər ibtidai sinif müəllimi hazırlamaqları ilə bağlı idisə, digər tərəfdən 2 illik müəl-limlər institutlarının yaradılması bu tip məktəblərin birləşdirilməsini tələb edirdi. 5 il müddətində, yəni 1936-1941-ci illər arasında pedaqoji texnikumlar respublikamız üçün 11875 nəfər orta pedaqoji təhsilli müəllim kadrları hazırlamışdı. Bu sahədə Kirovabad (Gəncə), Qazax, Ağdam, Qaryagin (Füzuli), Şuşa, M.Ə.Sabir adına Bakı Pedaqoji Texnikumlarının fəaliyyətləri xüsusilə diqqətəlayiq olmuşdur. Qazax Müəllimlər Seminariyasının tarixini araşdıran professr Fikrət Seyidovun tədqiqatlarına görə, Qazax Pedaqoji Texnikumu müəllim hazırlığında 2-ci yerdə dururdu. Əgər Bakıdakı Pedaqoji Texnikumlarda 755 tələbə təhsil alırdısa, Qazax Pedaqoji Texnikumunda 405 tələbə təhsil alırdı. Qazax pedaqoji texnikumunda ildən-ilə təhsil alan tələbələrin sayı artmışdır. Əgər 1918-1935-

ci ilə kimi bu məktəbi cəmi 658 nəfər bitirmişdisə, sonrakı illərdə həm tələbələrin, həm də məzunların sayı artmışdır. 6 il ərzində Qazax Pedaqoji Məktəbinə 1320 tələbə qəbul edilmişdir. Həmin illərdə pedaqoji məktəbin 1139 məzunu olmuşdur ki, onlardan da 938 nəfəri oğlan, 201 nəfəri qız olmuşdur. Digər bölgələrdə yerləşən pedaqoji məktəblərdə aparılan pedaqoji kadr hazırlığı ilə müqayisədə bu, çox yüksək göstərici idi. Qazax Pedaqoji Məktəbi qadın müəllimlərinin hazırlığında öndə gedirdi. Bu da təbii ki, Qazaxda və ətraf bölgələrdə yaranmış maarifçilik mühiti ilə bağlı idi. Qazax Pedaqoji Texnikumunun kadr potensialı bölgələrdə yerləşən digər pedaqoji texnikumların pedaqoji kollektivlərindən həm sayına, stabilliyinə, elmi-metodik hazırlığına görə ciddi şəkildə fərqlənmişdir.

30-cu illərdə Muxtar Respublikanın müəllim kadrları ilə təminatında pedaqoji texnikum mühüm rol oynadı. 1926-1941-ci illərə qədər texnikumda 1071 nəfər müəllim hazırlanmışdı ki, onlardan da 182 nəfəri qadın idi [70, 37]. Muxtar Respublikanın Ordubad şəhərində yeni pedaqoji texnikum açıldı. 1940-1941-ci illərdə Naxçıvan Pedaqoji Texnikumunu 94, Ordubad Pedaqoji Texnikumunu 92 nəfər bitirərək pedaqoji fəaliyyətə başladılar. 1941-ci ildə Naxçıvan Pedaqoji Texnikumu Ordubad Pedaqoji Texnikumu ilə birləşdirildi [5]. Bu qərarın verilməsini şərtləndirən əsas səbəb Naxçıvanda Müəllimlər İnstitutunun yaradılması olmuşdu.

1938/1939-cu tədris ilindən pedaqoji məktəb ümumtəhsil məktəblərinin ibtidai sinifləri üçün rus dili müəllimi hazırlığına başladı. 1930-1940-cı illərdə pedaqoji texnikumları 17245 nəfər müəllim bitirmişdir. XX əsrin 30-cu illərində Azərbaycanda orta pedaqoji ixtisas təhsilli kadrların hazırlığında mükəmməl bir sistem yaranmışdı. 20-ci illərdə kadr hazırlığında özünü göstərən sistemsizlik, pərakəndəlik, məzmunun tez-tez dəyişməsi, zəruri elmi-pedaqoji və metodiki ədəbiyyatın yoxluğu artıq aradan qaldırılmışdı. Pedaqoji texnikumlar öz işlərini ölkədə gedən icbari ibtidai təhsilin həyata keçirilməsinə istiqamətləndirilmişdilər. Ona görə də orta ixtisas pedaqoji təhsil müəssisələrində təhsil alan tələbələrin və məzunların sayı ildən-ilə artırdı. Əgər 1930/1931-ci tədris ilində 13 pedaqoji texnikumda 4453 tələbə təhsil alırdısa, 1938-1939-cu tədris ilində onların sayı 10367 nəfər olmuşdu. Əgər 1930/1931-ci tədris ilində həmin texnikumları cəmi 898 nəfər bitirmişdisə, 1938/1939-cu tədris ilində texnikumları 2933 nəfər bitirmişdi. Texnikumların sayı isə 7 il ərzində xeyli artmış, 13-dən 19-a yüksəlmişdir.

Bir faktı qeyd edək ki, Azərbaycanda 20-ci illərin əvvəllərində fəaliyyət göstərən 3 müəllimlər seminariyasında cəmi 120 nəfər tələbə oxuyurdusa, 1938-1939-cu ildə onların sayı 86 dəfədən artıq artmışdı. Pedaqoji texnikumlarda oxuyan tələbə qızların da sayı ildən-ilə artmışdır. Belə ki, 1930/1931-ci tədris ilində 13 pedaqoji texnikumda 1173 nəfər, 1931/1932-ci tədris ilində 15 pedaqoji texnikumda 1232 nəfər, 1932/1933-cü tədris ilində 23 pedaqoji texnikumda 1249 nəfər, 1933/1934-cü tədris ilində 21 pedaqoji texnikumda 1046 nəfər, 1934/1935-ci tədris ilində 20 pedaqoji texnikumda 1245 nəfər tələbə qız təhsil alırdı.

30-cu illərin ikinci yarısında bu məsələyə daha ciddi yanaşılırdı. Faktlara diqqət yetirək: 1935-ci ildə pedaqoji texnikumlarda 5964 nəfər tələbə təhsil alırdı. Onlardan 501 nəfəri texnikumu vaxtında bitirə bilməmişdir. 1936-cı ildə 439 nəfər, 1937-ci ildə 450 nəfər, 1938-ci ildə 466 nəfər, 1939-cu ildə 614 nəfər, 1940-cı ildə 385 nəfər texnikumu vaxtında bitirə bilməmiş və ya tələbələr sırasından xaric olunmuşdu [1].

Respublikada fəaliyyət göstərən pedaqoji texnikumlarda həm də Ermənistan və Gürcüstandakı Azərbaycan məktəbləri üçün də müəllim kadrları hazırlanırdı. Baxmayaraq ki, hər iki respublikada bu sahədə müəyyən tədbirlər həyata keçirilmişdi. 1925-ci ildə İrəvan şəhərində azərbaycanlılar üçün pedaqoji texnikum fəaliyyətə başlamışdı. 1948-ci ilə kimi fəaliyyət göstərən bu texnikum Ermənistandakı Azərbaycan məktəbləri üçün xeyli pedaqoji kadr hazırladı. 30 tələbə ilə fəaliyyətə başlayan texnikumda az sonra 400 tələbə təhsil alırdı [7].

Böyük Vətən müharibəsi Azərbaycanı bütün sahələrdə olduğu kimi, təhsil sahəsində də ciddi sınaq qarşısında qoydu. Müharibənin ağırlıqları təhsil müəssisələrinin pedaqoji kadr potensialına, maddi-texniki bazasına, təlim-tərbiyənin keyfiyyətinə ciddi zərbə vurdu. Pedaqoji kadr hazırlığını həyata keçirən ali və orta ixtisas təhsili müəssisələrinin ən yaxşı müəllim və tələbələrinin böyük bir hissəsi cəbhəyə səfərbər olundu. Ümumtəhsil məktəblərinin müəllimlərinin də bir qismi könüllü olaraq müharibəyə getmişdi. Azərbaycan SSR Xalq Komissarları Sovetinin 21 avqust 1941-ci il tarixli qərarı ilə Bakı Xalq Təhsili Şöbəsinin 2 nömrəli məktəbi ilə M.Ə.Sabir adına pedaqoji məktəb, Bakı Mədəni-Maarif və Kitabxanaçılıq texnikumları, Nuxa (Şəki) Siyasi Maarif və pedaqoji məktəbləri birləşdirildi. Repressiya illərində böyük itkilərə məruz qalmış Nuxa Pedaqoji Texnikumunda tədris-tərbiyə işlərinin təşki-linə müharibə ağır zərbə vurmuşdur. Texnikumu 1940/1941-ci tədris ilində 185 nəfər, 1941/1942-ci tədris ilində 55 nəfər, 1942/1943-cü tədris ilində 36 nəfər, 1943/ 1944-cü tədris ilində 33 nəfər, 1944/1945-ci tədris ilində 75 nəfər, ümumilikdə 384 nəfər bitirmişdir. Ümumiyyətlə, 1941-1943-cü illərdə respublikada fəaliyyət göstərən pedaqoji məktəblərin bir çoxu birləşdirildi və ya bağlandı. Maliyyə və kadr potensialı zəif olduğundan Qusar, Salyan və Naxçıvan pedaqoji məktəbləri bağlandı. Beynəlmiləl pedaqoji məktəbinin rus bölməsinin tələbələrinin təhsillərini Bakı Şəhər Maarif İdarəsinin nəzdindəki məktəbəqədər pedaqoji məktəbdə, Azərbaycan bölməsinin tələbələrinin isə Respublika məktəbəqədər pedaqoji məktəbində davam etdirməsi nəzərdə tutuldu. 30-cu illərin axırlarında respublikada 91 orta ixtisas məktəbi fəaliyyət göstərirdisə, 1940/1941-ci tədris ilində onların sayı 68-ə, bir il sonra isə 62-yə endi. Həqiqi hərbi xidmətə çağırılan, könüllü olaraq orduya gedən, istehsalata və təsərrüfat işlərinə cəlb edilən tələbələrin sayı kifayət qədər çox idi. Bu da təbii ki, ali məktəblərdə olduğu kimi, orta ixtisas təhsili müəssisələrində də tələbə kontingentinə ciddi təsir göstərmişdi. Məsələn, 1941/1942-ci tədris ilində Şamaxı pedaqoji məktəbini cəmi 90 nəfər bitirmişdi [3]. 1942/1943-cü tədris ilində respublikada fəaliyyət göstərən 16 pedaqoji məktəbi cəmi 2194 tələbə bitir-

mişdi. Mü-haribə tədris prosesinin təşkilində ciddi çətinliklər yaratmışdı. Tələbələrin dərsə davamiyyəti, nizam-intizamı xeyli zəifləmişdi. Elə bunun nəticəsi idi ki, 1942/1943-cü tədris ilində təlim uğursuzluqlarına görə 29 nəfər tələbə pedaqoji məktəblərdən xaric edilmişdi. Xaric edilən tələbələrin bir qismi dərslərdə müntəzəm iştirak etməyən, digər qismi isə imtahan və yoxlama işlərini vaxtında verməyənlər idi. Pedaqoji məktəblərə qəbul imtahanları keçirilmədiyindən yeni qəbul olunanların bilik səviyyəsi, bacarıq və qabiliyyətləri təhsil prosesində üzə çıxarılırdı. Onların əsas fənlər üzrə biliyinin həcmi, müstəqil iş aparmaq vərdişləri qaneedici deyildi. Elə ilk semestrlərdə pedaqoji məktəblərə yeni qəbul olan tələbələrin böyük əksəriyyətinin hazırlığının zəif olduğu aşkara çıxarıldı. Stalinqrad ətrafındakı ölüm-dirim savaşından sonra müharibənin qələbə ilə bitəcəyi ilə bağlı sovet xalqında böyük inam yarandı, yüksəkixtisaslı pedaqoji kadr hazırlığı yenidən gündəmə gəldi. Cəbhəyə səfərbər edilmiş on minlərlə mütəxəssisin yerinə ən qısa müddətdə başqalarını hazırlamaq lazım gəlirdi. Müharibənin sərt reallıqlarına müvafiq olaraq pedaqoji məktəblərin həyatını yenidən təşkil etmək, tədris-tərbiyə işində dövrün tələblərinə uyğun dəyişiklik aparmaq zərurəti yaranmışdı. Müharibə ilə əlaqədar olaraq regionlarda, o cümlədən Naxçıvan Muxtar Respublikasında maarif sahəsində ciddi problemlər yaranmışdı. Kişi müəllimlərinin cəbhəyə getməsi nəticəsində tədris prosesi pozulmuşdu. Müəllimlərin yerini doldurmaq üçün məktəblərdə dərslər qeyri-ixtisas müəllimlərinə, orta təhsillilərə həvalə edilmişdi. Naxçıvan Muxtar Respub-likasının Maarif Komissarlığı yaranmış vəziyyətdən çıxmaq üçün pedaqoji təhsili olmayan gəncləri, hətta yenicə orta məktəbi bitirmiş qızları tədrisə cəlb etməklə bağlı qərar qəbul etdi. 1943/1944-cü tədris ilində Astarxanbazarda (Cəlilabad) və Laçında fəaliyyətini dayandırmış pedaqoji məktəblər yenidən təşkil olundu. 1941/1942-ci tədris ilində Hadruda köçürülən Şuşa pedaqoji məktəbi yenidən öz fəaliyyətini Şuşada davam etdirdi [4]. 1944-cü ildə Sənaye-pedaqoji texnikumu fəaliyyətini bərpa etdi. 1944/1945-ci tədris ilində Astraxanbazar (Cəlilabad) pedaqoji məktəbi Lənkəran şəhərinə köçürüldü [16,61]. Müharibə illərində qiyabi pedaqoji təhsil sahəsində də müəyyən irəliləyişlər var idi. 1943-cü ilin dekabr ayında SSRİ XKS-nın qəbul etdiyi "Qiyabi pedaqoji təhsil sisteminin möhkəmləndirilməsinə dair tədbirlər haqqında" qərarından sonra qiyabi təhsil genişləndi.

40-cı illərin ikinci yarısında pedaqoji kadr hazırlığını təkmilləşdirmək məqsədilə bir sıra təxirəsalınmaz işlər görüldü. Hər şeydən əvvəl, qəbul planları artırıldı. O da etiraf edilməlidir ki, həmin dövrdə hazırlıqlı tələbə kontingenti yığmaq böyük problem idi. Bəzən texnikumlara ayrılan plan yerlərini doldurmaq mümkün olmurdu. Pedaqoji məktəblərə qəbul planında nəzərdə tutulan 9400 tələbə əvəzinə cəmi 5152 nəfər tələbə qəbul edilmişdi. Göyçay pedaqoji məktəbində 450 nəfər tələbə oxumalı olduğu halda, cəmi 318 nəfər tələbə təhsil alırdı. Nuxa (Şəki) Pedaqoji Texnikumunda 1941/1942-ci tədris ilində 55 nəfər, 1942/1943-cü tədris ilində 36 nəfər, 1943/1944-cü tədris ilində 33 nəfər, 1944/1945-ci tədris ilində 75 nəfər müəllim hazırlanmışdı. Diqqəti cəlb edən cəhət o idi

ki, müharibənin çətinliklərinə baxmayaraq pedaqoji məktəblərdə təhsil alan qızların sayı kifayət qədər artmışdı. Belə ki, pedaqoji və mədəni-maarif məktəblərində təhsil alan tələbələrin 2411 nəfərini (58,1 %-ni) qızlar təşkil edirdi. Ümumiyyətlə isə, 1941-1945-ci illərdə respublikanın orta ixtisas məktəblərində 30190 nəfər tələbə təhsil alırdı ki, onlardan da 23,7 %-i pedaqoji məktəblərdə oxuyurdu. Orta ixtisas pedaqoji məktəblərində ibtidai siniflər üçün 3273 nəfər müəllim hazırlanmışdı.

Müharibənin qələbə ilə başa çatması ali və orta ixtisas təhsilli pedaqoji kadr hazırlığında yeni perspektivlər açdı. Müharibənin ehtiyacları üçün alınmış ümumtəhsil, orta ixtisas və ali məktəblərin binaları geri qaytarıldı. Ölkədə təhsil iqtisadi və mədəni quruculuğa istiqamətləndirildi. Azərbaycan KP MK və XKS 1943-cü ilin fevral ayında başqa sahələrdə işləyən və ixtisasca müəllim olan kadrların məktəblərə qaytarılması haqqında qərar qəbul etdi. Onu qeyd edək ki, müharibənin ilk illərində müəllimlərin bir qismi idarəetmə strukturlarına və təsərrüfata rəhbərlik işinə cəlb edilmişdi. Müəllim və tələbələrin cəbhəyə göndərilməsi ali və orta ixtisas təhsili müəssisələrində tədris-tərbiyə prosesinin təşkilində müəyyən çətinliklər yaratsa da, mövcud imkanların maksimum səfərbər edilməsi nəticəsində təhsil ocaqları müharibədən əvvəlki potensialının bir hissəsini qoruyub saxlamağa nail oldu.

1948-ci ildə İrəvan pedaqoji məktəbi 220 nəfərlik kontingenti ilə Azərbaycan SSR-in Xanlar rayonuna köçürüldü [8]. Bu, SSRİ Nazirlər Sovetinin 1947-ci il 23 dekabr tarixli 4083 nömrəli və 1948-ci il 10 mart tarixli 754 nömrəli qərarları ilə Azərbaycan xalqına qarşı növbədə tarixi cinayətin nəticəsində baş vermişdi. Ümumiyyətlə, pedaqoji texnikum 1928-ci ildən 1941-ci ilə qədər 836 müəllim, eyni müddət ərzində məktəbin qiyabi şöbəsi 242 müəllim, həmçinin birillik müəllimlər kursunu bitirən təxminən 150-dən artıq müəllim hazırlamışdı. Özünün 23 illik fəaliyyəti müddətində pedaqoji məktəbin 1228 nəfər məzunu müəllim diplomuna layiq görülmüşdü. 1947-ci ilə qədər isə texnikumu 1370 nəfərə qədər pedaqoji təhsilli müəllim başa vurmuşdur.

1947/1948-ci tədris ilində respublikada 17 pedaqoji məktəb (M.Ə.Sabir adına Bakı pedaqoji məktəbi, Lənkəran pedaqoji məktəbi, Bakı XMŞ-nin Pedaqoji Məktəbi, Ağdaş Pedaqoji Məktəbi, Şamaxı Pedaqoji Məktəbi, Kirovabad (Gəncə) Pedaqoji Məktəbi, Şuşa Pedaqoji Məktəbi, Quba Pedaqoji Məktəbi, Qaryagin Pedaqoji Məktəbi, Laçın Pedaqoji Məktəbi, Göyçay Pedaqoji Məktəbi, Zaqatala Pedaqoji Məktəbi, Qazax Pedaqoji Məktəbi, Xanlar Pedaqoji Məktəbi, Ordubad Pedaqoji Məktəbi, Ağdam Pedaqoji Məktəbi, Nuxa (Şəki) Pedaqoji Məktəbi) fəaliyyət göstərirdi. Təlimi Azərbaycan dilində olan 12 pedaqoji məktəb regionlarda, təlimi həm rus, həm də Azərbaycan dilində olan 3 pedaqoji məktəb Bakı şəhərində yerləşirdi. Kirovabad (Gəncə) və Şuşa pedaqoji məktəblərində Azərbaycan şöbəsi ilə yanaşı erməni şöbəsi də fəaliyyət göstərirdi.

1946/1947-ci tədris ilində pedaqoji məktəblərdə 4 ixtisas üzrə 4148 nəfər orta təhsil alırdı: 1) müəllimlik; 2) mədəni-maarif işçisi; 3) kitabxana işçisi; 4) məktəbəqədər tərbiyəçilər. Bu texnikumlarda ibtidai sinif müəllimləri ilə yanaşı, həm də bədən tərbiyəsi müəllimləri hazırlanırdı.

40-cı illərin ikinci yarısında ümumtəhsil məktəblərində aparılan məzmun dəyi-

şikliyi pedaqoji məktəblərdə də ciddi dəyişikliyə səbəb oldu. Belə ki, 1948-ci ildə pedaqoji məktəblərdə təhsil müddəti bir il artırıldı. Təlim müddətinin 4 ilə qaldırılması ibtidai siniflər üçün daha keyfiyyətli müəllim kadrları hazırlamaq məqsədi daşıyırdı.

Müharibədən sonrakı ilk beş ildə respublikada 12 orta ixtisas təhsil müəssisəsi ya yenidən yarandı, ya da bərpa edildi. Orta ixtisas təhsili müəssisələrində təhsilalanların sosial tərkibi ilə yanaşı, yaş göstəriciləri də xeyli dəyişdi. Əgər əvvəllər orta ixtisas məktəblərinə, o cümlədən pedaqoji məktəblərə 15-17 yaşlılar qəbul edilirdisə, müharibədən sonra vəziyyət dəyişdi. Müharibəyə səfərbər olunmuşların (müharibə iştirakçılarının və əlillərinin) orta ixtisas məktəblərinə qəbuluna icazə verilməsi 18-20 yaşlı oğlanların orta ixtisas təhsilinə cəlb edilməsinə şərait yaratdı. 1946-1950-ci illərdə respublikanın orta ixtisas təhsili müəssisələrinin birinci kurslarına 33070, yuxarı kurslarına 3270 nəfər tələbə qəbul olunmuşdu. 210 nəfər isə istehsalatdan ayrılmadan (qiyabi) qəbul olunmuşdu. Deməli, 5 il ərzində qəbul olunanların sayı 36550 nəfər təşkil etmişdi.

XX əsrin 30-40-cı illərində orta ixtisas pedaqoji təhsil müəssisələrinin ölkədə yeni tip ziyalılar nəslinin formalaşmasında mühüm rolu oldu. Təhsil sahəsində baş vermiş mütərəqqi dəyişiklik ölkədə ədəbi-mədəni mühitin canlanmasına, mətbuat, teatr, ədəbiyyatın inkişafına ciddi təkan verdi.

***Məqalə N.P.Litvinova, E.T.İsimbayev və F.A.Rüstəmovun ümumi redaktəsi ilə hazırlanmış "Образование на протяжении всей жизни: разнообразие идей, концепций, форм, методов, технологий" kitabından götürülmüşdür. Sankt-Peterburq, 2016.***

## İstifadə edilmiş ədəbiyyat


1. Atakişiyev A. Bakı Dövlət Universitetinin tarixi. I hissə. Bakı: Bakı Universiteti, 1991.
2. Azərbaycan Respublikası Dövlət Tarix Arxivi: F.57. siy. 1, iş. 211.
3. Azərbaycan Respublikası Dövlət Tarix Arxivi: F.2672, siy.3.iş.109.
4. Azərbaycan SSR işçi-kəndli hökumətinin qanunlar və sərəncamlar külliyatı. Bülleten, 1935, № 11.
5. Cəfərov H. Naxçıvanda təhsil: inkişaf yolu və imkanları. Bakı: Elm və təhsil, 2011.
6. Məktəb və müəllim haqqında partiya və hökumət qərarları. Bakı: Azərnəşr, 1952.
7. Mərdanov M. Azərbaycan təhsil tarixi. II cild. Bakı: Təhsil, 2011.
8. Nəcəfov N. İrəvan Pedaqoji İnstitutu Azərbaycan bölməsinin acı taleyi. Azərbaycan müəllimi, 1 mart 2013-cü il.



# TƏDRİS PROSESİNDƏ YENİ YANAŞMALARA DAİR

**Sveta Behbudova,**
***Bakı Dövlət Sosial-İqtisad Kollecinin metodisti***

Məqalədə təhsil sistemində həyata keçirilən innovativ təlim metodları, yeni pedaqoji təcrübələrin öyrənilməsi, müəllim – şagird münasibətlərinin qurulması, məktəblərdə Azərbaycan tarixi fənninin müasir təhsil standartlarına uyğun tədrisi, o cümlədən mədəniyyətlərarası münasibətlərin yaxınlaşması və inkişafını təmin edən metodların tətbiqi ilə bağlı məsələlərdən bəhs olunur.

***Açar sözlər:*** *ənənəvi təlim, interaktiv təlim, təhsildə yeni dövr, mədəniyyətlərarası yaxınlaşma.*
***Ключевые слова:*** *традиционное занятие, интерактивное обучение, инновации в обучении, сближение международных культур.*
***Key words:*** *traditional training, interactive training, new era in education, intercultural approach.*

Təhsilin məzmun və yeniləşdirilməsi istiqamətində aparılan uğurlu islahatlar təhsilverənlərin üzərinə mühüm vəzifələr qoyur. Kurikulum islahatları, ilk növbədə müəllimin hazırlıq səviyyəsinin yüksəldilməsini tələb edir. Bu islahatların tətbiqi ilə əlaqədar Azərbaycan tarixi fənninin tədrisi qarşısında da konkret tələblər qoyulmuşdur.

Mövcud təlim metodlarının genişlənməsi şagirdlərin idrak fəaliyyətinin motivləşməsinin təşkilində, biliklərin, bacarıq və vərdişlərin mənimsənilməsi, yeni tələblərin meydana çıxması yeni, dialektik yanaşmanın əsasını qoydu və “inkişafetdirici təlim” konsepsiyasının meydana gəlməsi ilə nəticələndi. Təlimin nəticələri yalnız o halda səmərəli hesab edilə bilər ki, öyrətmə metodları şagirdlərin təfəkkürünün, dərketmə imkanlarının genişlənməsini və biliklərin mənimsənilməsi prosesinə fəal qoşulmasını təmin edə bilsin. Bu tələblər nəzərə alınmaqla dərsdə elə optimal təlim metodlarına istinad edilməlidir ki, onlar özlüyündə yeni biliklərin müstəqil mənimsənilməsinə, produktiv və yaradıcı təfəkkürün fəallaşdırılmasına təminat yaratsın. Məhz fəal, interaktiv təlim metodları bu meyarlara tam uyğun gəlir. Fəal təlim metodları təlim prosesinin digər iştirakçıları ilə əməkdaşlıq şəraitində öyrənənlərin idrak fəallığını təmin etmək imkanları ilə səciyyələnir (2).

Hər bir tarixi hadisə əvvəlki hadisələrlə bu və ya digər formada bağlıdır. Bu baxımdan Azərbaycan tarixi fənnini interaktiv fənn də adlandırmaq olar. Bu fənnin də tədrisi yüksək intellektə, geniş dünyagörüşünə malik olan və onu daim inkişaf etdirməyə səy göstərən şəxsiyyət formalaşdırmağa, ailəsini, vətənini, millətini sevən və s. mənəvi keyfiyyətlərə qadir vətəndaş tərbiyə etməyə xidmət edir. Qeyd olunan mühüm amillərin formalaşmasında Azərbaycan tarixi fənni üzrə təhsil proqramının (kurikulumun) mühüm cəhətlərindən olan məqsədyönümlülük müəllim tərəfindən da-

im təmin olunmalıdır. Nəticəyönümlülük pedaqoji prosesdə şagird fəaliyyətinin daim izlənilməsini, onun nailiyyətlərindəki irəliləyişlərin müntəzəm qiymətləndirilməsini reallaşdırır. Azərbaycan tarixi fənninin tədrisində yeni yanaşmalar dedikdə konseptual sənədlərdə təsbit olunan məqsəd və vəzifələrin həllinə səriştə və peşəkarlıqla nail olmaq başa düşülür.

Təcrübə göstərir ki, Azərbaycan tarixi fənni üzrə təlim məqsədləri aşağıdakı məsələlərə diqqət yetirməyi daha səmərəli sayır:

• Tarixi hadisələrin xronoloji əsasda təsviri, onlar arasındakı əlaqə;

• Məktəblilərdə vətənpərvərlik, fəal vətəndaş mövqeyi;

• Digər xalqlara, ümumbəşəri, humanist dəyərlərə hörmət;

• Ənənəvi və mədəni nailiyyətlərə əsaslanan əqidə prinsipləri;

• Dövlətçilik ənənələrinə sədaqət hissi formalaşdırmaq üçün onlara keçmiş və müasir dövrün hadisələrini sərbəst təhlil etmək;

• Faktları ümumiləşdirmək, əldə olunan biliklərdən cəmiyyətin müasir vəziyyətinin qiymətləndirilməsində istifadə;

• Tarixi mənbə, müxtəlif fikir və konsepsiyaları təhlil etmək;

• Tarixi fakt və hadisələrə, tarixi şəxsiyyətlərə və onların fəaliyyətinə münasibət və onları müvafiq dövr baxımından qiymətləndirmək;

• Başqalarının fikirlərinə hörmət etmək, eləcə də sərbəst nəticə çıxarmaq və kollektivdə işləmək bacarıq və vərdişləri aşılamaqla informativ- kommunikativ və hüquqi mədəniyyət formalaşdırmaq.

Bunları beş məzmun xətləri üzrə qruplaşdırmaq daha məqsədəuyğundur: tarixi zaman, tarixi məkan, dövlət, şəxsiyyət, mədəniyyət.

Hər bir məzmun xətti müəyyən zərurətdən irəli gəlir:

• Tarixi zaman - bütün hadisə və təzahürlər tarixi zaman daxilində baş verir.

• Tarixi məkan - insanların və cəmiyyətin həyatı, onların inkişafı və dəyişməsi müəyyən tarixi məkan çərçivəsində təzahür edir.

• Dövlət – müxtəlif dövlət quruluşu formaları. Qanunlar və onlara əməl olunması, dövlətlər arasında və dövlətlə vətəndaş arasında olan münasibətlər insanların həyatına və tarixin gedişinə güclü təsir göstərmişdir.

• Şəxsiyyət – ayrı-ayrı şəxsiyyətlərin fəaliyyəti bu və ya digər dərəcədə tarixin gedişinə təsir göstərir.

• Mədəniyyət – insanların maddi və mənəvi fəaliyyətinin bütün nəticələrini əhatə edir.

Azərbaycan tarixinin təlim strategiyaları baxımından tədrisində istifadə olunan fəal təlim üsulları mühüm əhəmiyyətə malikdir. Beyin həmləsi, diskussiya, layihə hazırlığı, mühazirə, sorğu vərəqləri, müsahibə və b. üsullardan istifadə də məhz bu qəbildəndir. Aparılan müşahidələr göstərir ki, tədris olunan mövzunun məzmunundan asılı olaraq dərsdə müxtəlif üsulların tətbiqinə ehtiyac yaranır. Bu üsullar ümumiləşdirmək, araşdırılan məsələ ilə bağlı faktlar haqqında müəyyən olunan qrupların ictimai rəyini öyrənmək məqsədi ilə aparılır.

Layihələrin hazırlanması müxtəlif mövzuların müstəqil şəkildə tədqiq edilməsidir. Şagirdlər öz layihələrini təqdim etməzdən əvvəl uzun müddət onun üzərində işləyirlər. Belə layihələr şagirdlərin tədqiqat vərdişlərinin, biliklərə müstəqil yiyələnmə bacarıqlarının formalaşmasında mühüm rol oynayır, onlara müstəqil şəkildə öz fəaliyyət proqramlarını qurmağa, habelə öz vaxtını və işini qrafik üzrə planlaşdırmağa kömək edir. Bu üsul, həmçinin şagirdlərin bir-biri ilə, eləcə də məktəbdən kənarda müxtəlif adam-

larla qarşılıqlı əlaqəsi üçün şərait yaradır, hadisələrin hər hansı bir aspektini daha dərindən anlamağa imkan verir, əlavə ədəbiyyatdan istifadə etməyə istiqamətləndirir.

Layihələr hazırlayarkən müəllim mövzu və ya problemi müəyyən edir və sinfə bunlardan birini seçmək imkanı verir. Problem, həmçinin sinif tərəfindən “əqli hücum” üsulu ilə də seçilə bilər.

Problem konkret olmalıdır. Müəllim və şagirdlər birlikdə layihə üzərində işin başlama və başa çatma müddətini, istifadə olunacaq əyani vasitələri (ədəbiyyatlar, mənbələr, təsviri vasitələr və s.) bunları əldə etmək yollarını, iş formalarını (fərdi yoxsa, qrup şəklində) müəyyən edirlər.

İş prosesində müəllim suallara cavab verə və ya yol göstərə bilər. İşin icrasına isə şagirdlər özü cavabdehdir.

Tədqiqatın nəticəsi hesabat, xəritə, illüstrasiya, fotoşəkillər, qrafiklər formasında ifadə oluna bilər.

Sorğu vərəqi araşdırılan məsələ ilə bağlı tərtib edilir və burada suallar qoyulur. Sorğuda iştirak edənlər bu vərəqi müstəqil doldurur.

• Müsahibə isə araşdırılan məsələ ilə bağlı məlumat almaq üçün aparılır.

• Bu üsullardan istifadə edərkən aşağıdakı mərhələlərin gözlənilməsi məqsədəmüvafiq hesab edilir:

• Problemi müəyyən etmək.

• İşi təşkil etmək (sorğu və ya müsahibə keçirmək üçün suallar hazırlamaq).

• Məlumatları toplamaq (sualların cavablarını toplamaq).

Sinifdə kollektiv müzakirə üçün “Beyin həmləsi” və ya ”Əqli hücum” üsulu çox əlverişlidir.

Fəal təlimə bir sıra tələblər verilir. Bunlar əsasən şagirdlərin aktiv fəaliyyəti, müəllimin şagirdlə və şagirdlərin bir-biri ilə əməkdaşlığı, didaktik oyunlardan istifadə olunması, şagirdlərin sinifdə qeyri-ənənəvi yerləşdirilməsindən ibarətdir.

Digər metodiki ədəbiyyatlara da diqqət yetirdikdə fəal təlimin spesifik xüsusiyyətlərini göstərən bir sıra tələblərə də rast gəlinir. Həmin yanaşmaları nəzərdən keçirək. Onlar aşağıdakılardır:

1) Müəllim tərəfindən şüurlu surətdə (iradi olaraq) idraki problem situasiyasının yaradılması;

2) Problemin həlli prosesində şagirdlərin fəal tədqiqatçı mövqeyinin stimullaşdırılması;

3) Şagirdlər üçün yeni və zəruri olan biliklərin müstəqil kəşfi, əldə edilməsi və mənimsənilməsi üçün şəraitin yaradılması.

“Siyasi vəziyyət, Azərbaycanın dövlət müstəqilliyinin bərpa olunması” mövzusu üzrə problemin həllinə aid ideyaların birgə axtarışında şagirdlər iştirak edir. Təcrübə göstərir ki, bu üsulun köməyi ilə bir neçə dəqiqə ərzində şagirdlərin fəallığı təmin olunmaqla yanaşı, eyni zamanda onlarla yeni ideyalar irəli sürülür. Şagirdlər tərəfindən ideyaların çoxluğu mövzu ilə əlaqədar qoyulan problemin həlli üçün optimal həllin tapılması, səmərəli qərarın çıxarılmasına şərait yaranır. Sinifdə təmsil olunan hər bir şagirdin iştirakı əsasdır. Kəmiyyət keyfiyyətdən daha çox önəmlidir.

Açıq etiraf etməliyik ki, şagirdlərin fərdi, cütlər və qrup şəklində fəaliyyətini təşkil etmək bir çox cəhətdən çətindir. Buna görə şagirdlərin kollektiv fəallığını təmin edən üsullar daha çox tətbiq edilir. Qrup şəklində müzakirə üçün “Diskussiya” üsulu daha faydalıdır. Diskussiya mövzu ətrafında ideya, məlumat, təəssürat, təhlil və təkliflərin qarşılıqlı mübadiləsidir. Onun əsas vəzifəsi problemi təhlil edərək həlli yolunu tapmaq, düzgün qərar qəbul etmək üçün imkan yaradır. Müzakirə zamanı mövzuya aid bu və ya digər formada suallardan

da istifadə oluna bilər.

"Qurtuluş hərəkatı" mövzusunun "Diskussiya" üsulu ilə öyrədilməsi də səmərəli nəticələr verir. Bələdçiliyimlə şagirdlər diskussiya üsulu ilə "Qurtuluş hərəkatı" ilə bağlı tarixi hadisə, təzahür və proseslərə münasibətlərinin necə olduğunu öyrənmiş olurlar. Bu prosesdə şagirdlərin diskussiya mədəniyyəti, yəni danışanı dinləmək, sözünü kəsməmək, çıxış etmək istədikdə icazə istəmək və s. kimi davranışları aşkar olunur. Şagirdlərin müstəqil olaraq Azərbaycan tarixindən müəyyən tədqiqatlar aparmaq üçün "layihə hazırlığı" üsulu son dərəcə səmərəlidir.

"Bazar iqtisadiyyatına doğru, iqtisadi dirçəlişin başlanması" mövzusunun tədrisi şagirdlərin əvvəlcədən müəyyən müddət ərzində hazırladıqları və sonra təqdim etdikləri müstəqil tədqiqatlara əsaslanır. Şagirdlər bu prosesdə bir neçə cəhətdən faydalanırlar. Məsələn, bazar iqtisadiyyatı və iqtisadi dirçəlişlə əlaqədar tarixi faktlar və hadisələrin digər fənlərlə əlaqəsini göstərmək, tədqiqat fəaliyyəti ilə əlaqədar vaxtdan səmərəli istifadə edilməsi, şagirdlərin bir-birinə və ünsiyyətdə olanlarla qarşılıqlı fəaliyyətdə olması, bazar iqtisadiyyatı və iqtisadi dirçəlişlə bağlı tarixi hadisə və təzahürlərin hər hansı bir əməliyyatı daha dərindən öyrənməyə şəraitin yaradılması, mövzu ilə əlaqədar əlavə ədəbiyyatdan istifadə bacarığı, sosial və yaradıcı tədqiqat vərdişləri qazanılması və b. vərdişlərə yiyələnirlər.

Ənənəvi təlimlə müqayisədə interaktiv təlimdə qarşılıqlı təsir dəyişir: aparıcının fəallığı öz yerini şagirdlərə güzəştə getməli olur, aparıcının əsas vəzifəsi şagirdlərin təşəbbüsü üçün şərait yaratmaqdan ibarət olur. Fəallıq, təşəbbüskarlıq və birgə fəaliyyətdə əməkdaşlıq interaktiv təlim metodlarını səciyyələndirən əsas cəhətdir. Burada şagirdlərin fəallığının fiziki (danışmaq, yazmaq, dinləmək, rəsm etmək), idraki (müəllimin şərhinə əlavə və düzəlişlər etmək, problemin həllini müstəqil tapmaq və s.) və sosial (sual vermək, suallara cavab vermək, fikir mübadiləsi və s.) formaları bir-biri ilə sinxron şəkildə əlaqələnmiş olur.

Ənənəvi dərsdən fərqli olaraq hazırda Azərbaycan tarixi fənninin tədrisi fəal təlimə əsaslanır. Kurikulumun tətbiqi tədrisin fəal təlim vasitəsilə keçirilməsi tələbini qarşıya qoyaraq standartların reallaşdırılmasına xidmət edir.

Qloballaşan dünyada informasiya bolluğu yeni nəsil kadrların hazırlanmasın labüd edir. Bu gün təhsil siyasəti texnoloji və mədəni sahələrdə innovativ qabiliyyətə malik mütəxəssis hazırlamaqdadır. Təhsil sahəsində sürətli inkişaf və dəyişikliklər baş versə də, özündə bir çox problemləri saxlamaqdadır. Çünki informasiya texnologiyalarının sürətlə inkişaf etdiyi bir dövrdə əldə olunan bilik və dəyişikliklər öz əhəmiyyətini itirir. Bunu nəzərə alan dövlətimiz innovativ ideyaların tətbiqi ilə bağlı dünyanın bir sıra təhsil ocaqları ilə sıx əməkdaşlıq edir. Təhsilə yönəldilən dövlət vəsaitinin artması dövlət tərəfindən təhsilə göstərilən qayğı ilə bağlıdır.

Son illər Azərbaycanda dini və etnik tolerantlıq sahəsində bir çox uğurlu işlər görülmüşdür. Dinindən, milli mənsubiyyətindən, irqindən asılı olmayaraq, Azərbaycan ərazisində yaşayan hər bir xalq mehriban və əmin-amanlıq şəraitindədir.

Bu gün dövlətimiz tərəfindən mədəniyyətlərarası dialoqların təbliğatı və təşviqatı, o cümlədən Azərbaycan ərazisində keçirilən bir sıra mədəniyyətlərarası simpoziumların baş tutması ölkəmizi beynəlxalq aləmdə tolerant, mədəniyyətlərin qovuşduğu bir məkan kimi tanıdır.

Azərbaycan sivilizasiyaların və mədəniyyətlərin mərkəzində yerləşir, burada milli müxtəlifliklər vardır. Çoxmillətlilik və

çoxmədənilik xalqın formalaşdırılmasında, millət kimi təşkilatlanmasında misilsiz rol oynayır.

Multikulturalizm çoxlu sayda xalqların adət və ənənələrini ümumiləşdirən bir sistemdir. Səfəvilər dövləti başda olmaqla sonrakı XIX-XX əsrlərdə millətin təşəkkülünün formalaşdığı bir şəraitdə Azərbaycanda yaşayan digər etnik xalqlar multikultural dəyərlərini özündə ehtiva etmişdir.

Azərbaycan tarixi daim müxtəlif xalqların və mədəniyyətlərin birləşdiyinin şahidi olmuşdur. Bir coğrafi məkanda yaşayan müxtəlif xalqlara məxsus milli ruhun, vahid milli dəyərlərinin qorunub hörmətlə saxlanması dövlətçiliyimizin möhkəmləndirilməsi yolunda atılan addımlardan biridir.

Azərbaycan tarixi fənninin tədrisində bununla əlaqədar çoxlu nümunələr vardır ki, gənc nəslin milli-mənəvi təcrübəsində bunlar əhəmiyyətli rol oynayır.

Təhsil müəssisələrində Azərbaycan tarixi fənninin tədrisi prosesində müasir təlim texnologiyalarının tətbiqi dünya tələblərinə cavab verən kadrların yetişməsinə şərait yaradır. Belə ki, müasir təlim metodlarına müəllim tərəfindən həyata keçirilən müvafiq fəaliyyət, təhsilalanla müəllimin təlim vəzifələrinin həllinə yönəlmiş yeni yanaşmalar təhsilin keyfiyyətini yüksəltmək məqsədi daşıyır. Təsadüfi deyil ki, XXI əsr “Təhsil əsri” adlandırılır. Bu baxımdan yüksək intellektual səviyyəli insan kapitalının formalaşması labüddür.

***Rəyçi: p.e.d. V.Orucov***

## İstifadə edilmiş ədəbiyyat

1. Əmirov M. Tam orta məktəblərdə tarixin fəal–interaktiv təlim metodikası. Bakı, 2011.

2. Çələbiyev N. Ənənəvi və interaktiv təlim metodları: müqayisələr və paralellər.

3. Əsgərov Ş. Təhsilimiz: dünən bu gün və sabah. Bakı, 2000.

4. Крылова М. Перспективы науки и образования. Москва, 2016.

**С.Бехбутова**

**Новые подходы в учебном процессе**

**Резюме**

В статье инновационные методы обучения, изучения опыта учащихся школах предмет в соответствии с современными стандартами, в том числе межкультурных отношений и сближения, обеспечивающих развитие методов организации учебного процесса усовершенствования, дается ряд предложений связанных с применением истории Азербайджана, повышение квалификаций новых педагогических методов осуществляемых в системе образования.

**S.Behbudova**

**New approaches to teaching process**

**Summary**

The article in the education system innovative training methods, a new study of pedagogical practices, teacher student relations. The history of modern educational standards of discipline in schools, including the convergence of intercultural relations and ensuring the development of the educational process methods are a number of proposals to improve the organization.



# YENİ YARADICI METODLARIN KÖMƏYİ İLƏ DƏRSLƏRİN QURULMASI

**Gülşən Mustafayeva,**
***Xətai rayonu, 64 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *internet, informasiya, şəxsiyyətin inkişafı, yaradıcı texnologiya, oynayaraq öyrənmək.*

***Ключевые слова:*** *интернет, информасия, повышение личности, творческая технология, учиться играючи.*

***Key words:*** *internet, information, improvement, creativi technology, learning by playing.*

Azərbaycanda təhsil islahatı uğurla həyata keçirilir. Təhsilin keyfiyyətinin yaxşılaşdırılması, cəmiyyət üçün inkişaf etmiş, beynəlxalq standartlara cavab verə biləcək şəxsiyyətin formalaşdırılması – sosial-iqtisadi və mədəni inkişafın əsasını təşkil edir. Bu şəxsiyyəti yetişdirmək üçün ailə ilə yanaşı, müəllimlərin də üzərinə böyük məsuliyyət düşür. Pedaqoji təmayüllü müəssisələrdə isə bu, xüsusilə, diqqət mərkəzində olmalıdır.

Bu gün qarşımızda duran əsas vəzifələrdən biri texniki tərəqqi dövründə yeni təhsil islahatından, Milli kurikulum və fəal təlimin üsul və vasitələrindən xəbərdar olan, İKT-dən istifadə etməklə dərslərini quran müəllimlər hazırlamaqdır. Təhsildə özülün möhkəm qoyulması nailiyyətlərin artmasına səbəb olur. Demək, təlimin, xüsusilə, ibtidai təlimin səmərəlilik dərəcəsinin artırılması başlıca şərt kimi daim diqqətdə olmalıdır.

Təcrübə göstərir ki, uzun illər ənənəvi yollarla dərs keçən müəllimlər yeniliklərlə işləməkdə çətinlik çəkirlər. Lakin pedaqoji biliyini artırmağa, interaktiv üsullarla fəal dərslərə üstünlük verən müəllimlərimiz də az deyildir. Keçirilən tədbirlər, dərslər və müşahidələrdən müəyyənləşdirilmişdir ki, pedaqoji texnologiyaların tətbiqi ilə əlaqədar metodiki vəsaitlərə, dərsliklərə ciddi ehtiyac duyulur.

Avropada artıq çoxdandır ki, informasiya texnologiyalarına gənclərin təhsilinin keyfiyyətini artırmaq üçün effektiv vasitə kimi baxılır. Yeni texnologiyalar düzgün istifadə edildikdə ibtidai, orta, ali təhsilin səviyyəsini yüksəltməyə və intelektual cəmiyyətin formalaşmasını sürətləndirməyə qadirdir.

Yeni metodlarla qurulan dərsdə idrakı inkişafın parametrlərini nəzərə almaq, ona imkan və şərait yaratmaq əsas amil hesab edilir. Bu zaman təhsili bilavasitə inkişafyönümlü bir proses kimi stimullaşdırmaq əsas vəzifəyə çevrilir. Belə hallarda təhsilin keyfiyyəti, eyni zamanda, rəqabətliliyi zəruri cəhətlər kimi diqqət mərkəzində saxlanmalıdır. Təbii ki, keyfiyyət anlayışında şagirdlərin bir şəxsiyyət kimi təhsil prosesində qazanmış olduğu dəyərlər (kompetensiyalar) əhatə olunur. Onlar şagirdin idrakı, hissi və psixomotor fəaliyyətlərinin fonunda bütöv şəxsiyyətin inkişaf səviyyəsini göstərə bilir. Bunlar şagirdlərin qazanmış olduğu və hələ qabiliyyətlər səviyyəsinə çatmayan bilik və bacarıqlardan fərqlənir.

Müasir ibtidai təhsilin üstünlük verdiyi məqsəd uşağın şəxsiyyətinin inkişaf etdirilməsidir. Bu məqsəd təlim prosesinin humanistləşdirilməsi, uşağın əsaslı inkişafı üçün potensialın yaradılması ilə əldə olunur. Bu məqsədə çatmaq üçün inteqrasiya əsasında təlimdən istifadə olunmalıdır.

Təhsildə inteqrasiya prosesləri, onun psixoloji və pedaqoji baxımdan təhlili zəruri olan, kifayət qədər mürəkkəb, göstəricilərinin müxtəlifliyinə görə kompleks və hərtərəfli bir anlayış kimi çıxış edir.

İnteqrasiya əsasında təlimin əsas məqsədi dünya haqqında bütöv təsəvvür yaratmaqla şagirdlərin əqli inkişafının təmin edilməsi ilə bağlıdır, buna görə də biliklərin psixofizioloji əsaslarını, uşaqlıqda əsas təfəkkür fəaliyyətinin inkişafının faktiki xüsusiyyətləri haqqında dəqiq təsəvvürləri müəyyənləşdirmək lazımdır.

Təlimin nəzəri və praktik əsaslarının təhlili göstərir ki, bilikləri qavrama mexanizminin və onların inteqrasiya prosesi, iki psixoloji konsepsiyaya: əqli fəaliyyətin mərhələli formalaşması nəzəriyyəsi (P.Y.Qalperin, A.N.Leontyev, N.F.Talızina) və əqli fəaliyyətin assosiativ-reflektor təbiəti təliminə (Y.N.Kabanova-Meller, N.A.Mençinskaya, Y.A.Samarin) söykənir.

Tədris zamanı şagirdlər üçün əsas maraqlı yaradıcı texnologiya internetdə mövcud olan maraqlı resurslar var. Bu resursların fərqli və özəlliyi ondan ibarətdir ki, tədris prosesində şagirdə tanış olmayan, lakin onun üçün əhəmiyyət daşıyan, real həyatdan götürülmüş ən vacib problemin həllinə, onun malik olduğu və əldə edəcəyi biliklərdən istifadə etmək öyrədilir. Müəllim yeni informasiyaların alınma mənbəyini göstərə bilir və bu informasiyadan necə axtarmağın mümkün olduğunu deyə bilir, uşağı istiqamətləndirə bilir. Layihələr metodundan uşaqlar fərdi, cütlər və qrup şəklində müəyyən vaxt ərzində müstəqil fəaliyyət göstərməyə, həmişə hansısa bir problemi həll etməyə yönəlir. Problemin həllində müxtəlif təlim metodları və vasitələri tətbiq edilməklə yanaşı, həm də müxtəlif elm, texnika sahəsində sınaqdan çıxmış biliklərdən interaktiv şəkildə istifadə etməsi nəzərdə tutulur. Müasir pedaqoji texnologiyaların bünövrəsi kimi layihələr metodu-müxtəlif təlim vasitələri və informasiya texnologiyalarından istifadə etməklə reallaşır. Burada həm müasir (computer telekommunikasiyaları, elektron baza göstəriciləri, video və multimedia vasitələri, faks, video rabitə), həm də ənənəvi (elm və məlumat kitabları, video yazıları və b.) tədris vasitələrindən istifadə edilə bilər. Həmçinin layihələr metodu bir kompleks problem üzrə yerinə yetirilir. Oyun və oyun dəqiqələrindən istifadə etmək bu çətinliklərin aradan qaldırılmasına çox kömək edir.

Dərs prosesində oyunlardan istifadə olunması aşağıdakı məqsədlərin reallaşmasına imkan yaradır:

-Didaktik məqsədlər: dünyagörüşünün genişlənməsi, dərketmə qabiliyyətinin artması, qazanılmış bilikləri təcrübədə tətbiq etmə bacarığı, praktik fəaliyyət üçün zəruri olan bacarıq və vərdişlərin, həyati bacarıqların formalaşması, əmək bacarıqlarının inkişafı.

-Tərbiyəedici: müstəqilliyin, möhkəm iradənin, əməkdaşlığın, kollektivçiliyin, kommunikativliyin, ünsiyyət qurma, bir-birinin fikrinə hörmətlə yanaşma, dinləmə bacarığının tərbiyə edilməsi, formalaşması.

-İnkişafetdirici: diqqətin, yaddaşın, nitqin, mühakimə yürütmə qabiliyyətinin (müqayisə etmə, analogiyaları tapma, qarşı-qarşıya qoyma), məntiqi, tənqidi, yaradıcı təfəkkürün, optimal qərarların tapılması bacarığının, motivasiyanın inkişafı

-Sosiallaşma: cəmiyyətin norma və dəyərlərinə uyğun özünü aparma, mühitin şərtlərinə uyğunlaşma, gərginliyin (stressin) idarə olunması, özünənəzarət, ünsiyyət qurmağı öyrənmək.

Oyun prosesində şagirdlər özləri də hiss etmədən müxtəlif tapşırıqları yerinə yetirir, tədqiqatçı rolunda olur, nələrisə müqayisə etməli, müxtəlif hərəkətləri yerinə yetirməli, şifahi hesablamalar aparmalı, məsələlər həll etməli olurlar. Oyun şagirdlərdə qələbə qazanmaq həvəsini, marağını oyadır, uşaqlar oyunun qaydalarına əməl etməklə daha cəld, hazırcavab olmağa, tapşırığı dəqiq həll etməyə çalışırlar. Tədrisyönümlü oyunlardan istifadə bu gün ən aktual məsələlərdən biri olan

şagirdlərin oxuyub-anlama bacarığının daha da inkişaf etdirilməsinə kömək edir.

Oyunlardan istifadə şagirdlərin intizamlı olmasına çox kömək edir. Belə ki, hər bir oyunda müəyyən qaydalara riayət olunmalıdır. Oyun zamanı uşaqlar yoldaşlarının istəkləri və maraqlarını nəzərə almağı, təmkinli, daha məsuliyyətli olmağı öyrənirlər. Oyunlar özünənəzarət və özünüqiymətləndirmə bacarıqlarını formalaşdırır. Məsələn, dərs prosesində bəzi şagirdlər müəllim, bəziləri isə şagird rolunda olur. Bu cür oyunları cütlərlə, qruplarda da keçirmək olar. "Kim daha cəlddir" oyununu qruplararası keçirdikdə uşaqlar təkcə özləri üçün narahat olmur, qrup yoldaşlarının da fəal olmasına kömək edirlər.

Oyun texnologiyalarından dərs zamanı istifadə şagirdlərin hamısının fəallaşmasına şərait yaradır. Zəif, utancaq, azdanışan uşaqlar belə oyun zamanı bacarıqlarını nümayiş etdirir, onların öz fikrini söyləmə, əməkdaşlıq etmə, özünün və yoldaşlarının fəaliyyətini təhlil etmə, şifahi nitq, oxuyub-anlama, dinləmə, fikrini düzgün ifadə etmə bacarıqları inkişaf edir. Beləliklə, oyun texnologiyaları tədris materialını əlçatan, maraqlı, obrazlı şəkildə öyrətməyə, biliklərin daha yaxşı mənimsənilməsinə kömək edir, şüurlu öyrənməyə maraq yaradır.

Oyunlardan istifadə etməklə öyrətmək və oynayaraq öyrənmək o qədər də sadə məsələ deyil, amma dərs prosesi ilə əyləncəni birləşdirərək hər bir dərsdə bayram əhvali-ruhiyyəsi yaratmaqla onun unikallığını artırmaq olar. Buna görə də şagirdlərin biliklərinin ümumiləşdirilməsi və sistemləşdirilməsi formalarından biri kimi müxtəlif tədrisyönümlü oyunlardan istifadə olunması həmişə müsbət nəticə verir.

Bütün bu qaydada dərslərimizin qurulması şagirdlərdə məntiqi tənqidi təfəkkürün yaranmasına gətirib çıxaracaq və son nəticədə dərslərimizdə əsaslı dönüş olacaq.

***Rəyçi: dos. H.Cəfərov***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.
2. Bayramov V. Müasir təlim metodlarının və yeni pedaqoji texnologiyaların tətbiqinə dair. Bakı, 2004.
3. Əhmədov A., Abbasov Ə. Kurikulumların hazırlanması və tətbiqi məsələləri. Bakı: Kövsər, 2008.
4. Hacıyeva N. və b. Həyatı bacarıqlara əsaslanan təhsil. Orta ümumtəhsil məktəblərinin ibtidai sinif müəllimləri üçün tədris vəsaiti. Bakı, 2006.

**Г.Мустафаева**

**Создание уроков при помощи новой методикии**

**Резюме**

В етой статеье приводятся факты и способы помощи правильного пользования учениками интерактивной среды, психологических игр и информацищнных технологий для повышения уровня и качества учебы формировании интеллекттуального общества.

**G.Mustafayeva**

**Constructing of the lessons with the help of the new creative methods in the primary education**

**Summary**

In the present article interactive teaching atmosphere indicates the facts about how to help to improve the quality and level of the youth education and fasten the forming of intellectual society by properly using psychological games and information technologies.



# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ METODBİRLƏŞMƏLƏRİN FƏALİYYƏT İSTİQAMƏTLƏRİ

**Aynurə Mahmudova,**
***fəlsəfə doktoru proqramı üzrə doktorant***

***Açar sözlər:*** *metodbirləşmə, fəaliyyət planı, müəllimlərin peşəkarlıq səviyyəsi, kadr strukturu, məktəb direktoru.*

***Ключевые слова:*** *методическое объединение, план действий, уровень профессионального мастерства учителей, кадровый структур, директор школы.*

***Key words:*** *methodological association, action plan, level of professional skills of teachers, personnel structure, school director.*

Müasir dövrdə təhsil sistemi əsaslı şəkildə cəmiyyətin sosial-iqtisadi inkişafına təsir göstərir. Təsadüfi deyil ki, müxtəlif ölkələrin alimləri XXI əsrdə insanlıq qarşısında duran vəzifələrdən danışarkən, hər şeydən əvvəl, çalışırlar ki, təhsilin inkişaf istiqamətlərini müəyyənləşdirsinlər.

Təhsilin inkişaf perspektivləri hamını – ölkə miqyasında idarəetmə qərarlarını qəbul edənlərdən tutmuş, təhsil müəssisəsi rəhbərlərini, elmi işçiləri, dərslik müəlliflərini, metodistləri, praktik müəllimləri, bir sözlə, müxtəlif səviyyələrdə təlim-tərbiyə prosesini təşkil edənləri və nəhayət, valideynləri, bütün ictimaiyyəti narahat edir, düşündürür, çıxış yolları axtarmağa vadar edir.

Təhsildə keyfiyyət müasir şəraitdə məktəbdə çalışan müəllimlərin metodik baxımdan ixtisaslarının artırılması və təkmilləşdirilməsi qarşısında yeni tələblər qoyur. Bu zərurət nəticəsində “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” sənədində keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün beş strateji istiqamətdə genişmiqyaslı tədbirlər nəzərdə tutur [5].

Strategiyanın ikinci strateji istiqaməti [5] təhsil sahəsində insan resurslarının müasirləşdirilməsini nəzərdə tutur. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşdırılmasına xidmət edir və özündə təhsilverənlərin peşəkarlığının yüksəldilməsi, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulmasını, təhsilalanların istedadının aşkar olunması və inkişafı ilə bağlı, habelə xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasının yaradılmasını ehtiva edir.

“Ümumtəhsil məktəbinin Nümunəvi Nizamnaməsi”nin 3.7 bəndində də qeyd olunmuşdur: Ümumtəhsil məktəbi dövlət təhsil proqramlarının (kurikulumlarının) yerinə yetirilməsi üzrə təşkilati-pedaqoji və metodik tədbirlərin həyata keçirilməsində müstəqildir [2]. Bu prosesin reallaşdırılması bir vəzifə kimi daha çox müəllimlərin

üzərinə düşür.

Məktəbdə müəllimlərin metodiki sahədə apardığı iş, əsasən, metodbirləşmələrdə mərkəzləşir. Metodbirləşmələr müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsində daha çox yayılmış, özünü doğrultmuş metodik işin kollektiv formalarından biridir. Metodbirləşmələrin təşkili formaları (məktəbdaxili, məktəblərarası və rayon metodbirləşmələri), onların işinin məzmunu pedaqoji və metodik ədəbiyyatda müəyyən qədər işıqlandırılmışdır.

Metodbirləşmə təhsil proqramlarının metodiki təminatının təkmilləşdirilməsinə imkan verən məktəbin daxili struktur bölməsidir və müəllimlərin peşə ustalığını artırmağa xidmət edir. Metodbirləşmə bir fənn üzrə və ya təhsil sahəsi üzrə (humanitar fənlər, xarici dillər, texniki fənlər, təbiət-riyaziyyat fənləri, təbiət fənləri və s.) [3] ən azı üç müəllimin iştirakı ilə təşkil olunur. Metodbirləşmələrin tərkibinə qarışıq fənn müəllimləri də daxil ola bilər. Metodbirləşmələrin sayı, onların tərkibi, məktəbin qarşıya qoyulmuş məqsədlərinin kompleks həll yolları məktəb direktorunun əmri ilə təsdiq edilir. Metodbirləşmələr tədris işləri üzrə direktor müavinlərinin, metodistlərin təklifi ilə direktor tərəfindən yaradıla və ya ləğv oluna bilər. Metodbirləşmələr təlim-tərbiyə işləri üzrə direktor müavinlərinə tabedirlər. Metodbirləşmənin işinə direktorun metodiki işlər və təlim-tərbiyə işləri üzrə direktor müavinləri vasitəsilə direktorun təsdiq etdiyi məktəbin daxili metodiki planı və məktəbdaxili idarəetməyə əsasən məktəb direktorları nəzarət edir. Metodbirləşməyə direktor və metodbirləşmə üvlərinin razılığı ilə daha çox pedaqoji səriştəyə malik müəllim rəhbərlik edir.

Tədris ili ərzində ən azı dörd-beş dəfə metodbirləşmə iclası keçirilir [3]. Bunlar əsasən ilin əvvəlində, yarımilin sonunda, ilin sonunda, fənn üzrə açıq dərslərin təşkilində, məktəbdənkənar tədbirlərin keçirilməsi zamanı və s. təşkil olunur. Metodbirləşmə rəhbəri hər iclasda metodiki işlər üzrə direktor müavinini iclasla bağlı məlumatlandırır. İclas protokol şəklində jurnalda rəsmiləşdirilir. Müzakirə olunan məsələlərin hər biri üzrə tövsiyələr protokolda qeydə alınır.

Məktəbdə metodbirləşmələrin işi necə təşkil olunmalıdır? Bu suala cavab tapmaq üçün əvvəlcə fikirləşmək lazımdır ki, təhsil müəssisəsi hansı təlim-tərbiyə vəzifələrini həll edir və müasir dövrdə məktəbin qarşısında duran problemləri hansı qüvvə vasitəsilə həll etmək planlaşdırılır. Təhsil müəssisələrində metodbirləşmələrin fəaliyyəti sistemli və altsistemli xarakter daşımalıdır. Belə ki, müxtəlif fənləri tədris edən fənn müəllimləri metodbirləşmələrin əsas fəaliyyət istiqamətlərini müəyyənləşdirməlidirlər. Bura ixtisasartırma, özünütəhsil, iş təcrübəsinin yayılması və fəaliyyətin ümumiləşdirilməsi, iş təcrübəsinin ümumiləşdirilməsi, müəllimlərin əldə etdikləri metodiki uğurlarının müəyyən olunması və s. daxildir. Metodbirləşmələrin əsas sistemi kadr hazırlığı və müəllimlərin peşəkarlığının hazırlıq səviyyəsi, tədris olunan fənlər və struktur xüsusiyyətləri, həmin dövrdə tədrisin məzmunu, şagirdlərin bacarığı, onların ehtiyac və tələbatları və s. nəzərdə tutur.

Metodbirləşmənin fəaliyyətinin təşkili aşağıdakı komponentləri özündə əks etdirir [3]:

- kadr strukturunun xüsusiyyətləri;
- vəzifələrin əsaslanaraq tərtib edilməsi, düşünülmüş iş planı;
- həmin dövrdə məktəbin qarşısında duran əsas vəzifə;
- məktəbin ötən dövr ərzində fəaliyyəti və təhlili;
- iş planının əməli surətdə həyata keçirilməsi;
- müəllimlərin metodiki birliyinə

daxil olan digər qüvvələr;

- hərtərəfli qarşılıqlı yardım.

Kadr strukturunun xüsusiyyətləri məsələsi müəllimlərin peşəkarlıq səviyyəsi, onun təhsili, ixtisasartırması, attestasiyası, pedaqoji stajı, dərs yükü, elmi dərəcəsi, elmi adı, təltifləri, fərdi özünütəhsilləndirmə planı və digər fəaliyyət aspektləri ilə əlaqəlidir. Müəllimlərin peşəkarlıq keyfiyyətlərinin, onların yaradıcılıq potensialının düzgün müəyyən olunması metodbirləşmənin fəaliyyətinin savadlı şəkildə planlaşdırılmasına yardımçı ola bilər. Hazırlanan plan məktəbin və mühitin tələbatlarına cavab verməli, qarşıya qoyulan məqsədlər real və müyəssər olmalıdır. Metodbirləşmənin fəaliyyətinin planlaşdırılması bir çox xarici və daxili faktorlardan asılıdır. Bura müasir kurikulumlar, onların qarşısında duran məqsəd və vəzifələr də daxildir. Metodbirləşmə rəhbəri metodbirləşmənin fəaliyyətini məktəbin fəaliyyət planına uyğun planlaşdırır. Hazırlanmış plan iclasda müzakirədən, müəyyən təhlillərdən sonra qəbul olunur. Əsasən aşağıdakı məsələlər üzrə təhlillər nəzərdə tutulur:

- metodbirləşmənin tərkibi, müəllimlər haqqında qısa məlumat, onların iş keyfiyyətinin qısa səciyyəsi;

- təlim prosesi və əldə olunmuş nəticələrinin səviyyəsinin ilkin diaqnostikası;

- tədris ilində illik və yarımillik yekun nəticələrin əvvəlki illə müqayisə olunması;

- müəllimlərin peşəkarlıq səriştəliliyinin inkişafı-nəticəyönümlü peşəkar fəaliyyət;

- eksperimental və elmi-metodiki işlərin hazırlanmasında iştirak;

- əsasən ümumi orta təhsil səviyyəsində təhsil alan şagirdləri nəzərə alaraq bu və digər metodlardan istifadə;

- məktəbdə və ya məktəbdənkənarda şagirdlərin təlim-tərbiyə işləri;

- pedaqoji mühazirə üçün məruzələrin, sinifdənxaric və məktəbdənkənar tədbirlərin planlaşdırılması;

- metodbirləşmə iclaslarında müzakirə ediləcək məsələlər, məruzə mövzuları, tematik planlaşdırmalar, "açıq dərs"lər və dərslərdə qarşılıqlı iştirak, onların keçirilməsi və müzakirəsi üzrə metodik işləmələr qrafiki;

- KSQ və BSQ materiallarının hazırlanması.

Nümunə olaraq, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin tabeliyində olan ümumtəhsil məktəblərinin fəaliyyət planında metodbirləşmə rəhbərlərinin icraçısı olduğu iki istiqamətdə bir neçə tədbiri nümunə göstərmək olar [6].

Şagird nailiyyətlərinin izlənilməsi istiqaməti üzrə:

– illik dərs planlaşdırmalarının müzakirəsi və təsdiqi;

– məktəbdaxili qiymətləndirmə vasitələrinin hazırlanması və təşkili üçün daimi komissiyanın yaradılması;

– fənn aylıqlarının təşkili;

– I-XI siniflərdə dərsdinləmələrin təşkili;

– texniki, ictimai və təbiət fənn bölmələri üzrə tədrisin keyfiyyətinin izlənilməsi məqsədilə monitorinqin təşkili;

– musiqi, texnologiya, təsviri incəsənət, fiziki tərbiyə, GÇH fənlərinin tədrisi vəziyyətinin öyrənilməsi;

– xarici dil fənninin tədrisi keyfiyyətinin öyrənilməsi məqsədilə monitorinqin təşkili;

– fizika, kimya, biologiya fənləri üzrə şagirdlərin nəzəri bilikləri praktik təcrübədə tətbiqetmə bacarıqlarının inkişafına xidmət edən laboratoriya məşğələlərinin təşkili vəziyyətinin öyrənilməsi;

– I-IX sinif şagirdlərinin inkişaf dinamikasının öyrənilməsi məqsədilə portfolioların aparılması vəziyyətinin öyrənilməsi;

– şagirdlərin məntiqi təfəkkürünün inki-

şaf etdirilməsi istiqamətində işin təşkili;

– ibtidai təhsil pilləsinin nəticələrinin V sinif təlim nəticələri ilə müqayisəli təhlili;

– I-IV siniflərdə düzgün yazı vərdişlərinin formalaşdırılması;

– II-IV siniflər arasında ana dili, riyaziyyat və həyat bilgisi fənləri üzrə məktəbdaxili olimpiadanın təşkili;

– I siniflərdə ana dili, riyaziyyat fənləri üzrə tədrisin keyfiyyətinin öyrənilməsi məqsədilə monitorinqin təşkili;

– IX siniflərdə ana dili və riyaziyyat fənləri üzrə sınaq qiymətləndirməsinin aparılması;

– V-IX siniflərdə düzgün yazı vərdişlərinin formalaşdırılması;

– V-IX siniflərdə təlim nəticələri zəif olan şagirdlər üçün ana dili və riyaziyyat fənləri üzrə xüsusi proqram əsasında əlavə məşğələlərin təşkili.

Müəllimlərin peşəkarlıq səviyyəsinin müəyyənləşdirilməsi istiqaməti üzrə:

– müəllimlərin ehtiyaclarının öyrənilməsi və onların müvafiq kurslara göndərilməsi;

– müəllimin peşəkarlıq səviyyəsinin müəyyənləşdirilməsi;

– təcrübə mübadiləsinin təşkili;

– gənc müəllim-peşəkar müəllim vəhdətinin yaradılması istiqamətində işin qurulması;

– səriştəli və peşəkar müəllimlərin təcrübəsinin öyrənilməsi;

– müəllimin innovativ təcrübəsinin müəyyənləşdirilməsi;

– müəllimlərin ehtiyaclarının öyrənilməsi və onların müvafiq kurslara göndərilməsi.

Metodbirləşmənin fəaliyyətinin bu istiqamətlər üzrə düzgün qurulması bir çox istiqamətlərdə keyfiyyətin qalxmasına gətirib çıxardır [4]:

• müəllimlər metodbirləşmələrin işində fəal iştirak edir, fənn metodbirləşmələri isə təlim-tərbiyə prosesinin səmərəli qurulmasında məsləhətçi funksiyalarını yerinə yetirirlər;

• direktor strategiyanı işləyərkən menecerlər qurumunun, müavinlərin, metodbirləşmə sədrlərinin və başqa məsləhətvericilərin köməyindən yararlanır;

• hər bir metodbirləşmənin işi onun rəhbəri (metodist) tərəfindən koordinasiya olunur. Xüsusi treninq keçmiş müəllimlər tədris işinin korreksiyası və peşəyönümü ilə məşğul olurlar;

• kollegial təşkil modelində fənn metodbirləşmələri fənlərin tədrisi ilə bağlı bütün məsələlər üzrə (tədris proqramları, tədris metodları, qiymətləndirmə normalarının seçilməsi və s.) strategiyanı hazırlayır. Tədris proqramlarının müxtəlif sinif və qrupların bilik səviyyəsinə uyğunlaşdırılması məsələsi ilə məşğul olur;

• eyni bir metodbirləşmə daxilində müəllimlər həmişə metodik məsləhətləşmələr aparırlar. Bu məsləhətləşmələrin əsas məqsədi müxtəlif qabiliyyətli şagirdlərdən ibarət olan qruplarda tədris işinin metodlarını və texnikasını yaxşılaşdırmaq, inkişaf etdirməkdir;

• təhsil işinin inkişaf strategiyası məktəbin ali orqanı hesab edilən ümumi yığıncaqda qəbul edilir, bu yığıncaqda metodbirləşmələrin sədrləri, direktor və onun müavinləri iştirak edirlər;

• fənn metodbirləşmələrinin faydalı fəaliyyət göstərməsi üçün onun üzvləri olan müəllimlərin təlim-tərbiyə prosesində insani keyfiyyətlərə və təlimvermə bacarığına yiyələnmələrinə şərait yaradır.

Fikrimizcə, metodbirləşmələrin fəaliyyətinin düzgün qurulması müəllimlərin fəaliyyətinin səmərəliliyinin artmasına, o da öz növbəsində şagirdlərin müəyyən sahələr üzrə bacarıqlarının kəşfinə, onların inkişafına gətirib çıxaracaqdır. Bu baxımdan, məktəblərdə metodbirləşmələrin fəaliyyətinə xüsusi önəm verilməli, daim məktəbin direktoru tərəfindən onların fəaliyyəti tənzimlənilməlidir.

***Rəyçi: prof. A.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat


1. Mehrabov A. Azərbaycan təhsilinin müasir problemləri. Bakı, 2007.
2. http://www.cabmin.gov.az/?/az/pressreliz/view/437/ “Ümumtəhsil məktəbinin Nümunəvi Nizamnaməsi”nin təsdiq edilməsi haqqında (Nazirlər Kabinetinin 13 yanvar 2011-ci il 5 № li qərarı).
3. http://www.ucheba.com/met_rus/k_upravobraz/k_rukovoditel/met_ob.htm. Рыбина О.В. Работа методического объединения в школе. “Образование в современной школе ”. 2007, № 1.
4. http://82.194.5.14/images/tedqiqat2012/TPIhesabat1
5. http://www.president.az/articles/9779
6. http://mekteb36.testlerim.org/images/2. pdf


**А.Махмудова**

**Деятельности организации методического объединения**

**Резюме**

В статье говорится о деятельности организации методического объединения и о ее влиянии на качество современного образования. В статье также описываются компоненты организации методического объединения.

**A.Mahmudova**

**Organization of methodological unification**

**Summary**

In the article is spoken the activities of the organization of methodological unification and its impact on the quality of modern education. In the article is also described the components of organizing of methodological unification.



# ÜMUMİ TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ İDARƏETMƏNİN MODERNLƏŞDİRİLMƏSİ

**Yəhya Abbasov,**
***Bakı şəhəri, Ə.Ələsgərov adına 244 nömrəli tam orta məktəbin direktoru, fəlsəfə elmləri üzrə fəlsəfə doktoru***

Məqalədə müasir cəmiyyətdə təhsilalanların hərtərəfli formalaşmasında ümumi təhsil müəssisələrinin rolundan, son illər ölkəmizdə təhsillə bağlı aparılan islahatlardan danışılır. Azərbaycan Respublikasının təhsilin inkişafı üzrə Dövlət Strategiyasında idarəetmə ilə bağlı müəyyənləşdirilmiş istiqamətlər araşdırılır.

***Açar sözlər:*** *müasir təhsil, inkişaf, idarəetmə,təhsilalan, tərbiyə, rəhbər.*
***Ключевые слова:*** *современное образование, развитие, управление, обучаемые, образование (воспитание), руководитель.*
***Key words:*** *modern education, development, management, learner, education (bringing up), leader.*

Bu bir həqiqətdir ki, müasir qloballaşma şəraitində ölkələrin inkişafı təkcə iqtisadi göstəricilərlə, təbii sərvətlərlə deyil, təhsilin inkişaf səviyyəsi, təhsil sisteminin necə təşkil olunması ilə müəyyənləşdirilir.

Bu baxımdan təhsil sisteminin təməlində duran ümumi təhsil müəssisələri müasir cəmiyyətdə təhsilalanların təhsil almaq hüquqlarının təmin olunması üçün mühüm strateji əhəmiyyət kəsb edir. Çünki təhsilin bu pilləsi qarşısında qoyulan hədəflərin mürəkkəbliyi və önəmliliyi ilə seçilir. Təhsilalan uşaq və gəncləri xalqının milli-mənəvi dəyərlərinə hörmət edən, azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək, nəhayət, demokratik, hüquqi dövlətdə yaşamağa hazırlamaq, cəmiyyətin prinsipləri ruhunda tərbiyə etmək məktəbin əsas vəzifəsidir. Bütün dövrlərdə məktəblərdə təlim prosesinin səmərəliliyi, təhsilin inkişafı, şagirdlərin tərbiyəsi üçün optimal mühitin yaradılması bilavasitə həmin təhsil müəssisəsinin düzgün idarə olunması ilə bağlıdır. Məktəbin düzgün idarə olunması dərin bilik, bacarıq, peşəkarlıq, çeviklik, səriştəlilik, yeniliklərin mənimsənilməsi və s. kimi zəngin keyfiyyətlər tələb edir. Təsadüfi deyil ki, "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda deyildiyi kimi təhsil sahəsində idarəetmə islahatlarının başlıca istiqamətlərini təhsil prosesinin iştirakçıları arasında münasibətlər sisteminin, eləcə də tənzimləmə orqanlarının funksiyaları, səlahiyyətləri və cavabdehliyinin dəqiq müəyyən olunması, təhsil müəssisələrinin idarəetmə səlahiyyətlərinin və təhsilin nəticələrinə görə cavabdehliyinin artırılması, fəaliyyətinin monitorinqi və qiymətləndirilməsi, təhsilin keyfiyyətini ölçən göstəricilər sisteminin təkmilləşdirilməsi, təhsilin maliyyələşdirilməsinin onun keyfiyyətinə yönəldilməsi, adambaşına maliyyələşdirmə mexanizmlərinin gücləndirilməsi, nəhayət, təhsildə idarəetmənin

ictimailəşməsi prosesi təşkil edir.

İdarəetmə nədir? Məktəbin idarə edilməsini məqsədəuyğun qərarlar qəbul etməyə, idarə olunan obyekti təşkil etməyə, ona nəzarət etməyə, tənzimləməyə yönəlmiş fəaliyyət, düzgün informasiya əsasında işin təhlili və onun yekunlaşdırılması kimi şərh etmək olar:

- təhsil müəssisəsinin keyfiyyətli fəaliyyəti, tədris prosesi səmərəliliyinin məqbul və qaneedici olması bir sıra vacib amillərdən asılıdır. Bunlara aşağıdakıları daxil etmək olar;
- təhsil müəssisəsinin vəzifələrinin və hədəflərinin dəqiq müəyyənləşdirilməsi;
- təhsilalanların öz vaxtlarını maksimum dərəcədə konkret təlim və tərbiyə məsələlərinin həllinə sərf etməsinə yönəldilməsi;
- idarəetmənin vahid və əlaqəli şəkildə təşkili;
- təhsilverənlərin-müəllimlərin və idarəedicilərin peşəkarlıqlarını daim təkmilləşdirməsi, onların vahid komanda şəklində və yekdil amal uğrunda işləməsi;
- müəssisə daxilində hüquqi-normativ qayda-qanunların hökm sürməsi;
- valideynlər və ictimaiyyətlə sıx qarşılıqlı əlaqənin yaradılması, təhsil müəssisəsinin idarə olunmasının ictimailəşdirilməsi.

Hesab edirik ki, Azərbaycanın İnkişaf Konsepsiyasından irəli gələrək hazırlanmış və ölkə Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə təsdiq olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın əsas missiyası da ölkəmizin modernləşdirilməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla ölkəmizin beynəlxalq rəqabət qabiliyyətini yüksəltməkdən ibarətdir. Dövlət Strategiyası təhsil sahəsində aparılacaq islahatların əsas istiqamətlərini müəyyənləşdirir, Azərbaycan təhsilinin XXI əsrin qlobal çağırışlarına uyğun inkişaf yollarını aydınlaşdırır, nəhayət, təhsilin bütün pillələrində keyfiyyətcə yeni mərhələyə başlamağı-dövlət başçısının müasirləşmə konsepsiyasının təməl prinsiplərindən biri olan “qara qızılı insan kapitalına çevirmək” fəlsəfəsini reallaşdırmağı əsas hədəf kimi qarşıya qoyur. Strategiyada təsbit olunan 5 strateji istiqamətlərdən 3-cüsü “Təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması”ndan ibarətdir.

Bu baxımdan ümumi təhsil müəssisələrinin idarəetmə sistemindəki spesifik idarəetmə dəyərlərinə toxunmaq istədik. Bəllidir ki, ümumi təhsil müəssisələrinin pedaqoji sistemləri, idarəetmə dəyərləri müxtəlifdir. Onlar aşağıdakılar ola bilər:

1) dəyərlər-məqsədlər: Onlar iyerarxiyanın müxtəlif səviyyələrində tam pedaqoji idarəetmənin məqsədinin əhəmiyyəti və mənasını açıb göstərir. Bu məqsədlərə daxildir:

- təhsil sisteminin idarəetmə məqsədi;
- məktəbi idarəetmə məqsədi; pedaqoji və şagird kollektivini idarəetmə məqsədi;
- şəxsiyyətin özünütərbiyəsini və özünüinkişafını idarəetmə məqsədi və s.

Dəyərlər-məqsədlər idarəetmə fəaliyyətinin özünəməxsus tənzimləyicisidir;

2) dəyərlər-biliklər: İdarəetmə sahəsində biliklərin əhəmiyyəti və mənasını açır. Buraya idarəetmənin metodoloji əsasları, məktəbdaxili rəhbərlik, pedaqoji prosesin idarə olunmasının effektiv meyarlarını bilmək və s. daxildir.

3) dəyərlər-münasibətlər: Pedaqoji prosesin iştirakçıları arasında qarşılıqlı

münasibətlərin, özünə münasibətin, özünün peşə fəaliyyətinə münasibətin, pedaqoji və şagird kollektivlərində şəxsiyyətlərarası münasibətlərin, bu kollektivlərin məqsədyönlü formalaşdırılması və idarə olunmasının əhəmiyyətini açır;

4) dəyərlər-keyfiyyətlər: İdarəetmənin subyekti olan məktəb rəhbərinin-təhsil menecerinin müxtəlif fərdi, kommunikativ, davranış keyfiyyətlərini açır. Bu keyfiyyətlər xüsusi qabiliyyətləri əks etdirir:

- öz fəaliyyətini proqnozlaşdırmaq və onun nəticələrini qabaqcadan görməyi bacarmaq qabiliyyəti;
- öz məqsəd və hərəkətlərini başqalarının məqsəd və hərəkəti ilə əlaqələndirmək qabiliyyəti;
- əməkdaşlıq etmək və əlbir idarə etmək qabiliyyəti və s.

Məktəb direktorunun idarəetmə mədəniyyətinin texnoloji komponenti idarəetmə qaydalarını və priyomlarını özündə birləşdirir. Məktəbdaxili idarəetmənin texnologiyası spesifik pedaqoji vəzifələri həll etməyi nəzərdə tutur. Bu vəzifələrin həlli pedaqoji prosesin təhlili və planlaşdırılması, təşkili, nəzarət və tənzimləmə sahəsində rəhbərin bacarıqlarına əsaslanır.

Son illər Azərbaycanda bütün sahələrdə olduğu kimi, təhsillə bağlı Dövlət təhsil Strategiyasına uyğun olaraq çoxsaylı layihələr, yeniliklər, kordinal islahatlar həyata keçirilir. Bu baxımdan "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nı xüsusi vurğulamaq lazımdır. Strategiyada səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılması, ölkədə keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli təhsilverənlərin peşəkar müəllim və təhsil menecerlərinin yetişdirilməsi, təhsildə yeni idarəetmə sisteminin formalaşdırılması, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin, nəhayət, təhsilin dayanıqlı maliyyələşmə mexanizminin yaradılması üçün beş strateji istiqamətdə tədbirləri nəzərdə tutur.

Yuxarıda deyildiyi kimi, Strategiyada üçüncü strateji istiqamətdə təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinə malik dövlət-ictimai xarakterli və dövlət-biznes partnyorluqlarına əsaslanan idarəetmə sisteminin formalaşdırılması nəzərdə tutulub. Strategiya inkişaf etmiş ölkələrin təcrübəsini örnək alaraq təhsildə idarəetmənin ictimailəşməsi prosesinin sürətlənməsi amilini önə çəkir. Əlbəttə, təhsil strategiyasının uğurla həyata keçirilməsində və təhsilin keyfiyyətinin dayanıqlı yüksəlişində maraqlı tərəflərin cəlb olunmasını təmin edən səmərəli idarəetmə mühüm rol oynayır. Bu, ilk növbədə bütün təhsil müəssisələrinin, o cümlədən ümumi təhsil müəssisələrinin müstəqilliyinin artırılmasını, valideyn, şagird, tələbə və təhsil prosesinin digər iştirakçılarını geniş cəlb etməklə təhsil ocaqlarının idarə olunmasını, nəticəyönlü menecmentin və digər çağdaş idarəetmə texnologiyalarının prosesə tətbiqini tələb edir. Bu istiqamət təhsil sistemində tənzimləmə və idarəetmənin beynəlxalq təcrübə əsasında modernləşdirilməsi, təhsil müəssisələrində nəticəyönlü və şəffaf idarəetmə modelinin, təhsilin keyfiyyətinin təminatı və idarə olunması üzrə yeni məlumat və hesabat sistemlərinin yaradılması, məktəbəhazırlıq təhsilinin icbariliyinin təmin olunması, erkən yaşlı uşaqların məktəbəqədər təhsillə əhatəsinin 90% səviyyəsinə çatdırılması, 12 illik ümumi təhsil sisteminin yaradılması kimi hədəfləri əhatə edir. Sənəddə təhsil müəssisələrinə idarəetmə, akademik, maliyyə və təşkilati muxtariyyət verilməsi məsələsi də öz əksini tapır.

Bundan başqa, təhsil sahəsində dövlət-biznes partnyorluğu sistemi yaradıl-

ması, maraqlı tərəflərin iştirakı təmin edilməklə təhsil müəssisələrinin dövlət-ictimai xarakterdə (Valideyn-Müəllim Assosiasiyası, İdarəedici Şura, Qəyyumlar Şurası və s.) idarə olunmasının təmin edilməsi məsələləri də öz əksini tapmışdır. Düşünürük ki, Strategiyanın bu istiqamətinin əhatə etdiyi məsələlərin reallaşdırılması nəticə etibarilə yaxın gələcəkdə təhsil prosesinin iştirakçıları arasında münasibətlər sisteminin, eləcə də tənzimləmə orqanlarının funksiyaları, səlahiyyətləri və cavabdehliyinin dəqiq müəyyən olunmasına, təhsil müəssisələrinin idarəetmə səlahiyyətlərinin və təhsilin nəticələrinə görə cavabdehliyinin artırılmasına təkan verəcək, fəaliyyətin monitorinqi və qiymətləndirilməsi, təhsilin keyfiyyətini ölçən göstəricilər sisteminin təkmilləşdirilməsinə, təhsilin maliyyələşdirilməsinin onun keyfiyyətinə yönəldilməsinə, adambaşına maliyyələşdirmə mexanizminin tətbiqi və bu zəmində stimullaşdırıcı mexanizmlərin gücləndirilməsinə, həmçinin təhsildə maliyyələşmə mənbələrinin yetərliyinin həllinə gətirib çıxardacaqdır.

Məsələnin bu cür qoyuluşu eyni zamanda inkişaf etmiş ölkələrdə olduğu kimi təhsildə idarəetmənin ictimailəşməsi prosesini sürətlənməyə kömək edəcəkdir.

Təcrübə göstərir ki, ümumi təhsil müəssisələrində idarəetmə fəaliyyəti aşağıdakı iyerarxik pillələr üzrə təşkil olunur:

– birinci pillə – məktəb direktoru;

– ikinci pillə – təlim-tərbiyə işləri üzrə müavinlər, sinifdənxaric və məktəbdənkənar tərbiyə işləri üzrə təşkilatçı;

– üçüncü pillə – pedaqoji kollektivin ictimai təşkilatları və kollegial idarəetmə orqanları;

– dördüncü pillə – müəllimlər, tərbiyəçilər və sinif rəhbərləri;

– beşinci pillə – müəllimlər və şagirdlər. Xüsusilə, yuxarı sinif şagirdləri, birgə fəaliyyət göstərən orqanlar (pedaqoji və şagird kollektivinin birgə şurası, müxtəlif komissiya və şuraların işi və s.).

– altıncı pillə – şagird kollektivi, gənclər və uşaq birlikləri, şagird özünüidarə orqanları;

– yeddinci pillə – şagird kollektivin bir üzvü kimi;

Tərbiyə edənlə, tərbiyə olunanın, təhsilverənlə təhsilalanın idarəetmədə birgə fəaliyyəti məktəblinin sosial çərçivədə təcrübəsini genişləndirir, məktəbdaxili pozitiv münasibətləri formalaşdırmağa kömək edir, həlledici mərhələlərdə öz fikrini deməyə imkan verir, müəllimlərlə ittifaq yaratmağa, onların yaxın köməkçisi olmağa istiqamətləndirir. Buna görə də müəllim və şagird idarəetmə orqanlarının birgə qərarının lazımlı, obyektiv və təxirəsalınmaz olması zərurəti meydana gəlir.

Məktəbi idarəetmənin məqsədi, onun strukturuna daxil olan sahələrin işinin məzmunu ilə bağlı olub, hər bir konkret şərait üçün müəyyənləşdirilir. Bunun üçün struktura daxil olan sahələrin hər birində mövcud vəziyyəti aşkara çıxarmaq, müəyyənləşdirmək və bunların nəticələrinə əsasən işi daha da təkmilləşdirmək, yaxşılaşdırmaq, onun səmərə və keyfiyyətini yüksəltmək üçün tədbirlər hazırlamaq daha əhəmiyyətli olur.

Hər bir sahə üzrə konkret məqsəd müəyyənləşdirmək tələb olunur. Məsələn, dərsin müzakirəsi müxtəlif məqsədlərlə aparıla bilər, müəllim fəaliyyətini öyrənmək, şagirdlərin bilik keyfiyyətini müəyyənləşdirmək, dərsdə seçilmiş metodların məqsədəuyğunluğu, istedadlı şagirdlərlə aparılan iş, əyani və texniki vasitədən istifadə və s. bu prosesdə fənlərin xüsusiyyətlərini nəzərə almaqla metodbirləşmələrdə hər bir müəllimin qarşısında qoyulan vəzifəni konkretləşdirmək və detallaşdırmaq üçün istiqamət verilir.

İdarəetmənin təşkilində şagird kol-

lektivinin fəaliyyəti möhkəm və dərin biliyə yiyələnməyə, şagirdlərin şüurlu fəaliyyətini inkişaf etdirməyə, müstəqil biliyini artırmağına stimul yaratmağa istiqamətləndirilir.

İdarəetmənin təşkilində valideynlər də kənarda qalmır. Onlar pedaqoji praktikumlar vaxtı ev tapşırıqlarını necə yerinə yetirmək qaydasını öyrənir və öz uşaqlarına bu sahədə kömək edirlər.

Məktəb rəhbərinin vəzifəsi idarəetmənin təşkilindəki bütün iştirakçıların fəaliyyətini müəyyənləşdirmək, işlərini stimullaşdırmaq üçün şərait yaratmaq, fərdi-psixoloji fəaliyyəti düzgün qiymətləndirmək üçün üfüqi və şaquli istiqamətlərdə hərəkət etməkdən ibarətdir.

Müasir təhsil sistemində idarəetmə prosesi, ümumiyyətlə, bütöv bir fəaliyyətin təşkili mürəkkəb sistemdir. Bu mürəkkəbliyi aradan qaldırmağın əsas yollarından biri pedaqoji menecmentin, yəni idarəetmənin prinsiplərinə düzgün əməl etmək və bu prinsiplərdən irəli gələn məsələləri, tələbləri demokratik şəkildə həyata keçirməkdir. Burada ən vacib amil insanın şəxsi ləyaqətinə hörmət edilməli, qarşılıqlı hörmət əsasında inam atmosferi, insanın öz imkanlarını aşkar edə bilmə şəraiti yaradılmalıdır. Bir sözlə, dəstəkləyici mühit təşkil olunmalıdır. Belə olduqdan sonra idarə edən şəxs məqsədlərini həyata keçirib istənilən nəticəni əldə edə bilər. Həmçinin idarəçi kollektiv üzvlərinin həyat tərzini, onların ümumi tələbatlarının nədən ibarət olduğunu bilməli və onların təminatı üçün maraqlı olduğunu özlərinə hiss etdirməlidir. Bəzən işə zərər vurmadan qarşılıqlı güzəştə getməyi bacarmalıdır.

Müasir təhsil sistemində idarəetmə prosesinin əsas iştirakçılarından biri də Valideyn-Müəllim Assosiasiyalarıdır. İnkişaf etmiş ölkələrdə, o cümlədən, ABŞ-da bu cür qurumlar fəaliyyət göstərir. Onlar ABŞ-da ən nüfuzlu, valideynləri birləşdirən bir təşkilatdır. ABŞ modeli olaraq bu model Azərbaycanda da tətbiq olunmağa başlanılıb. Assosiasiyanın əsas məqsədi şəxsiyyətin mənəvi inkişafı, məktəbin maddi-texniki bazasının təkmilləşdirilməsi, tədris-tərbiyə prosesi, təhsil xidmətlərinin siyahısının genişləndirilməsi, həmçinin məktəb işçilərinin, şagirdlərin və tədris prosesinin digər iştirakçılarının təhsil və tədris fəaliyyətinin yaxşılaşdırılması və genişləndirilməsini stimullaşdırmaq, uşaq və gənclərə qayğı göstərmək və onların müdafiəsi üçün müvafiq qanunların hazırlanmasında fəal iştirak etmək, təkliflər vermək və s.-dən ibarətdir. Bu istiqamətdə Dövlət Strategiyasına uyğun olaraq ümumi təhsil məktəblərində pilot layihə kimi reallaşdırılan layihələrdən biri də “Məktəblinin dostu” layihəsidir. Müəllim-şagird-valideyn üçbucağında münasibətlərin daha səmərəli müstəviyə çıxarılması baxımından “Məktəblinin dostu”nun üzərinə mühüm vəzifələr düşür.

Son illər ümumi təhsil məktəblərində idarəetmənin təkmilləşdirilməsi baxımından həyata keçirilən layihələrdən biri də məktəb direktorlarının işə qəbulu ilə bağlı yeni mexanizmlərin tətbiqi prosesinin kütləviləşməsi sayıla bilər. Geniş ictimaiyyət və təhsil işçilərinin böyük rəğbətini qazanmış bu layihənin tətbiqi ölkəmizdə ümumi təhsil müəssisələrinin idarəolunmasının modernləşdirilməsinə imkan verəcəkdir.

Eyni zamanda təhsil sistemində İKT-nin geniş tətbiqi təhsildə idarəetmənin beynəlxalq təcrübəyə uyğunlaşmasına və inteqrasiyaya təkan verəcəkdir.

Hesab edirik ki, “Azərbaycan təhsilinin XXI əsrin çağırışlarına cavab verən təhsilimizin gələcək inkişafının “yol xəritəsi” sayılan “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın icra mexanizmlərini nəzərdə tutan və dövlət başçısının 19 yanvar 2015-ci il tarixli sərəncamı ilə təsdiq olunmuş fəaliyyət planı-

na uyğun olaraq müasir təhsil sisteminin qurulması sahəsində başlanan məqsədyönlü islahatlar prosesi uğurla başa çatacaq.

Azərbaycan Respublikası Prezidentinin 6 dekabr 2016-cı il tarixli Fərmanı ilə təsdiq olunmuş “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi”ndə digər sahələrlə yanaşı, “İnsan kapitalının inkişaf etdirilməsi” strateji hədəfində təhsilin bütün pillələrində keyfiyyətin yüksəldilməsi və insan kapitalının inkişafının stimullaşdırılması nəzərdə tutulur.

İnanırıq ki, Azərbaycan müəllimlərinin XIV qurultayında bəyan edildiyi kimi, ölkəmizin təhsil işçiləri əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulan təhsil quruculuğu prosesini Prezident İlham Əliyevin rəhbərliyi ilə uğurla davam və inkişaf etdirəcək, Strategiyada qarşıya qoyulan bütün hədəflərə çatmağa nail olacaq, Azərbaycanda müasir təhsil sisteminin qurulması kimi tarixi zəfərə imza atacaqdır.

***Rəyçi: dos. Ə.Quliyev***

## İstifadə edilmiş ədəbiyyat

1.“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2013-cü il tarixli sərəncamı. //Azərbaycan məktəbi, 2013, №5.

2. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsi ilə bağlı “Fəaliyyət Planı”nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 19 yanvar 2015-ci il tarixli sərəncamı. //Azərbaycan məktəbi, 2014, №1.

3. “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi” Azərbaycan Respublikası Prezidentinin 6 dekabr 2016-ci il tarixli sərəncamı Fərmanı ilə təsdiq edilmişdir (verbal).

4. Azərbaycan müəllimlərinin XIV qurultayı (14 dekabr 2013-cü il).

5. Xəlilov S. Təhsil, təlim, tərbiyə. Bakı, 2005.

6. Xəlilov S. Elm haqqında elm. Bakı, 2011.

7. Süleymanova A. Təhsilin əsasları. Bakı, 2014.

**Я.Аббасов**

**Модернизация управленияв общеобразовательных учреждений**

**Резюме**

В статье говориться о роли учебных заведений во всестороннем формировании учащихся в современном обществе и недавние реформы в сфере образования в нашей стране. Направлении об Управлении Выявленные в Государственной Стратегии по Развитию Образования.

**Y.Abbasov**

**Modernization governance of general education institutions**

**Summary**

The article is about the role of educational institutions in comprehensive formation of learners in modern society and recent education reforms in our country. The guides about Management identified in the State Strategy for the Development of Education.



# TƏHSİLİN KEYFİYYƏTİ VƏ TƏLİM-TƏRBİYƏ İŞLƏRİ ÜZRƏ DİREKTOR MÜAVİNİ

**Xalidə Hüseynova,**
***Azərbaycan Respublikasının Təhsil İnstitutunun böyük elmi işçisi***

Məqalədə təlim-tərbiyə işləri üzrə direktor müavininin vəzifələri və təhsilin keyfiyyətinin yüksəldilməsində rolu açıqlanır. Vəzifələrin sadalanması, onların yerinə yetirilmə ardıcıllığının alqoritm şəklində verilməsi və fəaliyyət zamanı nəzərə alınması qarşıya qoyulmuş məqsədlərə nail olunmasına zəmin yaradır.

***Açar sözlər:*** *təlim-tərbiyə işləri üzrə direktor müavininin vəzifələri, təhsilin keyfiyyəti.*
***Ключевые слова:*** *задачи заместителя директора по учебно-воспитательного работа, качества образования.*
***Key words:*** *tasks of the deputy director for teaching and upbringing work, quality of education.*

Azərbaycanda təhsilin strateji fəaliyyət istiqaməti müəyyənləşdirilmiş, bu yöndə düşünülmüş, ardıcıl və sistemli işlər həyata keçirilməyə başlanmışdır.

"Təhsil millətin gələcəyidir" müddəasını irəli sürən və onun həyata keçirilməsini təmin etmək üçün mühüm qərarlara imza atan ulu öndərimiz Heydər Əliyevin uzaqgörən siyasətinin nəticəsi olaraq 1999-cu ildə "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı" qəbul olundu [1]. İslahatın həyata keçirilməsi üçün müvafiq planlar hazırlandı. "Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları", "Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" işlənib hazırlandı. Yeni təhsil proqramlarının tətbiq olunması üçün yeni nəsil dərsliklər və metodik vəsaitlər tərtib edilib, istifadəyə verildi. Fənn kurikulumları əsasında yazılmış yeni dərsliklərdən istifadə olunmasında yeniliklərin mənimsənilməsi və tədris prosesində tətbiq edilməsi üçün müəllimlərin yeni məzmunda ixtisasartırma kurslarına cəlb edilməsi həyata keçirildi. İndi bu gün ümumtəhsil məktəblərində çalışan müəllimlərin, demək olar ki, hamısı ixtisasartırma kurslarından keçmiş, müvafiq sertifikatlar almışlar. Lakin belə kursların qısamüddətli olması onların yeni tədris metodikalarına tam yiyələnmələrinə təsəvvür yaratmadı. Bu da müəllimlərin peşəkar-

lığına təsir göstərdi.

Qeyd etmək lazımdır ki, müəllimin öz elmi-pedaqoji səviyyəsini, metodik hazırlığını yüksəltmək qayğısına qalması labüd olduğuna baxmayaraq, bəzi müəllimlər öz üzərlərində işləmir, peşəkarlıq səviyyələrinin yüksəldilməsi üçün o qədər də çalışmırlar. Buna baxmayaraq müəllimlərin peşəkarlıq səviyyələrinin yüksəldilməsi məsələsi daim məktəb rəhbərliyini narahat etmişdir. Çünki məktəbin əsas vəzifələrindən biri gənc nəslə keyfiyyətli təhsil verməkdən, onları gələcək həyata hazırlamaqdan, səriştəli vətəndaşlar yetişdirməkdən ibarətdir. Bu isə müəllimlərin peşəkarlıq səviyyəsindən çox asılıdır.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın qəbul edilməsi ilə bağlı atılmış ciddi addımlar təhsilalanların, həmçinin müəllimlərin peşəkarlıq səviyyəsindən ciddi asılı olduğu dəfələrlə qeyd olunmuşdur [3]. Ümumi təhsil məktəblərində çalışan müəllimlərin hazırlıq səviyyəsinin yüksəldilməsinə müvafiq İnstitut və Mərkəzlərin fəaliyyət dairəsinə aid olmağına baxmayaraq, bu məsələ məktəbdə birbaşa təlim-tərbiyə işləri üzrə direktor müavinlərinin fəaliyyəti ilə sıx əlaqədədir.

Bu məqsədlə təhsilin keyfiyyətinin yüksəldilməsi üçün ümumi təhsil məktəbində çalışan təlim-tərbiyə işləri üzrə direktor müavinləri hansı vəzifələri həyata keçirməlidirlər?

İlk növbədə direktor müavinləri məktəbdə təlim-tədris prosesinin və tərbiyə işinin düzgün təşkili, tədris proqramlarının yerinə yetirilməsi, təlimin və təhsilalanların biliyinin keyfiyyətinə cavabdehlik, məktəbdə metodik və digər işlərin düzgün qurulması təlim-tərbiyə işləri üzrə direktor müavinləri fəaliyyətlərinə bilavasitə daxil olan vəzifələrdir.

Direktor müavini: Tədris planı əsasında müəllimlərin dərs yükünün müəyyən olunmasında iştirak edir və dərs cədvəlini tərtib edir. Bu zaman dərs cədvəlinin tərtibinə verilən tələbləri, o cümlədən fənlərin çəkisini, onların cədvəldə münasib simmetriyada paylanmasını nəzərə alır.

Tədris planına uyğun olaraq tərtib olunan proqramların düzgün yerinə yetirilməsinə nəzarət edir. Bu zaman paralel siniflərdə işləyən müəllimlərin fənn metodbirləşmələrində müzakirə və qəbul olunmuş vahid proqramlarla işləməsini, tədris ilində nəzərdə tutulmuş dərs saatlarının yerinə yetirilməsini nəzarətdə saxlayır.

Məktəbdə tədrisin keyfiyyətinə nəzarəti həyata keçirir. Bu məqsədlə məktəbdə eyni və ya yaxın ixtisaslı fənn müəllimlərinin birgə fəaliyyətini təşkil etmək, onların bir-birinə yardımını təmin etmək, müəyyən məsələlərlə bağlı birgə fikir mübadiləsi edərək lazımi nəticəyə gəlmələri üçün fənn metodbirləşmələrinin fəaliyyətini təşkil edir və ona rəhbərlik edir. Fənn metodbirləşməsinin fəaliyyət planı hazırlanır, təsdiq edilir və onun həyata keçirilməsi təmin olunur. Bu birləşmənin əsas vəzifələrindən biri təhsilin səviyyəsinin yüksəldilməsinə, şagirdlərin səriştəlilik və müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsinə nail olmaqdan ibarətdir. Müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsi üçün aşağıdakı məsələlərə diqqət yetirilir:

1. Fənn metodbirləşmə iclaslarında müəyyən mövzuların tədrisi metodikası ilə

bağlı müəllimin təqdimat - məruzəsi dinlənilir, müzakirə olunur və qərar qəbul edilir.

2. Müəllimin dərsləri dinlənilir, təhlil olunur, tədrisin keyfiyyətinin yüksəldilməsi üçün tövsiyələr verilir.

3. Nəzarətli yazı işləri ilə şagirdlərin müəyyən mövzular, bölmələr üzrə nailiyyət səviyyəsi yoxlanılır, təhlil edilir, müvafiq qərarlar qəbul olunur.

4. Müəllimlərin açıq dərsləri təşkil olunur, bu dərslərdə fənn müəllimləri, fənn metodbirləşməsinin sədri iştirak edir, onlar dərsin gedişini hərtərəfli təhlil edir, müəllimə aradan qaldırılması zəruri olan tövsiyələr verir və həyata keçirilməsinə nəzarət edilir.

5. Fənn həftələri, aylıqları keçirilir. Şagirdlərin müxtəlif səviyyəli yarışları təşkil olunur: divar qəzetlərinin müsabiqəsi, müəllim və şagirdlərin müxtəlif mövzular üzrə təqdimatları (məruzələri), fənlər üzrə olimpiadalar, viktorinalar və s.

6. Tədrisin nisbətən çətinlik yaradan dərslərin (mövzuların), fəal dərsin mərhələləri (motivasiya, tədqiqatın aparılması, informasiya mübadiləsi, informasiyanın müzakirəsi, nəticələrin çıxarılması, produktiv tətbiqetmə və qiymətləndirmə) əsasında nümunə olaraq göstərilir.

7. Müasir dərsdə diqqət yetiriləcək əsas məqamlara (alt məzmun standartı, təlim məqsədləri, qiymətləndirmə aspekti, açar sözlər, qiymətləndirmə səviyyələri, vasitələri və dərəcələri, resurslar, inteqrasiya və s.) icra olunmasına nəzarət edilir.

8. Müəllimlərin peşəkarlıq səviyyəsinin yüksəldilməsi üçün onların yaradıcı fəaliyyətinin təşkilinə, kurikulum tətbiq olunan siniflərdə yeni yanaşmaların yaranmasına və inkişafına nail olmaq üçün il ərzində fəaliyyət göstərən seminarlar təşkil olunur. Bu seminarlarda müəllimlər müvafiq fənnə aid alt məzmun standartı üzrə fəaliyyətin izlənilməsi və qiymətləndirilməsi üçün rubrik nümunələri, formativ testlər və qiymətləndirmə vasitələri hazırlamaq bacarıqları əldə edirlər.

Göstərilənlərlə yanaşı, şagirdlərin dərsdənkənar məşğələlərə cəlb olunmasını istedadlı və zəif oxuyanların seçimini, onlara əlavə məşğələlərin keçirilməsini təşkil edir. Sinif və dərsdənkənar məşğələ jurnallarına, şagird şəxsi işlərinin vaxtında və düzgün aparılmasına nəzarət edir.

Təlim-tərbiyə işləri üzrə direktor müavini öz fəaliyyətini məktəbin tərbiyə işləri üzrə direktor müavini, uşaq birliyi təşkilatı rəhbəri və psixoloqu ilə birgə qurur. İstedadlı şagirdlərin həm müxtəlif fənlər üzrə olimpiadalara, müsabiqələrə hazırlanmalarını, həm də məktəbdənkənar, sinifdənxaric tədbirlərə cəlb olunmasını təşkil edir. O, təlimdə geriləyən, zəif oxuyan şagirdlərin əlavə məşğələlərdə iştirakını, psixoloji durumlarında olan çatışmazlıqların aradan qaldırılması üçün zəruri tədbirlərin həyata keçirilməsini təşkil edir, təşkilatçının sinif rəhbərləri və fənn müəllimlərinin iştirakı ilə valideyn iclaslarında şagirdlərin nəticələrinin təqdim olunmasını həyata keçirir, valideynlərin məktəblə əlaqələrinin qurulmasına, onların dərslərdə iştirakına şərait yaradır, şagirdlər və siniflərarası sağlam rəqabətin yaradılması üçün onların fəaliyyətlərinin nəticələrini əks etdirən reytinq cədvəllərinin tərtib olunmasını təşkil edir və s.

Məktəbdə təlim prosesinin təşkilində

sistemli işin qurulmasına nəzarəti həyata keçirmək üçün müntəzəm olaraq monitorinqlərin keçirilməsini, nəticələrinin təhlil edilməsini və qəbul edilmiş qərarlara müvafiq addımlar atılmasını həyata keçirir. Bu isə həm təhsilalanların səriştəlilik, həm də təhsilverənlərin peşəkarlıq səviyyəsinin, ümumilikdə, ümumtəhsil məktəbində təlim-tədris prosesinin, təhsilin keyfiyyətinin yüksəldilməsinə öz töhfəsini verir.

Göründüyü kimi, təlim-tədris prosesinin düzgün qurulmasında və təhsilin keyfiyyətinin yüksəldilməsində təlim-tərbiyə işləri üzrə direktor müavininin üzərinə böyük vəzifələr düşür.

Məqalədə göstərilənlərin təlim-tərbiyə işləri üzrə direktor müavini tərəfindən müntəzəm həyata keçirilməsi məktəbdə təhsilin keyfiyyətinin yüksəldilməsinə əhəmiyyətli təsir edə bilir.

*Rəyçi: prof. E.Bəylərov*

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.

2. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı, 1999.

3. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. //Azərbaycan məktəbi, 2009, №6.

4. Strezikozin P. Məktəbdə tədris prosesinə rəhbərlik. Bakı, 1976.

**Х.Гусейнова**

**Заместитель директора по качеству образования и учебно-воспитательной работе**

**Резюме**

В статье повествуется о задачах заместителя директора по учебно-воспитательной работе и его роли в повышении качества образования. Перечисление задач, последовательность их выполнения в форме алгоритмов создает основу для создания и решение целей при деятельности.

**Kh.Huseynova**

**The quality of education and deputy director on training**

**Summary**

The article is about the tascs of deputy director’s for teaching and upbringing work and role in increasing of edication quality. Naming positions, giving their fullfiling consistency in an algorithm form and taking into account at the time of acting grounds achieving the setted goals.

# TƏLİMİN OPTİMALLAŞDIRILMASI VƏ İNFORMASİYA-KOMMUNİKASİYA TEXNOLOGİYALARI





**Tofiq Məmmədov,**
***Naxçıvan Müəllimlər İnstitutunun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

**Vüsalə Mikayılova,**
***Naxçıvan şəhəri, 12 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *müasir informasiya texnologiyaları, təlim prosesi, təlimdə müasir texnologiyalardan istifadə, təlimin optimallaşdırılması.*

***Ключевые слова:*** *сòвраменный информационно технологии, процесс обучения, использование современных технологии обучения, оптиматизации обучения.*

***Key words:*** *information technology, teaching specializing, the use of modern teaching texnologies, optimatsion of education.*

Azərbaycan Respublikası müstəqilliyini bərpa etdikdən sonra təhsilimizdə milli ənənələri qorumaqla yanaşı, qabaqcıl dünya ölkələrinin təhsil məkanına inteqrasiya prosesinin sürətlənməsi, inkişaf etmiş ölkələrin bu sahədəki təcrübəsini öyrənərək tədris prosesinə tətbiqi, orta ümumi təhsil və ali məktəblərdə informasiya-kommunikasiya texnologiyalarından geniş istifadə edilməsi (İKT) istiqamətində kompleks tədbirlər həyata keçirilməkdədir. Çox yaxşı haldır ki, ölkəmiz İKT sektorunun inkişaf etdirilməsinə görə regionda lider dövlətə çevrilmişdır. Bu liderliyi qoruyub saxlamaq və inkişaf etdirmək üçün İKT-nin təhsil prosesinə tətbiqinin öyrənilməsi və həmin sahəyə diqqətin artırılması zəruridir. Yaşadığımız dövrün vacib şərtlərindən biri də məhz insanlarda məntiqi və alqoritmik təfəkkür tərzini, qoyulmuş məsələlərin optimal həll üsullarının müəyyən edilməsində, onlarda yaradıcı və əməli düşünmə qabiliyyəti formalaşdırmaq, həmçinin onların gündəlik qarşılaşdıqları problemlərin həlli ilə bağlı tələb olunan zəruri informasiyaları İKT vasitəsilə ala bilmələri üçün texniki bacarıq və vərdişlərin aşılanmasıdır.

İKT-dən təlim prosesində istifadə etmək zehnin inkişafına kömək edir, məntiqi təfəkkürün formalaşdırılmasında, mühakimə və dərk etmə qabiliyyətinin yüksəldilməsində, elmi, praktik biliklərin genişlənməsində, yeni ixtisaslara yiyələnməsində əhəmiyyətli rol oynayır. Dəqiq və humanitar elm sahələrinin inkişafında, texnika, müasir texnologiyaların təkmilləşdirilməsi prosesində ortaya çıxan problemlərin həllində insanların yaxın köməkçisinə çevrilir. Bu baxımdan əksər dünya ölkələrinin təhsil sistemində İKT-nin imkanlarının öyrənilməsinə xüsusi diqqət yetirilir.

Bu gün Azərbaycan təhsil sisteminin

bütün sahələrində geniş islahahatlar aparılır. Bu islahatların əsas məqsədini Milli Kurikulumun tələblərinə cavab verən, milli-mənəvi dəyərlərə əsaslanan, beynəlxalq standartlarına uyğun və inkişaf etmiş ölkələrin təhsil sisteminə inteqrasiyası təşkil edir.

İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, yeni əsrdə cəmiyyətin və insanların inkişafı üçün, yaradıcı, müstəqil düşünən və inkişaf edən şəxsiyyət formalaşmalı və yetişdirilməlidir.

Heç təsadüfi deyildir ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin “qara qızılı insan kapitalına çevirək” aforizm kimi səslənən bu fikrinin reallaşması üçün Azərbaycan təhsil sistemində çox mühüm və əhəmiyyətli islahatlar aparır.

Bu məsələnin uğurla həyata keçirilməsində, ilk növbədə, təhsildə informasiya-kommunikasiya texnologiyalarından (İKT) istifadənin və bununla bağlı təlim prosesinin optimallaşdırılmasının xüsusi rolu və əhəmiyyəti vardır. Tədrisdə İKT-dən istifadə tədris prosesinin inkişafına və onun optimallaşdırılmasına necə təsir edir?

Bu sualı cavablandırmaq üçün bəzi məsələlərə aydınlıq gətirək. İKT-dən tədris prosesində istifadə etdikdə; təlim öyrənənlər tərəfindən maraqla qarşılanır, tədrisin təşkili, şagirdlərin təlim prosesində fəaliyyətləri nizamlanır və onların yaradıcı təfəkkürünün inkişafı üçün lazımi şərait yaranır. Bunun üçün bəzi şərtlərin nəzərə alınması olduqca vacibdir:

Birinci, layihələndirmədə nəzərə almaq lazımdır ki, İKT-nin tədris şəraitinə uyğunlaşdırılması və reallaşdırılması mümkün olsun.

İkinci, İKT-dən istifadə prosesində müəllim və şagirdin əlbir fəaliyyəti üçün əlverişli şəraitin yaranması təmin olunsun.

İKT-nin tədris prosesində tətbiqi yeni ünsiyyət formalarını meydana çıxarır. “Müəllim-şagird”, “şagird-şagird”, “şagird-İKT”, “müəllim-İKT” münasibətlərinin onların əməkdaşlığının tənzimlənməsi üçün əlverişli şərait yaranır. Bunun üçün aşağıdakı amillərin nəzərə alınması zəruridir:

- kompüterdən istifadə: müəllim-şagird əməkdaşlığı üçün lazımi səviyyədə olması;
- şagird-şagird, şagird qrupları arasında əlaqənin nizamlanmasının düzgün təşkil edilməsi;
- kompüter təlim formalarının optimal variantlarının müəyyən edilməsi;
- tək-tək şagirdlərin idrak fəaliyyətinin idarə olunması;
- təlim prosesində “müəllim-kompüter-şagird” sistemi formasında təşkil edilməsi və s.

Müasir pedaqogika göstərir ki, tədris prosesində kompüterdən səmərəli istifadəni, əsasən, dörd istiqamətdə müəyyən etmək olur:

Birinci, kompüter-tədris prosesində didaktik məsələlər sisteminin başqa təlim vasitələrinə nisbətən daha effektiv həll edilməsinə imkan yaradır.

İkinci, təlimin məzmunu kompüterə daxil edildikdə, onun quruluşu, məqsəd və vəzifələri didaktikanın prinsipləri əsasında daha səmərəli həll olunmasına imkan yaratmaqla yanaşı, həm də müəllimin fəaliyyətinin modelləşdirilməsi prosesi, geniş və əhatəli şəkildə həyata keçirilə bilir.

Üçüncü, ənənəvi yolla tədris prosesində İKT vasitəsilə həlli çətin olan məsələləri müvəffəqiyyətlə həll etmək mümkün olur.

Dördüncü, İKT mənimsəmə obyektlərinin konstruktivləşdirmə yolu ilə model-

ləşdirilməsində ən yaxşı vasitədir. Bu zaman təlim prinsiplərinin yeni strategiyasını həyata keçirmək mümkün olur.

Yuxarıda göstərilən məsələlərin həyata keçirilməsinin təlim prosesinin layihələşdirilməsində aşağıdakı qaydada nəzərə alınması məsləhət görülür.

Birinci: Təlimin məzmunundan asılı olaraq onun həyata keçməsi üçün vaxtın müəyyən edilməsi.

Bu tələbin düzgün müəyyən edilməsi təlim prosesində konkret fənlərin və onun bölməsinin məntiqi, psixoloji əsasları təmin olunmalıdır. Bu zaman şagirdlər kompüter vasitəsilə ümumiləşdirilmiş nəzəri bilikləri, modelləşdirmənin qrafik işarəsi üsullarını müvəffəqiyyətlə mənimsəyirlər.

İKT vasitəsilə təlim şagirdlərin dərsə marağını artırır, təlim prosesində onların fəallığı və müstəqilliyi təmin edilir, sərbəst düşünmə, mühakimə etmə, faktlara əsaslanaraq fikir söyləmək və onlarda başqalarını dinləmək, yoldaşının fikrinə hörmətlə yanaşmaq mədəniyyətinin formalaşmasına imkan yaradır. İKT-dən təlim prosesində istifadə tonlarla təbaşirə və ya maqnit lövhələri üçün istifadə olunan qələmlərdən (filamasterlərdən) imtina olunması deməkdir.

İnformasiyalı cəmiyyətin gələcək qurucularının məktəb illərindən başlayaraq yeni İKT ilə tanış olması və ondan sərbəst istifadə etməyi bacarması müasir təhsil sisteminin optimallaşdırılmasının əsas tələbidir.

Təhsilin müxtəlif pillələrində İKT-nin sistemli tətbiqi pedaqogika elminin aktual problemlərindəndir. Optimal – latınca optimus sözündən götürülüb, mənası daha yaxşı müvafiq şəraitə və vəzifələrə daha çox uyğun gələn bir cəhət kimi başa düşülür. Hər bir müəllim ixtisasından asılı olmayaraq bilir ki, müəyyən bir problemi həll edərkən onun bir neçə variantını tapmaq lazım gəlir. Lakin bu variantlar içərisində ən qısa-rassional yolla həll ediləni optimal variant hesab edilir. Bu variantı görmək və onun yollarını şagirdlərə öyrətmək hər bir müəllimin mühüm vəzifələrindən biridir. Optimal variantlarla problemlərin həlli şagirdləri Dövlət İmtahan Mərkəzinin apardığı qəbul və sınaq imtahanları üçün daha vacibdir. Çünki burada müəyyən edilmiş vaxt (3 saat) kəsiyində verilmiş sualların cavablandırılması tələb olunur. Abituriyent optimallaşdırılmış variantları düzgün müəyyən edə bilsə, vaxta xeyli qənaət edər, bu da yığılan balların yekununa öz müsbət təsirini göstərmiş olar. Optimallaşdırma – geniş mənada müvafiq şəraitdə hər hansı bir vəzifəni yerinə yetirmək üçün ən münasib variantın müəyyənləşdirilməsidir.

Təlimin optimallaşdırılması haqqında görkəmli pedaqoqlar maraqlı fikirlər söyləmişdilər:

İ.T.Oqorodnikova görə, təlim prosesinin optimallaşdırılması dərsdə müxtəlif təlim üsullarının optimal əlaqəsinin uzlaşmasını təmin etməkdən ibarətdir (3).

İ.İ.Dyuçenkoya görə, təlim prosesinin optimallaşdırılması müəyyən olunmuş kriteriyaya uyğun təlimi idarəetmənin optimal variantının müəyyənləşdirilməsidir.

Y.K.Babanskiyə görə, optimallaşdırma prosesi optimal qərarları psixoloji baxımdan əsaslandırmaqdan ibarətdir. Psixoloji nöqteyi-nəzərdən optimallaşdırma müvafiq vəzifəni daha səmərəli həll etmək üçün qəbul olunan intellektual irad aktıdır. Optimallaşdırma fəallığı təmin edərək müstəqilliyi, təfəkkürü və yaradıcı yanaşma-

ğı inkişaf etdirir. Müəllimin fəaliyyəti öz mahiyyəti etibarilə həmişə şagirdlərin təlim və tərbiyəsinin daha yaxşı variantlarının yaradıcı axtarışlarını, aktual tədris-tərbiyə tapşırıqların müvəffəqiyyətlə icra etmək üçün optimal şərait yaratmaqdan ibarətdir (4).

Professor Y.Kərimova görə, təlimin optimallaşdırılması hər hansı konkret şəraitdə müəllimdən özünü və şagirdləri yükləmədən, yormadan, vaxt itkisinə yol verməmədən, minimal vaxt içərisində çox və keyfiyyətli iş görməyi, yaxşı nəticə əldə etməyi tələb edir.

Təlim prosesinin optimallaşdırılması şagirdlərin yaxın inkişaf mərhələsini nəzrə alaraq, hər yaş qrupu üzrə gigiyenik normalara istinad edərək, az vaxt içərisində yüksək nəticə almaqdan ibarətdir. Təlim prosesini optimallaşdırmaq qabiliyyətinə malik olmayan müəllim pedaqoji prosesi zahiri əlamətlərinə əsasən təşkil edəcək, həm də tədris prosesi üçün əlverişli şəraiti yarada bilməyəcəkdir. Təlim prosesini optimallaşdırmağın mühüm bir istiqaməti də dərsdə vaxtdan səmərəli istifadə etmək və təlim prosesinin intensivləşdirilməsini təşkil etməkdən ibarətdir.

Təlim prosesinin intensivləşdirilməsi – minimum vaxt ərzində müəyyən edilmiş şəraitdə təlim tapşırığı üzrə maksimum dərəcədə müvəffəqiyyət əldə edilməsidir.

Təlimin optimallaşdırılması – şagirdlərin fəaliyyəti baxımından az vaxtda az qüvvə sərf etməklə yüksək nəticə qazanmasından ibarətdir (1).

Məsələn, riyaziyyatdan bir nümunə göstərək: Riyaziyyat müəllimləri bilir ki, kvadrat tənlikləri ($ax^2+bx+c=0$) həll edərkən diskriminantın ($D=b^2+4ac$) üç qiymətinə ($D>0$, $D=0$, $D<0$) görə onun həlli tapılır. Bu isə çox vaxt aparmaqla həm də mürəkkəb hesablamalar aparmaq tələb edir. Lakin xüsusiyyət təşkil edən elə kvadrat tənliklər var ki, onların həllində diskriminantı hesablamadan onun həllini asanlıqla, az vaxt sərf etməklə tapmaq olur. Məsələn, $ax^2+bx+c=0$ (1) olduqda tənliyin kökləri 1 və c/a, a+c-b=0 (2) olduqda isə tənliyin həlli (-1) və (-c/( a)) olur.

Misal 1: 2575x2- 1643x-932=0; tənliyində a=2575, b=-1643, c=-932 olduğundan və 2575-1643-932=0 olduğuna görə (1) şərtinə əsasən x1=1, x2=c:a= - 932/2575 olur.

Misal 2. 789x2+1010x+221=0 tənliyində a=789, b=1010, c=221 olduqda, (2) şərtinə görə 789-1010+221=0 olduğundan, x1= -1, x2= 221/789 olar. Buna görə də göstərilən xarakterdən olan kvadrat tənliklərin həllinə təqribən 15-20 saniyə vaxt sərf olunur. Əgər verilmiş tənliklər diskriminant vasitəsilə həll edilmiş olsa idi, onda ən azı 5-8 dəqiqə sərf etmək lazım gələrdi. Test imtahanlarında bu tipdən olan tapşırıqların həllində (1) və (2) şərtlərini bəzi şagirdlər bilmədiklərindən vaxt itkisinə yol verir. Bu isə onların ümumi ballarının miqdarına öz mənfi təsirini göstərir. Fənn müəlliminin mövzudan asılı olaraq təlimin optimallaşdırılmasını təmin edən qaydaları şagirdlərə izah etməsi vacibdir.

Optimal təlim – dərsin intensiv şəraitdə keçilməsi şagird fəallığının təmin olunması deməkdir. Bu zaman dərsin bütün mərhələlərində şagirdlər bir subyekt olaraq təlim prosesinin yaradıcısına çevrilir. Onlar dərsdə konkret mövzularla bağlı biliklər əldə etməklə yanaşı, həm də tərbiyə olunurlar. Belə ki, təlim prosesinin optimalaşdırılmasında təlimin başqa formalarına nisbətən şagirdlərin məntiqi təfəkkürü daha yaxşı

inkişaf edir və zehni qabiliyyəti üzə çıxır. Onların fənnə marağı, həvəsi artır, təlimdə fəal iştirak etməsinə şərait yaranır. Təlimin optimallaşdırılmasının əqli tərbiyəyə də təsiri böyükdür. O, şagirdlərdə şüurluluq, fəallıq, sistematiklik və ardıcıllıq kimi müsbət keyfiyyətləri formalaşdırmaqla yanaşı, onların müstəqil fəaliyyətinə geniş imkanlar açır.

Təlim prosesinin optimallaşdırılmasına təsir edən əsas amillər:

- minimum vaxt kəsiyində maksimum təlim müvəffəqiyyətinə nail olmaq;
- təlimin intensivləşdirilməsinə nail olmaq;
- təlim prosesində şagirdlərin marağını təmin etmək;
- təlimin səmərəliliyini təmin etmək;
- müasir təlim metodları və üsullarından istifadə etmək;
- şagirdlərdə qeyri-standart çalışmaları həll etmək bacarığını inkişaf etdirmək və. s ibarətdir.

Söylənilənləri ümumiləşdirərək belə nəticəyə gəlmək olar ki, İKT vasitəsilə təlimin optimallaşdırılmasına nail olduqda, ölkəmizin gələcək qurucularında müasir dövrün tələblərinə uyğun bilik, bacarıq və vərdişlər formalaşdırmaq olar.

***Rəyçi: prof. O.Həsənli***

## İstifadə edilmiş ədəbiyyat

1. Педагогика, под. Ред. Я.К.Бабанского. М.: Просвищение, 1988.

2. Бабанский Ю. Оптимизация просесса обучения. М.: Педагогика, 1977.

3. Огородников Т. Оптимальное усвоенин учащимся знаний и сравнительная эффективность отдельных методов в школе. М.: Просвищение, 1969.

4. Бабанский Ю. Система способов оптимизации обучения. Вопросы психологии. М.: №5, 1982.

5. Тализина Н. Теория поэтапного формировния умственных действий. М., 1966.

6. http://kayzen.az/blog

7. www.anovikov.ru

**Т.Мамедов,**
**В.Микайылова**

**Информационно-коммуникационных технологий в оптимизации обучения**

**Резюме**

Статья посвящина иследованию информационно-коммуникационных технологий в оптимизации обучения.

**T.Mammadov,**
**V.Mikayilova**

**Of information and communication technologies in optimation of education**

**Summary**

The article is devoted to the investigation of the role of information and communication technologies in optimitation of education.



# SİNİFDƏNXARİC OXU DƏRSLƏRİNDƏ YENİ TƏLİM TEXNOLOGİYALARINDAN İSTİFADƏYƏ DAİR DƏRS NÜMUNƏSİ

**Elnur Əliyev,**
***Salyan rayonu, Yenikənd kənd tam orta məktəbin müəllimi***

Sinifdənxaric oxu dərsləri şagirdlərin təlim materialları ilə bağlı sinifdənxaric oxusunu stimullaşdırmaq, fəal, sistemli müstəqil işə istiqamətləndirmək, mütaliə və tədqiqatçılıq bacarıqlarını təkmilləşdirmək məqsədi izləyir. Həmin dərs saatlarında şagirdlərin bölmələr üzrə müstəqil oxusuna bir növ baxış keçirilir, hər bir şagirdin maraq və qabiliyyətinə uyğun hazırladığı çıxış dinlənilir, bu və ya digər problem üzrə oxunmuş əsərlərin müzakirəsi aparılır. Şagirdlər sinifdənxaric oxu dərsləri ilə bağlı əvvəlcədən divar qəzeti, ayrı-ayrı sənətkarlara həsr olunmuş albom, kitab sərgisi təşkil edirlər. Məktəblilərin mütaliə etdikləri əsərlər üzrə çəkdiyi illüstrasiya, yazdığı inşa və esselər nümayiş etdirilir, dəyərləndirilir. Bu dərslərdə sinifdənxaric iş elementlərinə, əlavə resurslara, digər bilik mənbələrinə də müraciət edilməli, qazanılmış bilik və bacarıqlar yeni material, müstəqil oxunmuş bədii nümunələr üzərində tətbiq olunmalıdır.

Ədəbiyyat dərslərində öyrənilən əsərlərin sinifdənxaric oxu materialları ilə problem-mövzu və s. baxımından əlaqələndirilməsi, müqayisə edilməsi faydalıdır.

7-ci sinfin ədəbiyyat fənnində yeni təhsil proqramında (kurikulumunda) tətbiq və ümumiləşdirmə dərsləri və kiçik summativ qiymətləndirmə ilə yanaşı, sinifdənxaric oxu dərslərinə də beş saat vaxt verilmişdir.

"Uşaq aləmi, uşaq taleyi" tədris vahidinin sonunda yer almış sinifdənxaric oxu dərsi ilə bağlı hazırladığım dərs nümunəsi:

Mövzu: Sinifdənxaric oxu dərsi: Uşaq həyatı, uşaq taleyi bədii ədəbiyyatda.

**Reallaşdırılan standartlar:**

1. 2. 2. Digər obrazlarla müqayisə etməklə və yazıçının münasibətinə əsaslanmaqla ədəbi qəhrəmanları səciyyələndirir;

1. 2. 3. Bədii nümunələrdə təsvir və ifadə vasitələrinin (epitet, təşbeh, mübaliğə, bədii sual, təkrir, litota) rolunu aydınlaşdırır;

1. 2. 4. Bədii nümunələrin mövzusunu, ideyasını və başlıca problemini şərh edir, əsalandırılmış münasibət bildirir;

2. 1. 2. Bədii nümunələrlə bağlı fikirlərini mətndən nümunələr gətirməklə şərh edir.

**Fənlərarası inteqrasiya:** Az. d. 2. 1. 4. , 2. 2. 3. , X. d. 3. 1. 4. , H. b. 3. 2. 1.

**Strategiyalar: metodlar, iş formaları:**

Müzakirə, təqdimat, kiçik qruplarla iş.

Resurslar:

Dərslik, iş vərəqləri, ədəbi divar qəzeti, kitab sərgisi, ədəbi guşə.

**Qiymətləndirmə üsul və vasitələri:**

Müşahidə (müşahidə vərəqələri), şifahi sual-cavab (şifahi nitq bacarıqları üzrə qeydiyyat vərəqi), tapşırıqvermə (tapşırıq), layihə (şagirdin təqdimatı).

Sinifdənxaric oxu dərsi şagirdlərin "Uşaq aləmi, uşaq taleyi" bölməsi üzrə müstəqil oxuduqları əsərlər – A.Şaiqin "Murad" və İ.Əfəndiyevin "İz ilə" hekayəsi üzrə keçilir. Dərsə əvvəlcədən hazırlıq işləri aparılır.

Dərsə hazırlıq dövründə şagirdlər A.Şaiq və İ.Əfəndiyev haqqında yığcam təqdimat hazırlayır, fənn kabinetində hər iki sənətkarın portreti, həyat yolu və ibrətamiz

fikirlərini əks etdirən guşə təşkil edirlər.

**Dərsin gedişi:**

**Motivasiya, problemin qoyuluşu.** Dərsin əvvəlində hər iki sənətkarla bağlı təşkil edilmiş guşəyə baxış keçirilir. Şagirdlərin təqdimatları dinlənilir.

Təqdimatlar üzrə təəssüratların mübadiləsi tədqiqat sualının müəyyənləşdirilməsinə imkan yaradır.

**Tədqiqat sualı.** Müstəqil oxuduğunuz bədii əsərlərdə uşaq obrazları hansı cəhətləri ilə diqqəti cəlb edir?

Şagirdlərin fərziyyələri dinlənilir və lövhədə qeyd edilir.

**Tədqiqatın aparılması**. Kiçik qruplar iş vərəqlərindəki sual və tapşırıqlara cavab hazırlayırlar.

**İş vərəqi № 1**

1. A.Şaiqin "Murad" hekayəsində Murad obrazı hansı cəhətləri ilə diqqəti cəlb edir? Fikrinizi nümunələrlə əsaslandırın.
2. Hekayədəki Bilqeyis obrazını səciyyələndirən cəhətləri müəyyənləşdirin. Əsərdən nümunələr göstərin.
3. Muradla Bilqeyisi müqayisəli səciyyələndirin. Müqayisə cədvəlindən istifadə edin.

**İş vərəqi № 2**

1. İ.Əfəndiyevin "İz ilə" hekayəsindəki əsas ideya nədən ibarətdir?
2. Hekayədəki Cəfər və Nadir obrazlarını müqayisə edin. Müqayisə cədvəlindən, yaxud Venn diaqramından istifadə edin.
3. Hekayədən çıxan nəticəni hansı atalar sözləri ilə ifadə etmək olar?

1. Dostla dağı tez aşmaq olar;
2. Dostu dar gündə sınayarlar;
3. Dost dosta tən gərək, tən olmasa gen gərək;
4. Dost sirrini dosta deyər;
5. Doğruluq dost qalasıdır.

**İş vərəqi № 3**

1. A.Şaiqin "Murad" hekayəsinin qəhrəmanı Muradı İ.Əfəndiyevin "İz ilə" hekayəsinin qəhrəmanı Cəfər obrazı ilə müqayisə edin. Müqayisə cədvəlindən istifadə edin.
2. Hekayədə işlənilmiş bədii təsvir vasitələrini və onların rolunu aydınlaşdırın.
3. "Murad" hekayəsinin ideyasını, orada qaldırılan başlıca problemi aydınlaşdırın.

**İş vərəqi № 4**

1. "İz ilə" hekayəsində Nadir obrazının davranış və əməllərindəki mühüm cəhətləri müəyyənləşdirin. Fikrinizi nümunələrlə əsaslandırın.
2. Cəfər obrazı sizə "Nurəddin" hekayəsinin hansı qəhrəmanını xatırlatdı? Nə üçün? Müqayisə cədvəlindən istifadə edin.
3. "İz ilə" hekayəsində başlıca fikir nədir? Fikrinizi əsaslandırın.

**Məlumat mübadiləsi və müzakirə** mərhələsində təqdimatlar əsasında məlumat mübadiləsi və müzakirə aparılır.

Təqdimatların fəal dinlənilməsi təmin olunur. Qruplar bir-birinin işinin məzmunu ilə tanış olur, sual vermək imkanından yararlanırlar.

**Nəticənin çıxarılması, ümumiləşdirmənin aparılması** mərhələsində istiqamətləndirici suallardan istifadə edib nəticələrin fərziyyələrlə müqayisəsinə xüsusi diqqət yetirilir.

**Qiymətləndirmə.** Sinifdənxaric oxu dərslərində formativ qiymətləndirmə təlim nəticələrinə müvafiq meyarlar əsasında aparılır.

**Meyarlar.** Digər qəhrəmanlarla müqayisə etməklə obrazları səciyyələndirir, hekayədə fikrin təsir gücünün artmasında bədii təsvir vasitələrinin rolunu aydınlaşdırır, əsərin ideyasını, diqqətə çatdırılan başlıca problemi şərh edir, münasibət bildirir, fikirlərini hekayədən nümunələr gətirməklə şərh edir.

Dərsin sonunda şagirdlərə uşaqlara həsr olunmuş əsərlərin müstəqil oxunması tapışırılır.

***Rəyçi: prof. V.Bəşirov***



# YENİ TƏLİM METOD, TEXNOLOGİYALARI VƏ İKT–DƏN İSTİFADƏ

**Sədaqət Camıyeva,**
***Şamaxı rayonu, Sabir qəsəbə tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *informasiya-kommunikasiya texnologiyaları, tədris prosesi, texnologiya, təhsil.*

***Ключевые слова:*** *информативно-коммуникативные технологии, учебный процесс, технология, образование.*

***Key words:*** *information-communication technologies, teaching process, techonolgy, education.*

Tədris prosesində təlimin keyfiyyətinin artırılması məqsədilə tətbiq olunan interaktiv metodlardan istifadə zamanı İKT və digər vasitələr əhəmiyyətli rol oynayır. İnformasiya-kommunikasiya texnologiyalarının tədris prosesinə tətbiqi müxtəlif dərs formalarının həyata keçirilməsinə və onların istifadə olunması üçün pedaqoji şərtlərin formalaşdırılmasına imkan vermişdir. Belə ki, interaktiv metodları tətbiq edən müəllimin bu sahə üzrə müəyyən bacarıq və vərdişlərinin olması, internet resurslarına və multimedia vasitələrinə uyğun olan təhsil şəraitinin yaradılması, tədris olunan fənnin (və ya mövzunun) məzmununun müfəssəl şəkildə çatdırılmasına nail olunması zəruri tələblərdir.

İKT cəmiyyətin inkişafına güclü təsir göstərən əsas amillərdən birinə çevrilmişdir. İKT-nin tətbiqinin səviyyəsi hər bir ölkənin intellektual və elmi potensialının, sosial vəziyyətinin iqtisadi inkişafının əsas göstəricilərindən biridir. Gələcəkdə iqtisadiyyatın inkişafı isə əslində təhsilin iformatlaşması ilə bağlıdır. Ona görə də ölkə Prezidenti cənab İlham Əliyevin 21 avqust 2004-cü il tarixli sərancamı ilə təsdiq edilmiş “Azərbaycan Resspublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminat proqramı (2005-2007-ci illər)” təhsilin qarşısına yeni və əhəmiyyətli vəzifələr qoydu.

Sərəncamın həyata keçirilməsi ilə informatlaşdırma geniş vüsət almış və bununla bağlı çoxlu dövlət proqramları qəbul edilmiş və uğurla həyata keçirilmişdir.

Təlimdə texniki vasitələr və İKT-dən istifadə şagirdlərin tədris olunan mövzunu ətraflı mənimsəməsi, lazımi bacarıq və vərdişlərə yiyələnməsinə stimul verməklə yanaşı, müəllimin sərf etdiyi əməyi də qismən yüngülləşdirən yüksək tədris situasiyası yaratmağa qadir olan müasir vasitələrdir. Bu vasitələrdən istifadə şagirdlərdə informasiya bazasının çoxalmasına və mövzunu asanlıqla dərk etmələrinə şərait yaradır.

Təlimin texniki vasitələrini əyani vəsaitlərlə eyniləşdirmək olmaz. Əyani vəsaitlər informativ xarakterə malikdir. Texniki vasitələrlə şagirdlərə verilən informasiyalar daha dinamik və daha əyanidir.

Tədris filmləri biologiya dərslərində

effektli pedaqoji təlim vasitələrindən biridir. O, şagirdlərin diqqətini inkişaf etdirir, əyaniliyi möhkəmləndirir, digər tərəfdən mikro, makro və multi çəkilişlər hesabına hadisələrin izahına imkan yaradırlar. Bu, şagirdlərin hadisəni diqqətlə izləməsinə imkan yaradır. Həm də şagirdlərin təlim-tərbiyəsində böyük rolu vardır.

Tədris filmindən istifadə müəllimdən yüksək pedaqoji ustalıq tələb edir. Belə ki, müəllimin hazırlığı və lazım olan anda filmdən istifadə etməsi şagirdlərin müəyyən hadisənin izahının dəqiqliyinə aydınlıq gətirir. Habelə film vasitəsilə şagirdlər müəyyən praktik vərdişlərə də yiyələnirlər.

Hazırda biologiya tədris filmləri vardır. Orada geniş əhatəli mövzu, fraqmentlər mövcuddur.

Göründüyü kimi, təlimin texniki vasitələrindən dinamikliyi, kütləviliyi, mütəhərrikliyi, külli miqdarda informasiya daşıya bilməsi digər əyani və informasiya vasitələri ilə uzlaşdırmağa imkan verir. Ona görə də, həmin vasitələr orta ümumtəhsil məktəbləri, eləcə də ali məktəblərdə də təlim-tərbiyə işində əvəzedilməzdir.

Milli kurikulum İKT-dən geniş istifadəni nəzərdə tutur. Kompüterdən, proyektordan istifadə etməklə mövzunun icmalı qabaqcadan hazırlanır. Motivasiyanın qurulmasında mövzuya aid materiallardan internet qaynaqlarından, fləşkartlardan, əyani vəsaitlərdən, videomateriallardan və s. istifadə etməklə şagirdlərin diqqətini maksimum dərəcədə dərsə cəlb etmək mümkündür. Biologiya dərslərində təbiət hadisələrini, heyvanları, bitki ötüyünü və s. əks etdirən video materialları şagirdlərdə dərslərə daha böyük maraq və həvəs oyadır. Bundan başqa şagirdlər tədqiqat apararkən, ümumi nəticələr çıxararkən daha dəqiq, daha səlis işləyir, dərslər bugünkü tələblərə uyğun daha fəal, daha canlı keçir.

İKT-nin metodiki işdə uğurla tətbiq olunması üçün müəllim İKT-nin müxtəlif formalarını yaxşı bilməli, kompüterdə yaxşı işləməli, əsas təhsil saytlarının imkanlarından düzgün istifadə etməlidir. Bununla yanaşı, təlim prosesində millilik və bəşəri dəyərlər öz əksini tapmalıdır. Tədris zamanı müəllim çalışmalıdır ki, şagirdlərdə tədqiqatçılıq, yaradıcılıq və qazanılmış biliklərin həyatda müstəqil şəkildə tətbiqetmə bacarıqları inkişaf etdirilsin. Bütün bu prinsiplərin gözlənilməsi təlim islahatının əsas kompetensiyalarından olan əqli təfəkkürün inkişafını təmin edir.

Biologiya dərslərində informasiya texnologiyalarından istifadə müəllimə bir sıra imkanlar yaradır. Bunlardan təlim-tərbiyə prosesinin gedişində şagirdlərin şüurlu fəaliyyətinin təşkil edilməsi, təlim prosesində fərdi yanaşma üsulunun tətbiqinə daha böyük imkanlar yaradılması və qısa vaxt ərzində mikro və makro aləmdə baş verən hadisə və prosesi ardıcıllıqla izləmək imkanlarının yaradılmasını misal göstərmək olar.

Biologiya dərslərində İKT vasitələrindən istifadə edərkən dərsin mərhələləri əvvəlcədən aydınlaşdırılmalıdır. Bununla yanaşı bioloji biliklərin şagirdlərin həyat və fəaliyyətində mühüm rol oynadığını da nəzərdə saxlamaq lazımdır. Məhz bioloji təhsil sayəsində hələ yeniyetməlik yaşlarından şagirdlərdə özünə, ətrafdakılara, ümumiyyətlə, bütün canlılara qarşı diqqətli və ehtiyatlı yanaşma, təbiətə məhəbbət hissi formalaşır. Şagird müəyyən dərəcədə öz sağlamlığının qeydinə qalmağın nə dərəcədə mühüm olduğunu anlayır,öz orqanizminin quruluşu və funksiyalarını bilir, ekologiya-

nın nə demək olduğunu anladığına görə onda bitki və heyvanlar aləminə qarşı rəğbət hissi yaranır.

Bütün bunlar şagirdlərin dünyaya baxışını dəyişir,onları kamil bir şəxsiyyətə çevririr. Bioloji elmlər planetimizdə unikal hadisə olan həyatın qanunlarını açmaqla məktəblinin ekoloji mədəniyyətini formalaşdırır.

“Millətimizin sabahı” dediyimiz uşaqlar həyatımızın gələcəyi, ömrümüzün davamıdır. Onların təlim-tərbiyəsinə, sağlamlığına düzgün münasibət bəşəriyyətin aydın sabahının, parlaq gələcəyinin təminatıdır. XXI əsrdə yaşayacaq nəsillərin təlim-tərbiyəsinin, sağlamlığının, xoşbəxt həyatının təməli bugünümüzdən başlayır.

Şagirdlər hərtərəfli biliklərlə təmin edilməli onlarda bacarıq və vərdişlər formalaşdırılmalı, yüksək mədəniyyətə və dünyagörüşünə malik şəxsiyyət kimi yetişdirilməlidir. Belə tədris prosesi şagirdlərdə özünəinam hissi oyadır ki, bu da onlara sinfin və dərsin təşkilində iştirak etməyə, öz fikirlərini sərbəst şəkildə ifadə etməyə şərait yaradır. Müasir təlim metodları və İKT–dən istifadə sinif mühitində dəyişiklik etməyə və cəmiyyətin dəyərli vətəndaşları olmağa çalışan, aktiv, hər şeylə maraqlanan şagirdlərin təhsil aldığı siniflərin yaradılmasında müəllimlərə yol göstərir. Təlim prosesinin daha yaradıcı olmasına, şagirdlərin müzakirə, mühakimə qabiliyyətlərinin formalaşmasına stimul yaradan bu üsul və vasitələr eyni zamanda şagirdlərin təlim prosesinə daha maraqla və həvəslə yanaşmasını təmin edir.

***Rəyçi: prof. İ.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, №5.
2. Əliquliyev R., Mahmudova R. Təhsilin təkamül prosesində informasiya inqilabının rolu. Bakı, 2012.
3. “Təhsildə Qloballaşma və İKT” mövzusunda konfrans materialları. Bakı, 2008.
4. www.Müəllim .edu. az.
5. www.vikipedia.org.

**С.Джамыева**

**Новые методы обучения, технологии и использвование ИКТ**

**Резюме**

В данной статъе рассмотрены вопросы реализации различных видов занятий с применением ИКТ. Указано,что применение ИКТ в обучении биологии оченъ полезно.Исполъзование ИКТ в учебной деятелъности пренодавателя способствует повышению эффективности учубного процесса,активизириют учеников.

**S.Jamiyeva**

**New methods of teaching, technology and using ICT**

**Summary**

İn this article the realization problems of different lesson forms were examined by the ways of applications of information-communications technologies it was shown that the application of ICT in teaching of biology is very important.The use of ICT by teachers makes to increase the effectiveness of teaching process and activates the students.

# B İ Z Ə   Y A Z I R L A R

**Şamaxı şəhər 2 nömrəli tam orta məktəbin müəllimi Tünzalə Bağırova "Xarakterin inkişafı və hər bir şagirdin şəxsiyyət kimi formalaşması"** adlı məqaləsində göstərir ki, müəllim dərs prosesində hər bir şagirdə bir şəxsiyyət kimi baxmalı, onun söylədiyi fikirlərə hörmətlə yanaşmalıdır. Bu çox böyük bacarıq tələb edən bir işdir və burada əsas məsələ müəllimin pedaqoji, psixoloji hazırlığı ilə bağlıdır. Təcrübə göstərir ki, belə yanaşma müəllim-şagird münasibətlərinin qurulmasına kömək edir və nəticədə şagirdlər həm düzgün tərbiyə, həm də bilikləri genişləndirmə kimi davamlı bir prosesin axarına düşmüş olurlar.

Unudulmamalıdır ki, hər şagird fərqli bir mədəni səviyyəyə sahib olan ailənin, mühitin iştirakçısıdır. O, sağlamlıq dərəcəsinə, eləcə də özünəməxsus temperamentə malik bir fərddir. Müəllim də onun inkişaf faktorlarını nəzərə almalı, hər bir şagirdin potensial imkanlarının açılmasına şərait yaratmalıdır. Şagirdlər özlərinə qarşı edilən bu nəvazişdən düzgün nəticələr çıxarır və özləri də başqaları ilə necə rəftar etmək lazım olduğunu öyrənirlər.

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi Yaşar Qaraxanovun "Ali məktəblərin qeyri-ixtisas fakültələrində xarici dilin intensiv təliminin forma və vasitələri"** adlı yazısında qeyri-ixtisas fakültələrdə ingilis dili tədrisində tələbələrdə şifahi danışıq, bacarıq və vərdişlərin formalaşdırılmasından bəhs edilir. Hər bir dildə olduğu kimi ingilis dilinin qayda-qanunlarının da özünəməxsus seçilən xüsusiyyətləri vardır. Belə ki, ingilis dilində mövcud olan hərf birləşmələrinin bir çoxu oxu zamanı ayrı-ayrı sözlərdə müxtəlif səslər verir və yaxud bir sözdə oxunur, digərində tələffüz edilmir.

Qeyri-ixtisas fakültələrində xarici dilin tədrisinə verilən saatların azlığını da nəzərə alsaq onda xarici dil təlimində ən səmərəli vasitə və formalardan istifadə etmək zəruriyyəti meydana çıxır. Deməli, müəllim elə metodik vasitə və üsullar axtarıb tapmalıdır ki, onların köməyi ilə qısa vaxtda daha çox iş görmək mümkün olsun, eyni zamanda fonetik vərdişlərin unudulmasının qarşısı alınsın. Bu məqsədlə müəllim müvafiq testlərdən istifadə edə bilər. Fonetik testləri hazırlayarkən tələffüzü çətin olan sözlərə daha geniş yer verilməlidir.

Aydındır ki, qeyri-ixtisas fakültələrində əsas vəzifə tələbələrdə xarici dildə şifahi danışıq bacarığı formalaşdırmaqdan ibarətdir. Bu vəzifəni həyata keçirmək üçün müəllim tələbələrdə əvvəlcə oxu bacarıq və vərdişləri aşılamaq məqsədilə onlara sadə formada tərtib edilmiş oxu mətnləri təqdim edir. Tələbələr həmin mətnləri öz-özünə oxuyaraq onların məzmununu başa düşməyə çalışırlar. Tələbələrin mətni nə dərəcədə başa düşdüklərini müəllim yalnız nəticələri yoxladıqdan sonra aydınlaşdıra bilir və tələbələrin mətnin hansı hissəsində səhv etdiklərini müəyyənləşdirirlər.

Oxu zamanı yaranan çətinliklərin aradan qaldırılmasında, ümumiyyətlə, xarici dilin səmərəli təlimində kompüterin böyük imkanlarından geniş istifadə edilməlidir.

**Azərbaycan Dövlət Pedaqoji Universitetin əməkdaşı Elmira Məhərrəmova “Təhsil menecerlərinin hazırlanması zamanın tələbidir”** adlı məqaləsində göstərir ki, yeni istehsal və mülkiyyət münasibətlərinin formalaşdığı, beynəlxalq əlaqələrin genişləndiyi, təhsilin qabaqcıl dünya təcrübəsinə inteqrasiya olunduğu müasir dövr təhsil sisteminin bu proseslərə çevik, dinamik adaptasiyasını tələb etdiyindən təhsilin keyfiyyəti və onun səmərəli idarə olunması problemləri ön plana çəkilir, təhsil menecerlərinin hazırlanması üzrə sistemli işin aparılması zəruri tələbata çevrilir.

Onun fikrincə, təhsil menecerlərinin müxtəlif təhsil pillələrində hazırlanması prosesində aşağıdakı nəticələrin əldə olunması gözlənilir:

- təhsil sistemində çalışan rəhbər kadrların fəaliyyət nəticələri - keyfiyyət göstəriciləri yüksəlir;
- rəhbər kadrlar ən müasir metod və texnologiyalarla yaxından tanış olur, yeni informasiyalara yiyələnir, onları idarəetmə prosesinə tətbiq edir, nəticədə yüksək göstəricilər əldə edilir;
- idarəetmənin məzmun və formaları yeniləşir, prosesə müasir mexanizmlər, metodlar, yeni yanaşmalar tətbiq edilir;
- təhsil menecerlərinin hazırlıq mərkəzi yaranır, təhsil sistemində rəhbər strukturların əməkdaşları həmin mərkəzdə idarəetmə elminin əsasları və nailiyyətləri ilə tanış olur, sistemin idarə edilməsi təkmilləşdirilir, müasir idarəetmə mexanizmlərinə keçid təmin edilir;
- təhsil menecerlərinin yüksək səviyyəli fasiləsiz təhsilə cəlbi tam təmin edilir;
- rəhbər işçilərin əməyinin qiymətləndirilməsi prosesində istifadə olunan meyarlar müasirləşdirilir;
- fasiləsiz təhsilin menecer hazırlığı üzrə ixtisasartırma və yenidənhazırlanma pilləsində məzmun və formaca dünya standartları səviyyəsində yeni plan və proqramlar tətbiq olunur;
- xüsusi proqramların tətbiqi nəticəsində təhsil menecerləri direktiv sənədlərlə yaxından tanış olur, mövcud reqlamentləri öyrənir, müasir idarəetmə mexanizmlərini qavrayır, qanunvericilik aktlarını, maliyyə əməliyyatlarını və s. mənimsəyirlər;
- yeni təyin olunmuş rəhbər kadrlar fəaliyyətlərinə hazırlıqlı şəkildə başlayır, bu isə öz növbəsində keyfiyyət göstəricilərinin yüksəlməsinə real zəmin yaradır;
- yüksək hazırlıqlı menecer korpusunun yaranması idaretmə funksiyalarının aşağı ötürülməsi prosesini mümkün edir və konkret pozitiv nəticələr əldə etmək üçün şərait yaradır;
- idarəedənlərlə idarəolunanlar arasında münasibətlər sadələşdirilir və təkmilləşdirilir;
- bir sıra mühüm sosial islahatların və cəmiyyətin demokratikləşdirilməsinin imkanları reallaşır, fərdi və kollektiv əmək münasibətlərinin həlli asanlaşır.

Menecerin profilindən, hazırlıq səviyyəsindən, gələcəkdə işləyəcəyi konkret şəraitdən asılı olaraq təhsil bloklarının strukturu, müxtəlif fənlərin həcmi və onların məzmununu dəyişə bilər. Məsələn, menecerin praktiki hazırlığına, rabitə əlaqələrinin öyrənilməsinə işgüzar ünsiyyət vərdişlərinin qazanılmasına kömək edən psixoloji məsələlərə diqqət artırıla bilər.

Yuxarıda dediklərimizə əsasən bu gün təhsilimiz üçün menecerlərin hazırlanması vacibdir. Buna görə də pedaqoji institutlarda ixtisasından asılı olmayaraq, gələcək pedaqoji kadrlarla təhsil menecerlərinin hazırlığı ilə bağlı mövzuların tədrisi işin keyfiyyətini artırar.

# ОБ ИСПОЛЬЗОВАНИИ ИННОВАЦИОННЫХ ПЕДАГОГИЧЕСКИХ ТЕХНОЛОГИЙ НА ЗАНЯТИЯХ ПО УЗБЕКСКОМУ ЯЗЫКУ

**Саодат Мухамедова,**
***Доктор филологических наук, заведующий кафедрой «Информационные и современные педагогические технологии в языкознании» Ташкентского государственного университета узбекского языка и литературы имени Алишера Навои***

Внедрение инновационных педагогических технологий в обучении привело к появлению новых технологий и форм обучения для обработки и передачи учебной информации. В статье рассматриваются основные проблемы и пути эффективного применения инновационных педагогических технологий на занятиях по узбекскому языку в общеобразовательных школах Узбекистана.

***Açar sözlər:*** *informativ və innovasiyalı texnologiyalar, interaktiv təlim, özbək dili təlimində innovasiyalı metod və üsullar.*
***Ключевые слова:*** *информационные и инновационные технологии, интерактивное обучение, инновационные методы и формы в обучении узбекского языка.*
***Key words:*** *information and innovation technologies, interactive education, innovation methods and forms in teaching Uzbek language.*

Огромное политическое, просветительско-культурное, общественное значение имеет Указ ПФ-4797 Первого Президента Республики Узбекистан Ислама Каримова “Об образовании Ташкентского государственного университета узбекского языка и литературы имени Алишера Навои” от 13 мая 2016 года. В данном университете аккумулирована филолого-научная элита всего Узбекистана. В структуре университета образованы 3 факультета – «Факультет узбекской филологии», «Факультет преподавания узбекского языка и литературы», «Факультет узбекско-английского перевода». В структуре университета созданы кафедры, отвечающие высоким требованиям современной системы образования, такие как «Мировая литература», «Теория литературы и современный литературный процесс», «Английская филология», «Теория перевода», «Узбекское языкознание», «Фольклор и диалектология», «Информационные и современные педагогические технологии в языкознании» и др.

На руководимой мною кафедре «Информационные и современные педагогические технологии в языкознании» ведутся исследования по внедрению информационных и современных педагогических технологий в учебный процесс преподавания узбекского языка и литературы. В частности, выпускники нашего факультета – факультета преподавания узбекского языка и литературы будут преподавать узбекский язык и литературу в академических лицеях, профессиональных колледжах, в общеобразовательных школах нашей Республики. Поэтому им важно знать именно какие информа-

ционные и современные педагогические технологии можно и нужно использовать на занятиях в процессе преподавания узбекского языка и литературы. В данной статье хотим выразить свои соображения о применении инновационных педагогических технологий на занятиях по узбекскому языку в общеобразовательных школах.

Как известно, что инновационные педагогические технологии — это совокупность методов, методик, приемов, позволяющих выйти за пределы традиционных способов обучения, обеспечить выполнение более обобщенных целей, таких как интеллектуальные развитие обучаемых. Это совокупность, специальный набор форм, методов, способов, приемов обучения и воспитательных средств, системно используемых в образовательном процессе. Как указывается в современных литературных изданиях: «К современным педагогическим технологиям относятся: обучение в сотрудничестве, деловые игры, метод проектов, компьютерные технологии обучения и другие ».

В преподавании узбекского языка можно активно использовать обучение в сотрудничестве. Обучение в сотрудничестве (cooperative learning), обучение в малых группах использовалось в педагогике довольно давно. Идея обучения в группах относится к 20-м годам XX столетия. Но разработка технологии совместного обучения в малых группах началась лишь в 1970-е годы. Обучение в сотрудничестве является важным элементом прагматического подхода к образованию в философии Дж.Дьюи. Первые описания этого метода появились в печати в конце 1970-х — начале 1980-х годов в разных странах мира (Великобритания, Канада, Западная Германия, Австралия, Нидерланды, Япония, Израиль и др.). Но основная идеология обучения в сотрудничестве была детально разработана тремя группами американских педагогов из университета Джона Хопкинса (Р. Славин, 1990), университета Миннесота (Роджерс Джонсон и Дэвид Джонсон, 1987) и группой Дж.Аронсона (1978, Калифорния), а также группой Шломо Шаран из Тель-Авивского университета, Израиль (1988). Идеологии обучения в сотрудничестве в Северной Америке, с одной стороны, в Израиле и Европе — с другой, несколько отличаются. Вместе с тем, их объединяют общие прин¬ципы и подходы. В Америке обучение в сотрудничестве в большей мере нацелено на формирование определенных навыков, умений, усвоение понятий, академических знаний, предусмотренных программой. В Израиле и в Европе такое обучение в большей мере ассоциируется с проектной деятельностью на уроках, с организацией дискуссий. Этот подход в большей мере, чем американский, базируется на методе проектов, предложенном Дж.Дьюи. Справедливости ради следует сказать, что оба варианта этого метода, как бы их авторы ни старались найти существенные отличия друг от друга, весьма успешно дополняют друг друга и на самом деле служат прекрасной подготовкой к собственно проектной деятель¬ности учащихся.

На занятиях по узбекскому языку можно использовать следующие виды совместной работы:

1. Обучение в команде. Этот вариант метода обучения в сотрудничестве был разработан в Университете Джона Хопкинса1. Большинство вариантов метода обучения в сотрудничестве, так или иначе используют идеологию этого варианта.

Этот метод уделяет особое внимание «групповым целям» и успеху всей группы, который может быть достигнут только в результате самостоятельной работы каждого члена группы (команды) в постоянном взаимодействии с другими членами этой же группы при работе над темой / проблемой / вопросом, подлежащими изучению. Таким образом, задача каждого ученика состоит не только в том, чтобы сделать что-то вместе, а в том, чтобы познать что-то вместе, чтобы каждый участник команды овладел необходимыми знаниями, сформировал нужные навыки и при этом, чтобы вся команда знала, чего достиг каждый ученик.

Желательно такой метод применят к темам как: «Гап», «Гапда сўзларнинг боғланиши», "Сўз бирикмаси", "Гапларнинг ифода мақсадига кўра турлари", "Гап бўлаклари", "Кесим", "Содда ёйиқ ва содда йиғиқ гаплар", "Ундалмали гаплар", "Сўз туркумлари" и т.д.

2. Другой подход в организации обучения в сотрудничестве был разработан проф. Эллиотом Аронсоном в 1978 году и назван Jigsaw (в дословном переводе с английского — ажурная пила, машинная ножовка). В педагогической практике такой подход именуется сокращенно «пила». Учащиеся организуются в группы по 6 человек для работы над учебным материалом, который разбит на фрагменты (логические или смысловые блоки). Специфика данного метода позволяет применять его по следующим темам: "Дунё тиллари ва ўзбек тили», "Боғланган қўшма гап", "Зидлов боғловчилари ёрдамида боғланган қўшма гап", "Эргашган қўшма гап" и др.

3. Вариант метода обучения в сотрудничестве «Учимся вместе» разработан в университете штата Миннесота в 1987 году (Дэвид Джонсон, Роджер Джонсон). Класс разбивается на разнородные (по уровню обученности) группы в 3-5 человек. Каждая группа получает одно задание, являющееся подзаданием какой-либо большой темы, над которой работает весь класс. В результате совместной работы отдельных групп и всех групп в целом достигается усвоение всего материала. Основные принципы — награды всей команде, индивидуальный подход, равные возможности — работают и здесь.

Группа получает награды в зависимости от достижений каждого ученика. По мнению разработчиков данного метода, учитель должен уделять большое внимание вопросу комплектации групп (с учетом индивидуальных и психологических особенностей каждого члена) и разработке задач для каждой конкретной группы.

Такой метод желательно использовать в старших классах, ибо специфика данного метода позволяет работать над сложными темами. К таким темам относятся такие темы как «Мустақил сўз туркумлари», "Сўзларнинг муносабат шакллари", "Ёрдамчи сўз туркумлари" и др.

4. Исследовательская работа учащихся в группах также является разновидностью метода обучения в сотрудничестве (Шломо Ша-ран, Университет Тель-Авива, 1976). В этом варианте акцент делается на самостоятельную деятельность. Учащиеся работают либо индивидуально, либо в группах до 6 человек. Они выбирают под тему общей темы, которая намечена для изучения всем классом. Затем в малых группах эта под тема разбивается на индивидуальные задания для отдельного ученика. Каждый, таким образом, должен внести свою лепту в общую задачу. Дискуссии, обсуждения в группах дают возможность ознакомиться с работой любого ученика. На основе заданий, выполненных каждым учеником, совместно составляется единый доклад, который и подлежит презентации на уроке перед всем классом.

При организации групповых дискуссий, в процессе работы над проектами, познава-

тельная деятельность по технологии обучения в сотрудничестве становится как бы исходной, элементарной частицей самостоятельной коллективной деятельности учащихся в классе. А достигнутые успехи, с одной стороны, влияют на результат групповой и коллективной работы, а с другой — вбирают в себя итоги работы других членов группы, всего коллектива, так как каждый учащийся пользуется тем, что получено как при самостоятельной групповой работе, так и при коллективной, но уже на следую-щем витке, при обобщении результатов, их обсуждении и принятии общего решения, либо при выполнении следующего нового задания /проекта/ проблемы, когда учащиеся используют знания, полученные и обработанные усилиями всей группы. Желательно такие темы по узбекскому языку поручить ученикам в качестве исследовательской работы учащихся в группах: «Мураккаб қўшма гаплар», “Кўчирма гапли қўшма гап”, “Нутқ услублари”, “Сўзлашув услуби”, “Публицистик услуб”, “Бадиий услуб”, “Расмий услуб” и др.

И еще один метод, который даёт хороший результат в преподавании узбекского языка - это деловые игры (интегрированные уроки). В деловой игре взаимодействуют несколько игроков, принимающих решения в ситуации, моделирующей реальную, а учитель направляет игру, анализирует и оценивает действия игроков. Каждый из участников играет некоторую роль, он принимает решения и может быстро увидеть результат, приобретая, таким образом, свой собственный опыт. Деловые игры при изучении узбекского языка обеспечивают направленную активность психических процессов учеников: стимулируют мышление при использовании проблемных ситуаций, обеспечивают запоминание главного на занятиях, возбуждают интерес к изучаемой дисциплине и вырабатывают потребность к самостоятельному приобретению знаний. Для повышения мотивации учебного процесса использование метода проектов является одним из самых удачных способов при обучении узбекского языка.

Метод проектов — это гибкая модель организации учебного процесса, ориентированная на самореализацию учеников путем развития их интеллектуальных и физических возможностей, творческих способностей в процессе изучения учебного материала. При изучении узбекского языка ученики выполняют различные проекты, такие, например, как создание кроссвордов, мультфильмов, обучающих и развивающих игр и т. д. Таким образом, организации преподавании узбекского языка на основе информационных и инновационных технологий обеспечивает более высокое качество знаний учеников за счет четкого планирования занятий, повышения мотивации при изучении содержания предмета. В процессе обучения узбекского языка ученики формируют умение работать с информацией для выполнения полученного задания, выдвигать свои идеи, анализировать учебный материал.

Компьютерные технологии обучения. В учебном процессе новые информационные и инновационные технологии не отделяют друг от друга, так как широкое внедрение новых инновационных технологий изменит парадигму образования и только современные информационные технологии обеспечивают эффективное использование новых инновационных технологий.

В условиях многоязычия Республике Узбекистан использование инновационных технологий в преподавании узбекского языка обусловлено современными направлениями в обучении, предполагающими коммуникативную направ-

ленность (работа с текстом, анализ актуальных проблем, усвоение правил в процессе выполнения заданий); текстоцентрический подход (многофункциональность текста: текст как эталон для собственного текста; текст как база для организации бесед и дискуссий); функциональный подход (что, как и зачем использовано в тексте); культуроведческий подход (расширение знаний учащихся с помощью текстового материала о взаимосвязи узбекской культуры с культурами других народов); сопоставление (один из важнейших приемов методики обучения в условиях многоязычия). Эффективное использование мультимедийных технологий возможно на этапе объяснения новой темы. Например, при изучении любой темы можно использовать гипертекстовый документ, созданный WORDе. Берется чистый лист, на нем набирается текст предложения, с которого делаются ссылки на другие документы. Если ученик не помнит, например, что такое «части речи», то в ссылке даются сведения об этом. Такая работа хороша тем, что можно самостоятельно при помощи компьютера повторять практически весь материал. На уроке создается благоприятный психологический климат, так как ученик не комплексует из-за незнания темы, а самостоятельно добывает знания при помощи гипертекста. Наблюдения показывают, что после занятий в компьютерном классе ученики начинают серьезнее относиться к орфографии и пунктуации, они убеждаются, что орфографическая или пунктуационная безграмотность создает реальные помехи для коммуникации. Итак, компьютер является хорошим помощником наряду с другими средствами обучения таким разделам узбекского языка, как: словообразование: «научно-исследовательская лаборатория» (анализ структуры слов); «разбери слово» (найти часть слова); «Сборочный цех» (из данных морфем образовать новые слова); «Собери слово» (составить слова по модели); «Судьбы слов» (проанализировать этимологию слов узбекского языка); морфология: «Песня» (найти заданные части речи в песенном произведении); лексикология: «Текстолог» (среди трех вариантов текста с синонимо-антонимической заменой найти авторский) и др.

Обобщая мысли, необходимо подчеркнуть, что внедрение инновационных педагогических технологий в обучении привело к появлению новых технологий и форм обучения для обработки и передачи учебной информации. Технологии следует использовать учитывая специфику возраста, знаний учеников. В данной статье мы постарались показать именно, какие современные педагогические технологии следует применять на уроках узбекского языка в общеобразовательных школах Узбекистана.

***Рецензент: дос. А.Балыев***

**S.Muxamedova**

**Özbək dili dərslərində yeni pedaqoji texnologiyalardan istifadə haqqında**

**Xülasə**

Təlimdə innovasiyalı pedaqoji texnologiyaların tətbiqi informasiyaların ötürülməsi və yaxşılaşdırılması üçün yeni təlimi texnologiya və üsulların meydana gəlməsinə səbəb oldu. Məqalədə Özbəkistan ümumtəhsil məktəblərində özbək dili dərslərində innovasiyalı pedaqoji texnologiyaların tətbiqinin effektli yollarından və əsas problemlərindən bəhs edilir.

**S.Muhamedova**

**On the use of innovative pedagogical technologies in classes in the Uzbek language**

**Summary**

Using pedagogical innovation technologies in education has led to emerge of new technologies and forms in delivering educational information. This article analyses main problems and ways of effectively using pedagogical innovation technologies in Uzbek language lessons at schools.